DOI: 10.36719/2663-4619/61/4-7

**Fərəh Cabbar qızı Cəlil**
Bakı Slavyan Universiteti
Calil.farah72@mail.ru

# KİTABİ-DƏDƏ QORQUD DASTANINDA OĞUZ-QIPCAQ MÜNASİBƏTLƏRİ VƏ QARA DONLU KAFİRLƏR FAKTORU: İMAQOLOGİYA KONTEKSTİNDƏ

***Açar sözlər:*** *imaqologiya, komparativistika, dastan, stereotip, hakimiyyət*

## Oghuz Kipchak relations and black-robed infidels in the book Dede Korkut epos

**Summary**

The article is devoted to imagery, one of the fields of modern comparative studies. The research is based on the epos "Kitabi-Dada Gorgud". The prototype of historical figures is determined in the saga. Against the background of these historical figures and events that took place within the historical time, the issues of "one's own" and others are clarified. The historical roots of the conflicts between the Oghuzs and the event of their expression in the saga are clarified with the images of the enemy, such as "Kipchak Malik", "Shoklu Malik", "Black-robed infidels", "Black Takur".

***Key words:*** *imagery, comparative studies, saga, stereotype, power*

## Giriş

İmaqologiya bu gün müasir komparativistikanın bir sahəsi kimi bu yöndə aparılan tədqiqat obyektlərinin əsasını təşkil edir. İmaqologiya (ingilis dilində hərfi mənada obraz) humanitar elmin bir sahəsi kimi milli təfəkkürdə "özünün", "özgə" etnosların, ölkələrin, mədəniyyətlərin sabit stereotip obrazlarının öyrənilməsi predmetidir. İmaqologiya elm sahələri arasında əlaqələrə dayanaraq (dil, etnoqrafiya, folklor, ədəbiyyat, mədəniyyətşünaslıq, incəsənət və s.) mövcud mənbələri araşdırmaqla ümumi bir paradqma kimi bu və ya digər mədəniyyətdə öz əksini tapmış "başqa", "özgə", "yad" məvhumuna aydınlıq gətirir.

**İmaqologiyanın nəzəri prinsipləri** İncəsənət sahəsində bu tip strereotiplər daha adekvat təzahürdə ortaya çıxır və buna bədii imaloqologiya deyilr (Алексеевна, 2017: s.7). İmaqalogiya kəliməsi ilk olaraq XX əsrin 20-ci illərində sosiologiya ilə bağlı termin olaraq ortaya çıxsa da, filologiya elmi bu elm sahəsini tezliklə mənimsədi. İlk dövrlərdə Fransada daha sonra isə Avropanın müxtəlif ölkələrində o cümlədən Amerikada bu sahə ilə bağlı geniş araşdırmalar aparılmağa başladı. Rusiyada bu sahədə ilk iş 1975-ci ildə A.B.Davidsonun "Uzaq ölkənin obrazı (Afrika haqqında)" əsrində öz əksini tapdı (Бойцов, 2010: s. 5).

Ədəbiyyatla bağlı elm sahələrində bədii imaqologiya ədəbiyyatşünaslıq imaqologiyası (komporativistika sahəsi) kimi dəyərləndirilir, digər xalqların şifahi yaradıcılığında obrazların interpretasiyasının təhlili ilə məşğul olur. Folklor imaqologiyası mətn olaraq şifahi yaradıcılığı və onun müxtəlif janrlarının öyrənilməsi ilə məşğul olur. "Özgə" obrazı (onun milli mentaliteti, xarakteri, dəyərlər sistemi, dünyagörüşü, davranış növü və s.) bu və ya digər etnosun *etnostereotipi* baxımdan qavranılır. İmaqologiya milli qavramında subyektin ziddiyyətliliyi və bənzərliyinə münasibətdə məsələyə mentaliltetin dünyanı dərki kontekstindən yanaşmaqdadır. Bədii imaqologiya müasir tədqiqatlarda geniş humanitar və mədəniyyətşünaslıq kontekstlərində araşdırılır. Metod olaraq belə araşdırmalarda əsasən müqayisəli-tarixi metodlardan istifadə olunur və yuxarıda da qeyd olunduğu kimi "özgəsi", "yad", "başqa" (başqa ölkə, başqa millət və s.) nəzərdə tutulur. "Yad" haqqında təsəvvür imaqologiya anlayışında etnostereotip olaraq qəbul edilir və burada əsasən bir xalqın digər xalqa münasibəti nəzərdə tutulur. Etnik stereotip isə daha çox hər hansı bir etnik qrupun sabit obrazı kimi qavranılır.

Etnostereotiplər milli bilikləri və həmin xalqın nümayəndələrinin emosional dəyərləndirici xüsusiyyətlərini özündə ehtiva edir. (talkoviy slavar) Xalqlarası münasibətlər zəminində formalaşan belə sterotiplər donmuş sxem yaxud da məntiqi qavrayiş deyil, tam əksinə formasına görə emosional obrazlılıq baxımdan canlı bədii obrazlılıqdır və bu obrazlar şəxsi xarakterli daha dəqiq desək fərdi xüsusiyyətli deyil. (Алексеевна, 2017: s.11).

S.Stepanov "fərqli formalarda bütün mədəniyyətlərə nüfuz edən və hər hansı bir kollektiv kütlənin, populyar, milli dünyagörüşünün əsas anlayışlarından biri olaraq qarşıdurma pozisiyasını əsas götürüdü. (Степанов, 1997: s.4). Tarixən hər bir konkret cəmiyyətdə "yad"a, "özgə"yə münasibət həmin cəmiyyətin dünyayagörüşü ilə əlaqəli idi, bu səbəbdən "özümün və özgə" qarşıdurması hər dövrdə fərqli məzmuna sahib olmuşdur. «Özü-özgəsi» konsepti arxetip anlayışında obrazların ilkin sxemi kimi ortaya çıxır (Бойцов, 2010: s.8). Şüursuzluq və apriori fəaliyyətinin formalaşdırdığı istiqamətlər və məktəblər-bütün dünya

mədəniyyətinə nüfuz edən və bəzən daxili antinomiya ilə təchiz olunmuş "(itirilmiş cənnət – tapılmış cənnət)" çoxyönlü bir quruluş kimi təxəyyül fəaliyyətini formalaşdırmaq fərdi əsərlərin elementar obrazlarında və ümumilikdə bütün ədəbiyyata ortaya çıxır (Алексеевна, 2017: s.17). Arxetib xüsussiyyətlərinə malik "özgə" obrazı görünür "başqa" milliyətdən olan real insanlar kimi orjinal mənbələrdən götürülmüş, lakin nəsillərə miras qalan konseptual mücərrədlikdən çıxış etməkdədir (Алексеевна, 2017: s.17).

İmaqologiya mentallıq prizmasından çıxış edərək, bir fərdin yaxud da kollektivin obrazlı düşüncəsini, mənəvi dəyərlərini özündə ehtiva edir.

Milli mentalitet anlayışı millilik anlayışına çox yaxındır. Xaraktercə hər ikisi də tarixən formalaşmış millətin içtimai şüurunu, mədəniyyətini, davranış elementlərini, kollektiv özünüdərki ehtiva edir.

Fərdin yaxud etnik qrupun özündən fərqli digər fərdə və ya etnik qrupa münasibəsi dil vasitəsi ilə ifadə olunur. Bunun üçün həmin etnik qrupa məxsus olan əsas elementlər qabardır. Məsələn, "Kitabi-Dədə Qorqudda Qara donlu kafirlər" ifadəsi bunun ifadəsidir. Bu ifadələr sabit xarakterli olur və birmənalı şəkildə qəbul edilir. Struktural konteksden məsələyə baxsaq bu zaman, kafirlərin dünyası xalqın tarixi-psixoloji əhvalı və onun mentaliteti ilə bağlıdır.

Məhz bir xalqın digər xalqın xarakteri haqqında formalaşan sterotip təsəvvürləri kimi davranış biçimi, mentaliteti haqqında qəliblənmiş fikirlər imaqologiyanın əsas predmetini təşkil edir. İmaqologiya gənc və fəal şəkildə inkişaf edən bir elm sahəsidir. 1980-ci illərdən Almaniyada, Fransada, Hollandiyada bu sahə ilə bağlı geniş tədqiqat mərkəzləri yaradıldı. Çağdaş dövrümüzdə bir millətin digər xalq tərəfindən qəbul edilməsi məsələləri bütün dünyada elmi araşdırmaların predmetinə çevrilmiş və geniş humanitar baxımdan nəzərdən keçirilməkdədir. İmaqologiyanı folkor mətnlərinə tətbiq etməklə yanaşı mif mətnlərinə də şamil etmək mümkündür. Bu fikrə aydınlıq gətirmək üçün bəzi folklor nümünələrinə nəzər salmaq vacib şərtlərdəndir.

**Hakimiyyət və obraz:**Yuxarıda da qeyd etdiyimiz kimi müasir komporotivistikada bədii imaqologiya və ədəbiyyatşünaslıq imaqologiyası terminləri mövcuddur. Bədii imaqologiya dedikdə milli etnostereotip düşüncənin ədəbiyyatın obrazlı dili ilə ifadəsi nəzərdə tutulur. Ədəbiyyatşünaslıq imaqologiyası terminінə isə bu obrazların interpretasiyası və obrazların təhlili daxildir. İmaqologiyada yalnız "Özgə" obrazları deyil, "Özgə" hakimiyyətlər da tədqiqat obyektinə çevirir. Təbii ki, "Özgə" obrazı eyni zamanda "Özgə" hakimiyyətlə də bağlıdır. Bu məkan dövlətçilik və dövlətçiliyə qədərki dövrlə bağlı ola bilər. Esasən dövlət quruculuğuna qədər olan xalqlar arası münasibət "yanımda" yaxud "ayrılıqda" "potestar" termini ilə ifadə olunur. (Бойцов, 2010: s. 7). Boysova görə isə potestar ifadəsi həm dövlət qruculuğuna qədərki dövrlərdə, həm də ondan sonrakı dövrlərdə hakimiyyətlər arası və eyni zamanda xalqlar arası "yanaşı" və "başqa" ifadəsi kimi istifadə oluna bilərdi.

Dastan yaradıcılığı hər bir millərin əsasən dövlət quruculu dönəmində ortaya çıxdığı üçün burada bir çox tarixi şəxsiyyətlərin prototipi kimi meydana çıxan obrazlarla qarşılaşmaq mümkündür. Xoyslerin "Alman eposu və Nibelunqlar nəğməsi" adlı əsərində müəllif məhz tarixi şəxsiyyətlərin dastandakı prototiplərinə aydınlıq gətitir. Bu əsərdə Ditrix obrazının tarixi şəxsiyyət Teodrixin, Etselin Atillanın prototipi kimi ortaya çıxmasının şahidi oluruq və s. Bu qanunauyğunluq demək olar bütün xalqların dastan yaradıcılığında müşahidə etmək mümkündür.

"Kitabi-Dədə Qorqud" dastanında da belə tarixi prototiplərlə qarşılaşırıq və bu obrazlar "Özünün" və "özgəsi" qarşıdurmasında ortaya çıxır. "Özünün" anlayışı dastanda oğuzlarla bağlı keçsə də "özgəsi" anlayışı "qara donlu kafirlər", "Qıpçaq Məlik", "Şöklü Məlik" obrazları ilə bağlıdır. Bu obrazların dastan a düşməsi bir təsadüf idimi yoxsa bu adlar arxasında tarixi gerçəklikmi yatırdı? Buna aydınlıq gətirmək üçün XI-XIII əsr Azərbaycan ərazisində və çevrəsində mövcud olan siyasi hadisələrə nəzər salaq.

Tarixdən məlum olduğu kimi, XII əsrdə Səlcukların tənəzzülə uğraması I Məlikşahın hakimiyyətə gəlməsinə səbəb olur. Ərazilərini genişləndirmək və dövlətini möhkənləndirmək səbəbi ilə Məlikşah 3 dəfə Gürcüstana səfər edərək Gürcü kralına Böyük Səlcuq Dövlətinin hakimiyyətini qəbul etdirdi (Вартанов, 2016: http://vzglyad.az/news/74450/news.html).

Burdan Səlcuq türklərinin başçısı Məlikşahın dastanda adı keçən Gürcüstan və gürcü təkürü Qara Təkürlə əlaqəsi bu və ya digər şəkildə öz əksini tapmışdır. Həmin dövr Türk-Gürcü əlaqələri ilə daha bir maraqlı məlumat Rusiyanın 2016-cı ildə nəşr olunmuş "Müasir elm: nəzəriyyə və təcrübənin aktual problemləri" jurnalının "Humanitar elmlər" seriyasında Eduard Vartanovun "Erməni-qıpçaqların Eçmiəddinxanı tərcihi və onların məcburi deitnizsiyası" məqaləsi yayınlanır. Uzun illər ermənilərlə bağlı tədqiqt aparan müəllif Polşa, Ukrayna, krım və Don ermənilərinin etnik mənsubiyyətinin hay deyil türk etnosuna malik olduğunu sübut etməyə çalışır.

Onun fikrincə bu subetnosa daxil olan toplumun doğma dili erməni "hay" deyil məhz qıpçaq qrupuna daxil olan türk dillərindəndir.

Müəllif eyni zamanda qeyd edir ki, XII-XIII əsrlərdə Cənubi Qafqazda monofizmi qəbul edən qıpçaqlar yaşayırdı. Belə ki, hazırkı Ermənistanın Şirak eyalətində bu günə qədər qorunub saxlanılmış Xrpçaxavank adlı məbədin hərfi mənada adı "Qıpçaq mədədi" dir. Vartanov məntiqi şəkildə əsaslandıraraq sübut edir ki, "qriqoryan" məhzəbindən olan ermənilər ani qıpçaqlarından törəmişlər və Qızıl Orda dönəmində şimala doğru yayılmışlar.

Eyni zamanda müəllif qeyd edir ki, türk-qıpçaqları Qafqazın cənubuna gürcü çarı David Aqmaşenebeli yerləşdirmişdir. Bu hadisə Oğuz türklərinin (səlcukların) Gürcüstanı fəthindən sonra baş vermiş və Gürcü şəhəri Tiflisə elecə də Ani şəhərinə qıpçaqların yerləşdirilməsi bu şəhərin gürcü-türk şəhərinə çevrilməsinə səbəb olmuşdur. Həmin dövrdə Tanrıçılıq dini baxışlarına sahib olan qıpçaqlar bu əraziyə yerləşdikdən sonra xristianlıq dininin provoslavla yanaşı monofizit təriqətinə də sitayiş etməyə başlamışlar. Cənubi Qafqaz ərazisinə yerləşdirilən qıpçaqlar müsəlman oğuz türkləri ilə qarşılaşırlar. Bu həmin dövr idi ki, həlı erməniləşmə prosesinə başlanılmamışdı.

Beləliklə qıpçaqların bir hissəsi xristianlığı qəbul etdikdən sonra gürcüləşir, digər qismi isə müsəlmanlığı qəbul edərək müasir azərbaycanlı- Borçalı əlalisinə çevrilir Nəhayət monofeist məhzəbli xristianlığı qəbul edən qıpçaqların bir qismi Cənubi Qafqaza yerləşmədən öncə hazırkı Ermənistanda pozisiya qazanmış oldular (Вартанов, 2016: http://vzglyad.az/news/74450/news.html).

Əsərdə bəhsi keçən oğuzlarla bağlı isə qeyd etməliyik ki, Səlcuk imperiyasının çöküçündən sonra Azərbaycanın güneyində qurulan hülakülər (1256-cı ildə Çingiz xanın nəvəsi Hülakü xan (1256-1265) özünün Hülakülər dövlətini (1258-1357) (https://az.wikipedia.org/wiki/Elxanil). Qurdu. Elxanilər dövləti (Hülakülər) yenidən gücləndi. Qazan xan özü islam dinini qəbul edərək Mahmud adını götürdü. Bu addım nəticəsində o yerli feodal və müsəlman ruhaniləri ilə münasibətləri möhkəmlədə bilmiş, onların dəstəyini qazanmışdır (https://az.wikipedia.org/wiki/Elxanil)

Bu tarixi faktlara nəzər saldığımız da bir daha aydın olur ki, dstanda öz əksini tapmış Qazan xan obrazı Hülakü xani tarixi şəxsiyyət Qazan xanın prototipidir. Bu səbəbdən də Qazan xan və bütünlükdə oğuz eli "özünün" "Qara donlu kafirlər", Qıpçaq Məlik, Şöklü məlik, Qara Təkür isə "özgəsi" obrazı olaraq ortaya çıxır. Onlar arasında baş verən qarşıdurmalar bu səbəbdəndir. Daha dəqiq desək Şöklü Məliyin, Qıpçaq Məliyin qara donlu kafirlə yanaşı "özgəsi" tituluna sahib olması məhz həmin dövrdə qıçaq-gürcü, qıpçaq-erməni paralelindən ortaya çıxmaqdadır.

Öncə qeyd etməliyik ki, Oğuz türklərinin semiotik etnostereotip işarələr sistemində *"özününkü" və "özgəsi"* anlayışını təyin edən və "yadı" doğmadan ayıran söz vahidi kimi "yağı" ifadəsindən istifadə olunurdu. Yağı sözü isə "Kitabi -Dədə Qorqud dastanı"nda belə izah olunurdu: "Qazan bəğ oğlı Uruz bəgin tutsak oldığı boyı boyı bəyan edər, xanıç hey!" "Oğlan aydır: "Yağı" deyü, nəyə deyirlər?". Qazan aydır: "Oğul anuncun yağı deyirlər ki, biz anlara yetsəvüz, öldürəriz. Anlar bizə yetsə öldürər", -dedi" (Kitabi-Dədə Qorqud, 1988: s.70) Yağı obrazının sinonimi kimi isə dastanda Şöklü Məlik: Mərə kafər, Qara donlu kafirlər, kafər, təkur ifadələri işlədilməkdədir.

**Nəticə** Apardığımız təhlillərdən belə nəticəyə gəlirik ki, folklor yaradıcılığında öz əksini tapmış imaqologiya anlayışı yalnız tarixi hadisələrin etnostereotik obrazlar şəklində folklor mətnlərdə ortaya çıxır "Kitabi - Dədə Qorqud" da Qara donlu kafirlər, Qıpçaq Məlik, Qara Təkür və s. Kafir qızı, kimi obrazlar tarixi şəxsiyyətlərin "özgə" prototipi kimi ortaya çıxır.

## Ədəbiyyat

1. Kitabi-Dədə Qorqud. Bakı, Yazıçı, 1988, 265 s.
2. Алексеевна С.А. Компаративистический анализ русской и немецкоязычной культур в Росии XVIII-XIX веков. Выпускная квалификационная работа по направлению: философия основная образовательная программа: бакалавриат Санкт-Петербург. 2017 109 s.
3. Бойцов М. Что такое потестарная имагология?// Власть и образ. Очерки потестарной имагологии. Санкт-Петербург, Алетея, 2010. С. 5- 38.
4. Большакова А.Ю. Архетип в теоретической мысли XX в. //Теоретико-литературные итоги XX в. Т.2. М.: Наука,2003. С.288.
5. Большакова А.Ю. Архетип - концепт - культура// Вопросы философии. М., 2010. №7. С.47-57.
6. Виноградова Л.Н Народная демонология и мифо-ритуальная традиция славян. М., 2000. Виноградова Л. Н
7. Новый энциклопедический словарь. М.: Большая Российская энциклопедия; Рипол Классик, 2001. С.713.

8. Толковый словарь обществоведческих терминов. Н.Е.Яценко. С.-П.; Лань, 1999. С.148.)
9. Егорова Л.П. Литературоведческие аспекты имагологии (инновации и традиция)// Изв. Южного федер. унив-та. Филол. науки. №1-2.2007. С.31.
10. Ощепков А.Р. Имагология //Знание. Понимание. Умение. 2010. №1. С.251.
11. Поляков О.Ю. Принципы культурной имагологии Даниеля –Анри –Пажо//Филология и культура. Phılology and culture. 2013. №2 (32)
12. Песнь о Нибелунгах. Серия литературных памятников. Санкт Петербург, Наука, 2004, 339, с.
13. В.Б.Земсков. М.: Новый хронограф, 2011. С.3.
14. Земсков В.Б. Теоретические аспекты: о рецепции и репрезентации «другой» культуры // На переломе: Образ России прошлой и современной в культуре, литературе Европы и Америки (конец XX - начало XXI в.). Отв. ред. Садохин А.П., Грушевицкая Т.Г. Этнология. М.: Изд. центр «Академия»; Высшая школа, 2000. С.149.
15. Степанов Ю.С. Константы. Словарь русской культуры. М.: Языки русской культуры, 1997. С.472.
16. К.-Г. Юнг. Об архетипах коллективного бессознательного // Архетип и символ. IV1.: Ренессанс, 1991. С.97-99.
17. Хализев В.Е. Сознание и самосознание персонажа. Психологизм//Теория литературы. М.: Высшая школа, 2002. С.215.
18. Хойслер. А. Германский героический эпос и сказание о Нибелунгах.

**İnternet qaynaqları**

19. Как тюрки-кыпчаки из грузинского города Ани стали «армянами» http://vzglyad.az/news/ 74450/ news.html
20. https://www.chukfamily.ru/gabbe/sborniki-sostavlennye-tamaroj-gabbe/byl-i-nebyl/skazka-bylina-pro-ilyu-muromca
21. https://az.wikibooks.org/wiki/H%C3%BClak%C3%BC_d%C3%B6vl%C9%99ti/H%C3%BClak%C3%BCl%C9%99r_d%C3%B6vl%C9%99tinin_yaranmas%C4%B1,_y%C3%BCr%C3%BC%C5%9Fl%C9%99ri.
22. https://az.wikipedia.org/wiki/Elxanil%C9%99r_d%C3%B6vl%C9%99ti.

**Rəyçi: dos. F.Musayeva**

Göndərilib: 23.12.2020 Qəbul edilib: 24.12.2020

DOI: 10.36719/2663-4619/61/8-11

**Lalə Məzahir qızı Bayramova**
AMEA akad. Z.M.Bünyadov adına Şərqşünaslıq İnstitutu
bayramova78@hotmail.com

# "ƏYYƏMU-L-ARAB" TOPLUSUNUN YARANDIĞI DÖVR VƏ MƏDƏNİ-TARİXİ MÜHİT

***Açar söz:*** *toplu, cahiliyyə dövrü, insanlar, janr, ədəbiyyat, oxuma, görünüşlər, cəmiyyət*

## The period estabilichment and cultural history environment of the collection "Ayyamu-L-Arab"

**Summary**

The Ayyam al-arab one of the early Arabian epic genres, describing the wars amoung and within the tribes and the adventures of the heroes. The Ayyam al-Arab were composed by the Bedouin of Arabia during the fifth through seventh centuries. Individual chronicles are tales in prose, interspersed with verses attributed to the heroes. These individual chronicles began to be assembled into cycles at an early date. This article is devoted "Ayyam al-arab" of the period of its estabilichment. Specially is investiqated the cultural history environment and determined his plase in word literature.

***Key words:*** *collection, jahiliyya period, people, genre, literature, sings, appearance, society*

## Giriş

Cahiliyyə dövründən bizə böyük ədəbi irs miras qalmışdır. Poeziya və nəsrin vətəni Ərəbistan yarımadasının səhralıqları olmuş, ilk ərəb şairləri isə bədəvilər **(بدوى) -** yəni, səhrada yaşayanlar olmuşdular.

Cahiliyyə dövrü ərəb ədəbiyyatının müəyyən hissəsi dövrümüzədək gəlib çatmışdır. Bu dövr ədəbiyyatının nümunələri ancaq VIII-X əsrlərdə yazıya köçürülmüşdür. Bizə qədər gəlib çatan poeziya, şifahi xalq ədəbiyyatı nümunələrindən belə məlum olur ki, Cahiliyyə dövrü ərəb ədəbiyyatının tarixi hicrətdən iki əsr öncəyə gedib çıxır.

Dahi ərəb mütəfəkkiri Əl-Cahiz ərəb poeziyasının qədimiliyi haqqında demişdir: "Şeirə gəlincə, onun tarixi qədim deyil... belə ki, bu dövr şeir tarixini islamdan 150, 200 il öncəyə qədərki dövr kimi müəyyən etmək olar" (Cahiz, 1898: 19).

İslamaqədərki ərəb poeziyasının əsas janrı qəsidə olmuşdur. Bu dövrün mühüm ədəbi abidəsi yeddi şairin-İmru-l-Qeysin (doğ.520-öl.565), Tərəfə ibn əl-Əbdin (doğ.543-öl.569), Zuheyr ibn Əbu Sulmənin (doğ.530-öl.627), Əntərə ibn Şəddad əl-Əbsinin (doğ.525-öl.615), Ləbid ibn Rəbiənin (doğ.560-öl.661), Əmr ibn Gülsümün (doğ.554-öl.608), Haris ibn Hillizənin (doğ?, öl.580) qəsidələrindən ibarət müəlləqələrdır.

Müəlləqələrin sayının on olduğu da söylənilir: Nabiğə əz-Zubyani (doğ.515-520-öl.604), Əl-Əşə ibn Meymun (doğ.565-öl. ?), Ubeyd bin əl-Abras (doğ.?- öl.554).

Ən-Nabiğə-əz-Zubyaninin "Meyyin obası" adlanan müəlləqəsi Cahiliyyə şeirinin ən kamil nümunələrindəndir. Cahiliyyə şeirinin ən məşhur qadın şairi Xənsa (doğ.575-öl.645) idi. O, həm Cahiliyyə, həm də İslam dövründə yaşadığından əl-muxadram (iki dövrdə yaşayan şair) şairi adı almışdır. Umeyyə bin Əbi Salt (doğ. ?-öl.626) da muxadram şairi hesab olunurdu. Şənfəra (doğ. 525-öl.?), Əvs əl-Hadıra (doğ.?-öl.626), Zəbban (doğ.?-öl.626) Cahiliyyə dövrünün Təabat Şərran (şəri qoltuğunun altında daşıyan) şairləri idi. Bu şairlər səalik (dilənçi, yolkəsən) şairlər də adlanırlar. Səalik şair Şənfərə (doğ. 525-öl.?) məşhur "Lamiyyə" qəsidəsinin müəllifidir.

Cahiliyyə dövrü Ərəbistan yarımadasında hər bir qəbilə öz şairinin ilk şair olduğu iddiasını irəli sürürdülər. Məsələn, İmru-l-Qeysin Yəməniyyədə, Ubeyd bin əl-Əbrasın bəni Əsəddə, Muhəlhil bin Rəbiənin Təğlibdə ilk şairləri olduğunu iddia edirdilər. Heç bir tədqiqatçı Cahiliyyə dövrü şairlərini özünün qələmə aldığı qədim şeir nümunələrinə rast gəlməyib. Belə ki, əlimizdə olan nümunələr ağızdan-ağıza keçərək gəlib çatıb. Düzdür içərisində sonradan əlavələr olunmuş nümunələr də istisna deyildir.

Ərəb ədəbiyyatı tarixinin Cahiliyyə dövrü haqqında görkəmli rus şərqşünas alimi İ.M.Filştinski yazır: "Dünyanın ən zəngin və ən qədim söz sənət nümunəsi olan ərəb ədəbiyyatında şifahi nümunələrinin, təxminən, iki min il yaşı vardır. Ərəb dilində yazılı ədəbiyyatın ilk kamil nümunələri isə bizim eranın V-VI yüzilliklərində yaranmışdır. Artıq bu yüzilliklərdə ərəb poeziyası məzmun və forma cəhətdən təşəkkül tapmış, onun vəznləri, qafiyə sistemi, bədii ifadə vasitələri, mövzu çalarları formalaşmışdır. İslamdan əvvəl yaranmış bu sənət əsərlərinə, "Cahiliyyə dövrü ədəbiyyatı" deyirlər " (Фильштинский И.М, 1992: 8).

Cahiliyyə dövründə poeziya nümunələri daha çox vüsət almasına baxmayaraq, nəsr nümunələri də şifahi şəkildə mövcud olmuşdur. Lükman Ad, Əksəm İbn-Seyfiyin, Quss İbn Səidə, Əmr ibn Gülsüm ət-Təğlibinin

yaradıcılığında nəsrin ilk nümunələri yaranmışdır. Nəsrdə "Səc" üslubu yaranmağa başlayır. Hikmətli kəlamları və xütbələri ilə tanınan Quss ibn Səidə, Əkşam əs-Seyfinin, Əmr ibn Gülsüm ət-Təğlibi Cahiliyyə dövrü nəsrinin banilərididir.

Atalar sözləri və məsəllər, tapmacalar (müəmmə), nağıllar, bayatılar, lətifələr, dastanlar ərəb şifahi xalq ədəbiyyatının məşhur janrları idi. "Ərəblərin günləri" folklor nümunələrinə əsrlər boyu mənbə rolu oynamış cahiliyyə ədəbiyyatının ən dəyərli toplusudur. "Əntərə", "Əli Zibək", "Seyf ibn Zi-Yəzən" kimi ərəb xalq dastanları, məşhur "Min bir gecə" nağılları, "Bəhlul Danəndə" və "Cuha" lətifələri kimi ərəb şifahi xalq ədəbiyyatı nümunələrinin mənşəyi məhz Cahiliyyə dövrünə gedib çıxır.

Dünya mədəniyyətinin ayrılmaz tərkib hissəsi olan ərəb ədəbiyyatının kökləri ən qədim zamanlara gedib çıxır. Günümüzə qədər gəlib çıxan əfsanələrdən biri bu fikri təsdiqləməkdədir: "Yer üzündə insanın əcdadı olan Adəm oğlu Habilin ölüsü üzərində ilk şeirini demişdir" (Аравийская старина, 1983: 3). Bu əfsanə reallıqdan uzaq olsa da, ərəb ədəbiyyatının köklərinin qədimiliyinə işarədir.

Bütün bunlarla yanaşı, Cahilliyyə insanlarının şifahi şəkildə öydükləri qəbilələrarası mübarizələrin təsvir olunduğu yeni-yeni **"Əyyəmul-arab"- " أيام العرب ("Ərəblərin günləri")** kimi dəyərli abidəsi meydana gəlmişdir.

Şərqin qədim adət və ənənələri, tarixi, insanlarının yaşayış səviyyəsi, düşüncə tərzinin ensiklopedik məlumatını günümüzə daşıyan "Ərəblərin günləri" toplusu Cahiliyyə əhalisinin sayı və artımı nəticəsində yeni yaranan nəsil, daha sonra bir neçə nəslin böyüyüb tayfa halına gələrək, qəbilə şəklində yaşayan insanların münaqişə və mübarizə ilə keçən ömürlərini ən yaxşı şəkildə bizlərə tərənnüm etməkdədir. O, ərəb xalqının mədəni-mənəvi şüur tarixinin öyrənilməsi, eyni zamanda islam dininin sosial-tarixi mənşəyinin araşdırılması baxımından maraqlı mərhələ kimi dəyərləndirilən Cahiliyyə dövrünün daha dərindən öyrənilməsi üçün misilsiz mənbədir.

**"Əyyəmul-arab" ("Ərəblərin günləri")** toplusunun yarandığı dövrün sosial-mədəni mühitinə gəldikdə isə bildiyimiz kimi, Cahiliyyə dövründə ərəblər qəbilə halında yaşayırdılar və hər bir qəbilənin də öz qolları vardır. Ərəbistanda və Hicazda müstəqil hökümət yox idi. Qəbilələr şeyxlər və ya rəislər tərəfindən idarə edilirdi. Qəbilənin böyüyü qəbilənin nüfuzlu ailələri arasından seçilirdi (Islamoğlu İ, 2002: 24).

Qəbiləyə təyin edilmiş başçı hakimiyyətdə olmasına baxmayaraq, tabeliyində olan insanlara təzyiq göstərməzdilər.

Qəbilə başçısı özünə alicənablığı ilə hörmət qazanardı, hamı ona öz istəyi ilə tabe olardı. Qəbilə rəisi də bağlılığı pozmamaq üçün onlarla çalışdığı qədər ədalətli davranardı, döyüşlər zamanı ordu komandiri, sülh vaxtı hakim rolunu oynamağa qadir biri idi .

Tez-tez qəbilədaxili və qəbiləxarici davalar düşərdi. Bu davalara rəislər və qazilər nəzarət edərdi. Davaların həll edilməsində bir sıra sübut etmə qaydaları qəbul edilmişdir:

1. Geyim (nəsəb və izini tapmaq),
2. Fərasət (danışanın səs və hərəkətlərindən sözünün doğru olub-olmadığını təyin etmək),
3. Qasamə (əlli adamın hansısa bir cinayət hadisəsində qatili tanımadıqlarına və ya qatili öldürmədiklərinə görə and içməkləri),
4. Şahidlik (insanların şahidlik etməsi)
5. Kəhanət (Quşların uçuşu, qeybdən xəbər almaq, kəhanətin köməyi ilə davaları həll etməyə çalışmaq) (Fahrettin A, 1991: 198).

Davalar həll olunduqdan sonra hökm verilərkən həmin adamın mövqeyi nəzərə alınmırdı. İstisnalar da xali deyildi, cəzaların verilməsinə maneələr də olurdu. Qan davası ərəblərin əsas adət və ənənələrindən idi. Oğru insanların əli kəsilər, edam edilərdi.

Buna görə də Məhəmməd peyğəmbər (s.a.s) buyurmuşdur: "Sizdən əvvəlki qövmlərin həlak olmalarının səbəbi budur: Onların aralarında məqam və mövqe sahiblərindən biri oğurluq edəndə onlara lazımı cəza verilməz, azadlığa buraxılardı. Məqam və mövqe sahiblərindən olmayan biri oğurluq edəndə onlara lazımı cəza verilirdi" .

İslam dini meydana gəlməmişdən əvvəl qəbilələr mənsub olduqları bölgədə öz dinlərini, hakimiyyətlərini bərqərar etmələrinə görə yəhudi və xristianlar arasındakı müharibələr, bütpərəstlər arasındakı döyüşlər davamlı şəkildə həyata keçirilirdi. Qəbilə mənsub olduğu dindən asılı olaraq, özünü güclü saydığından zəif hesab etdikləri qəbilələrə aramsız hücumlar edirdilər.

Məkkədəki qəbilələr arasında meydana gələn Ficar müharibələri və Mədinədəki Əvs və Həzrəc qəbilələri arasındakı Buas döyüşü və buna oxşar müharibələr qan güdmə və günahı olan insanın bütün qəbilə tərəfindən qorunması adətinə görə yaranmışdır. Müharibə baş verməmişdən əvvəl tərəflər razılığa gəlməyəndə, bütün qəbilə fərdlərinin əllərini qan dolusu bir qabın içərisinə soxub and içməyə və qanlarını yalamağa əhd etdikləri görünməkdədir (Təbəri, 11: 289-290).

Fütuhatdan sonrakı dövrlərdə ərəbləşmiş müasir ərəb ölkələri xalqlarından fərqli olaraq həmin ərəblər o zaman yalnız Ərəbistan yarımadası ərazisində yaşayırdılar. Tədqiqatçıların hesablamalarına görə VI-VII əsrlərdə həmin ərazilərdə təqribən 4 milyon oturaq, üç milyon köçəri ərəb həyat sürürdü.

Cahiliyyə dövründə onlar iki böyük etnik qrupa - erkən orta əsrlərdə himyərilər adlandırılan cənublulara və yarımadanın qalan hissələrində yaşayan, qonşu xalqların təqribən b.e.ə.VII əsrdən ərəb adlandırdıqları köçərilərə ayrılırdılar. Müsəlman rəvayətinə görə yarımadanın şimalında yaşayanların soy kökü İbrahimin oğlu İsmayıl vasitəsilə Ədnandan, cənubda yaşayanların soy kökü isə Qəhtandan başlayırdı. Bu bölgüyə uyğun olaraq, ərəblər nizarilər və məadilər adlanan şimal qəbilələrinə və yəmənlilər adlanan cənub qəbilələrinə ayrıldılar. Şimal ərəbləri bir çox tayfa və qəbilələrə bölünmüş rəbia və mudar, cənub ərəbləri isə himyər və qəhlan qollarına parçalanırdılar. Hər iki etnik qrup sami-hami dilləri ailəsinə daxil olan eyni köklü dillərdə danışsalar da, bir-birlərini çətinliklə başa düşür, buna görə də özlərini müxtəlif xalq sayırdılar (Vəlixanlı N, 1993: 6-7).

Cahiliyyə dövründə Ərəbistanda qəbilələrin orduları hazırlıqlı deyildilər. Ordularında xidmət göstərən əsgər sayları üç mindən çox deyildi. Orduda döyüş sursatları-ox, mizraq, qılınc, at, qalxan, zirehdən istifadə olunurdu.

Cahiliyə dövründə cəmiyyətdə üç sinif vardır:

1. Azad yaşayanlar-cəmiyyətin əsas vətəndaşları sayılardı. Bu tip insanlara kahinlər, şairlər və döyüşdə məşhur olan insanların xüsusi yeri var idi.

2. Əsirlər-kölə və cariyələrdən ibarət olurdu. Onlar bazarlarda rahat şəkildə alıb-satılırdılar. Cariyə və kölələrdən doğulan uşaqlar da əsir olaraq qəbul edilirdi və qəbilədə qəbul edilməzdilər. Cariyələrdən çox vaxt döyüşlərdə də istifadə olunurdu. Bir sözlə, kölə və cariyə qadınların cəmiyyətdə yeri olduqca aşağı səviyyədə idi.

3. Məvalilər isə azad edilmiş kölələrə verilən statusdur. Azadlığa nail olan cariyə sahibinin ailəsinə mənsub olur. Kölələr də həmçinin sahibinin əmrlərinə tabe olurdu (Şəmsəddin M, 1926: 84-85).

Cahiliyyə dövründə qadınla kişi arasında çox fərq qoyulurdu. Qızı, atası kimlə istəsə ailə qurmasına razılıq verərdi. Qız övladının dünyaya gəlməsindən atalar utanardı. Miras haqları belə olmazdı. Ən çox qadınların haqları o zaman pozulurdu ki, dünyaya gətirdikləri qız uşaqlarını diri-diri basdıraraq, onlara amansız zülm edirdilər.

Cahiliyyə dövründə kişinin qadından üstün varlıq hesab olunmasına baxmayaraq, qadınlar da döyüşə göndərilirdi. Cahiliyyə dövründə meydana gələn döyüşlərin davamı olan Uhud döyüşündə də qadınların döyüşə cəlb edildiyini görürük (Əbdü-l-Hakim əş-Şauqi, 1980: 312-313).

Cahiliyyə ərəbləri kişiləri qadınlardan üstün olduğunu hesab etdikləri üçün onları künyəsi ilə çağırardılar. İslamiyyətdən əvvəl Ərəbistan yarımadası qaranlıq bir cəhalət dövrü yaşamış, dünyanın hər bir yerində mənəvi dinclik və sakitlik yox idi. Ərəblər haqq dinini unudub, müxtəlif adlarla andıqları bütlərə itaət etməyə başlamışdılar. Qaranlıq bir cəhalətin hökm sürdüyü Ərəbistan yarımadasında haqq hər zaman gücə məhkum idi, insan haqlarına riayət olunmurdu, kölələr və əsirlər acınacaqlı bir vəziyyətdə idi.

Dəyərli tarixi mənbələrdən birində oxuyuruq: "İslamaqədərki bədəvi ərəb tayfaları ibtidai-icma quruluşu şəraitində yaşayır, öz başçıları olan şeyx və ağsaqqallar şurası tərəfindən idarə olunurdular. Qan qohumluğu ilə bağlı olan adamları özündə birləşdirən bu ayrı-ayrı tayfa və qəbilələr arasındakı münasibətlər ortadakı ziddiyyət və hərc-mərcliyə baxmayaraq, xeyirxahlıq, insanpərvərlik, namus, qeyrət, qəbilə ənənələrinə sədaqət prinsiplərini qoruyan və nəsildən-nəslə ötürən yazılmamış qayda-qanunlara tənzim edilirdi. Ərəblərin ləyaqət və məziyyətləri bircə kəlmə muruvva "mürüvvət" sözü ilə ifadə olunurdu; əsl bədəvi öz ailəsinə və qəbiləsinə sadiq qalmalı, qan intiqamını yerdə qoymamalı, qonaqpərvərlik qaydalarını unutmamalı, basılmış düşmənə qarşı alicənab olmalı idi" (Vəlixanlı: 6).

## Nəticə

Bir sözlə, **"Əyyəmul-arab"- " أيام العرب"** **("Ərəblərin günləri")** toplusunun mənşəyi ərəb ədəbiyyatının ilk dövrü hesab edilən Cahiliyyə dövrünə gedib çıxır. Təsadüfü deyidir ki, toplunun birinci hissəsi məhz **"Əyyəmul-arab fi-l-Cahiliyyə"- "أيام العرب في الجاهلية"** **("Cahiliyyə dövründə" "Ərəblərin günləri")** adlanmaqdadır. İslamaqədərki ərəb ədəbiyyatı nümunələrinin, o cümlədən **"Əyyəmul-arab" ("Ərəblərin günlə-ri")** əsərinin öyrənilməsində Cahiliyyə dövrü mühüm mənbə hesab olunur.

## Ədəbiyyat

1. Kazımoğlu S. Cahizin ədəbi görüşləri. Bakı: Elm, 2005, 204 s.
1. الجاهظ عمر بن البحر, البيان و التبيين, القاهرة
2. Фильштинский И.М.История арабской литературы X-XVIII в: М: Наука, 1991,726 с.

3. Аравийская старина. Москва: Наука, 1983.-142 с.
4. İslamoğlu İbrahim.Eyyamu-l-arabın edebi yönü ve arap dili ve edebiyatına etki ve katkısı. Erzurum, 2002, 80 s.
5. *Fahrettin Atar* , İslam Adliye Teşkilatı, Ankara 1991, 298 s.
6. Vəlixanlı N.M. Ərəb xilafəti və Azərbaycan. Bakı, Azərnəşr, 1993, 157 s.
7. الطبري أبو جعفر محمد بن جرير. ،تاريخ الرسل و الملوك، بيروت ،1967، 286ص
8. Şemseddin M. Kablel islam Araplarda ictimai Aile, D.F.I.F.D., I-IV/74-105, Istanbul, 1926).
9. عبد الحكيم الشوقي. الحكايات الشعبية العربية. بيروت: مطابع الكشاف، 1980

**Rəyçi: akademik G.Baxşəliyeva**

Göndərilib: 18.12.2020 Qəbul edilib: 20.12.2020

DOI: 10.36719/2663-4619/61/12-17

**Махбуб Гашим оглу Казымов**
Нахчыванское отделение НАН Азербайджана
mahbubkazimov@yahoo.com
**Горхмаз Манур оглу Гусейнов**
Нахчыванское отделение НАН Азербайджана

# ГЕНИЙ ПО МЕХАНИКЕ И «ОТЕЦ РОБОТОТЕХНИКИ» АЛЬ-ДЖАЗАРИ

***Ключевые слова:*** *коленчатый вал, водоподъемные механизмы, автоматы, роботы*

## The genius mechanic and the father of robotics Al-Ghazar

**Summary**

In the article, the great Turkish scientist, engineer, genius mechanical engineer and "robot technician" Al-Ghazi forgotten unfairly contributed to world science. It has been shown that his scientific works and inventions have a great impact on Europe. It is emphasized that scientific achievements and ideas played an important role in the formation of the revival of European science.

Al-Ghazari's unique, historic achievements and numerous great discoveries have been made available to the world. This genius Turkish scientist's "forgotten" inventions in Europe were reviewed.
***Key words:*** *crankshaft, water-lifting mechanisms, automatic machines, robots*



Аль Джазари

Эпоха Средневековья, которая на Западе незаслуженно воспринимается как период варварства, якобы остановивший развитие европейской цивилизации, для мусульманского мира стала золотым веком изобретений и открытий. Простиравшая, от Испании до Афганистана и от Ближнего и Среднего Востока до Северной Африки, исламская империя стала обладательницей огромного арсенала знаний.

В VIII-XIII в. н.э. исламская наука переживала свой золотой век и изобретение ученых Востока, эпохи ренессанса мусульманского мира стал основой современной цивилизации. Исламская наука был целенаправленным результатом многочисленных научных изысканий полученных профессиональными учеными. которыми были сделаны важные открытия по всех областей науки.

Сегодня достижение мусульманских ученых насчитывающие более 10 тысяч манускриптов, рукописей, книг, графических работ, манускриптов и более тысяч различных инструментов, хранятся в библиотеках, в музеях, частных коллекциях всего мира. Несмотря на это на западе до сих пор не хотят проводить серьезные исследование этой наследий и эти работы, до сих пор остаются неизвестными для ученых мира. Историки по крупицам находят все больше и больше материалов о разнообразных научных открытий исламских ученых, которые оказали огромное влияние на возрождение новой научной мысли и в развитие науки в Европе.

Например, известный ученый Бернард Льюис утверждал, что «Средневековая исламская наука была более практичной в таких областях, как медицина, химия, астрономия, агрономия, механика и это наследие была расширено и дополнено научными наблюдениями и экспериментами».

Несмотря на это на западе вклад мусульманских ученых в развитии мировой науки до сих пор намеренно игнорируются и большинство ученых в мире до сих пор остаются в неведении относительно исламской науки.

Наследник Британской Монархии принц Чарльз по этому поводу говорил: «На Западе неправильно понимается природа Ислама и сильно игнорируется долг нашей культуры и цивилизации перед Исламским Миром. В исламском мире, от Средней Азии до берегов Атлантики, был мир, в котором процветал наука и ученые исследователи. Но так как мы склонны видеть ислам в качестве врага Запада, как чужую культуру и систему убеждений, мы склонны игнорировать и стирать его огромное значение в нашей истории".

Придерживаясь к проверенным фактам, рассмотрим некоторые великие открытие и изобретение великого ученого, который сегодня незаслуженно «забыть» в мире:

Сегодня в мире лидером в области робототехники является Япония и чуть ли не каждый день узнаем о создании того или иного «чуда» техники, которое призвано упростить жизнь человека в самых различных областях его деятельности.

Однако первым изобретателем программируемого робота был отнюдь не Запад и Япония. Отцом робототехники считается изобретатель, математик, астроном Аль-Джазари. Свыше 800 лет назад, в конце XII и в начале XIII века в эпоху Исламского возрождения при дворе тюркской династии Селджукидов, чья столица располагалась на востоке современной Турции в Диярбакыре, как и отец служил механик-изобретатель, математик, астроном и инженер Абу аль-Изз ибн Исмаил ибн ар-Ризаз аль-Джазари (араб. أَبُو اَلْعِز بْنُ إسْماعِيلِ بْنُ الرَّزاز الجزري) или просто Аль-Джазари (1136-1206). Аль-Джазари до конца своих дней жил в г. Диярбакыре. Тюркское слово «gəzəri» в переводе на русский означает: непоседа, ходячий, шагающий.

Выдающийся ученый астроном, математик и механик-изобретатель Аль-Джазари был изобретателем первых в мире программируемых роботов. Почемуто в Европе Аль-Джазари прозвали «Да Винчи мусульманского мира». Хотя художник, изобретатель Леонардо да Винчи родился в 1452 году в городе Винчи во Флоренции (Италия) 250 лет после смерти Аль-Джазари и вероятно Леонардо да Винчи некоторые свои изобретении заимствовал от Аль-Джазари. В подтверждении к этому многие историки П.Дюэм, К.Трусдели, Г.К.Михайлов подвергали сомнению ряда механических изобретений Леонардо да Винчи.

Аль-Джазари прославился как изобретатель 50 сложных устройств, уникальных диковинных механизмов и роботов- автоматов.

В 1206 году Аль-Джазари написал трактат «Китаб фи марифат аль-хиял аль-хандасийя» («Книга об изучении геометрических воображений»), где описал конструкцию около 50 механизмов. Механизмы Аль-Джазари уникальны и в более ранних источниках не упоминаются.

В XIII веке это книга был известен в Европе под названием «Книга знаний об остроумных механических устройствах» и не имело аналогов. Эта книга считалось очень ценным научным трудом по теоретической и практической механике. В книге описывались те механизмы, которые Аль-Джазари соорудил собственноручно. Из выпущенных 16 копий этой книги 10 хранятся в музеях Европы, а 6 в библиотеках Топкапы в Турции.

Помимо этого Аль-Джазари также создал новые металлические двери, кодовые замки, компас с универсальными солнечными часами для любых широт и т.д.

Изобретенный Аль-Джазари коленчатый вал произвел техническую революцию в машиностроении. Сегодня коленчатый вал Аль-Джазари используется не только в автомобилях, но и в разных отраслях промышленности. Кроме этого, он сконструировал клапанные насосы, водоподъёмные машины и т.

Получивший широкую известность во всем мир Аль-Джазари е и даже спустя века был идейным вдохновителем для таких выдающихся ученых, как Ноберт Винер, Ампер, Джеймс Клерк Максвелл, Шолем Мандельбрайт и д.

На своей книге Аль-Джазари объяснив разнообразные устройства на рисунках оставил весьма ценное для истории машиностроения решение. Историками доказан, что именно он изобрел гидравлический насос. Произошло это на три столетия раньше, чем подобные устройства появились в Европе. По его чертежам строились двухтактные клапанные насосы, дамбы, водоподъёмные машины

и д. Даже в наш просвещенный век сохраняется огромный интерес к наследию этого великого тюркского гения науки.

Британский инженер–историк науки Дональд Хилл писал: «Трудно переоценить важность вклада Аль-Джазари в развитие инженерии. Его разработки легли в основу пособий по дизайну, производству и сборке машин». Арабский ученый, ныне проживающий в Англии Салим Т С Аль-Хассани пишет: «Около 1000 лет назад. Аль-Джазари довел технологии и новаторские работы до кульминации».

Аль-Джазари непосредственно сам создавал различные автоматы-роботы натуральной величины, воспроизводил функции живых существ по полученным знаниям *анатомии и физиологии человека и животных*.

Внизу показаны изобретенные Аль- Джазари несколько механизмы и роботы:

1. Аль-Джазари изобрел первого в мире технического новшества, коленчатого вала. Изобретение коленчатого вала являлся революцией в машиностроении. Революционность этой технической решении состоял в том, что возвратно- поступательные движение коленчатого вала превращался во вращательное и наоборот (Рис.1.):



Рис.1. Коленчатый вал

Несмотря на эти неоспоримые факты, в 1780 году ранее изобретенную Аль-Джазари коленчатого вала как свое собственное изобретение запатентовал, некий Джеймс Пикард из Бирмингема получив свидетельство о том, что якобы он является изобретателем коленчатого вала.

2. Уже историками доказаны. что впервые гидравлический насос состоявший из шестеренок, медных поршней, труб всасывания, нагнетания и клапанов, был изобретен Аль-Джазари на три столетия раньше, чем эти устройства появились в Западной Европе. По чертежам Аль-Джазари строились двухтактные клапанные насосы, дамбы, водоподъёмные машины и т. д. Водоподъемные механизмы Аль-Джазари для подъема воды из рек и колодцев, заменили труд животных энергией воды. С помощью этих насосов, воду поднимали на высоту 12 метров. (Рис.2.):



Рис.2. Схемы водоподъёмных насосов

Революционный прорыв в этих гидравлических насосах произошел с использованием коленчатого вала Аль-Джазари в качестве центрального механизма водяного насоса.

На рис. 3 показаны модели водоподъемных насосов построенные по рукописям Аль-Джазари. Водяное колесо приводить в движение механизмы из шестеренок, которые приводить в движение поршни с рычагом и две всасывающих поршня синхронно приводится в движение:



А б

Рис. 3. Насос двойного действия (а) и цепной водоподъемный насоса (б).

Некоторые водоподъемные механизмы Аль-Джазари работают до сих пор.

3. Механические роботы-музыканты Аль-Джазари состояли из фигур музыкантов, сидящих в лодке, которые были запрограммированы играть на барабанах и цимбалах. Эти роботы пользовались успехом при дворе правителе и были первыми программированными автоматами (Рис.4.):



Рис. 4. Механические роботы- музыканты

Благодаря встроенной во внутрь роботов систем сосудов, при переливании воды из одного сосуда в другой сосуд, эти сложные роботы умели играть на разных музыкальных инструментах. При этом, заранее можно было запрограммировать мелодии и изменить ритм музыки, которую они играли и в это время их тела и лица двигались и имели разные выражения.

4. Аль-Джазари смастерил различных часов и эти технически сложные часы в полной мере можно считать первыми в мире роботами. Один из них «Замковые часы» являлись самыми большими астрономическими часами (Рис. 5.):.



Рис. 5. Замковые часы

Это сложное устройство являлся первым программируемым компьютером. Он показывал знаков зодиака, орбиты солнца и луны. Продолжительности дней и ночей. Их можно было заново перепрограммировать.

Часы были оснащены пятью автоматами-музыкантами, которые исполняли мелодичные восточные песни. Работа этих часов в течение суток сопровождался сменой механических изображений, движением фигур и музыкой.

В дневное время на часах показывался солнечный, «всходящий» на востоке диск и шесть зодиака от Овна до Девы. Вечером полумесяц постепенно перемещался слева направо. Когда полумесяц оказывался между двумя дверцами, верхний дверь открывался и в ней показывался мужская фигура, а нижний дверь «окрашивался» в другой цвет.

По окончанию каждого часа соколы, стоявшие на боковых окошках, расправляли крылья и наклонились и из их клювк падали в вазу по шарику. В это время слышался звук цимбал. После этого соколы, складывая крылья, возвращались в начальное положение.

5. Автомат-робот Аль-Джазари «слоновые часы» являются самыми знаменитыми часами времен расцвета исламской науки (Рис. 6.):




Рис. 6. Слоновые часы

Эти часы состоял из индийского слона, египетского птицы-феникса, восточных фигур людей и китайских драконов. Слон олицетворял символ власти и величия, феникс перерождение жизни, дракон могущество и несокрушимость.

В механизме «Слоновых часов» применялся технологический процесс, представляющий собой чашу с отверстиями, расположенный в резервуаре с водой, который находился в животе слона. Через каждые полчаса чаша наполнялся и погружался в воду, что приводил в движение металлические шарики и нити, идущие от трона на спине у слона, которые в свою очередь вызывали различные сложные движение.

Когда на протяжении дня, получасовой цикл точных движений этих сложных механизмов заканчивал, чаша автоматически поднимался на поверхность и процесс снова повторялся. Ввиду того, что в течение года продолжительность дней и ночей меняется два раз в сутки, во время восхода солнца и заката часы переводились в исходное положение. Для этого шары возвращались на свое первоначальное место и регулировались уровень воды.

В 2010 году на выставке «1001 изобретение мусульманской наследии в нашем мире» в Англии был продемонстрирован копия этих часов, который являлся основной достопримечательности выставки.



Рис. 7. Автомат для сдачи крови

Описанные Аль-Джазари и реконструированные в 1977 году устройство для сдачи крови измеряла количество крови, во время популярной в исламском мире кровопускания.

Мы привели несколько примеров из многочисленных механизмов и роботов изобретенные Аль-Джазари: Как видно невозможно оценить масштабы важности работ Аль-Джазари сыгравшие ключевую роль в промышленной революции в мире. Эти работы содержать много научных мыслей и инструкций даже применяются при изготовлении современных машин и роботов.

## Выводы

1. Рассмотрены выдающиеся исторические достижения исламской науки и множество великих открытий, которых тюркские ученый Аль-Джазари подарил миру.
2. Анализированы незаслуженно «забытые» в Европе изобретения Аль-Джазари великого тюркского ученого.
3. Показаны научный вклад Аль-Джазари в мировую науку и оказанные этим ученым огромное влияние в научной мысли Европы.
4. Анализировано достижения научной мысли Аль-Джазари, которые сыграли важную роль в эпохе Возрождения в Европе.

## Литература

1. Ахмед Гуркан, «Окультуривание исламской цивилизацией Запада», Нур йайынлары, Анкара, 1998, с. 276- 395.
2. Дэвид С. Линдберг, «Начало западной науки: европейская научная традиция в контексте философии, религии и институтов, от 600 г. до н.э. до 1450 г. н.э.», Чикаго, 1992, с. 78-175.
3. Рожанская М.М., «Механика на средневековом Востоке», Москва, Наука, 1996, с. 324.
4. Tibbets D., Donald Hill, «The Book of Knowledge of Ingenious Mechanical Devices (Kitab fi ma'rifat al-hiyal alhandasiyya), by Ibn al-Razzaz al-Jazari»", Bulletin of the School of Oriental and African Studies, T. 38 (1), pp. 151-153
5. «Аль-Джазари-гений механики», (англ.) сайт MuslimHeritage.com.
6. Тернер Х.Р., «Наука в средневековом исламе: иллюстрированное введение», Остин, Тексаский Университет, 1995, с. 89-136.

**Рецензент: д.ф.ф-м. наук М.Гусейналиев**

Göndərilib: 10.02.2020 Qəbul edilib: 13.02.2020

«Қайырсыз адам жеміссіз ағаш сияқты», «Сараң дүниенің малын жиса да тоймайды», «Өз ашуын баса білген адам-күшті адам», «Өзі білмейтінін «білем» дегені айып», «Әр қасіреттің артында қуаныш бар», «Он дәруіш бір кілемге сияды, екі әкім бір кілемге сыймайды» т.б.

Арада сан ғасыр өтсе де, ақын еңбегі ұмытылмай, өз оқушысын тауып келе жатқаны дастанның өміршеңдігінің негізгі көрсеткіші. Атадан балаға, әулеттен әулетке мирас боп ауысатын қымбат ескерткіштер аз емес. Ал біздің Ахмет Иүгінеки бабамыз үрімбұтағына басқа емес, таза ақиқаттың өзін сый етіп қалдырған.

Біз «Ақиқат сыйы» дастанының идеялық-тақырыптық бағытына, композициялық құрылысына, көріктеу құралдарына, жырдың метрикалық жүйесіне біршама талдау жасау барысында, мынадай қорытындыға келдік: «Ақиқат сыйы» дастаны-өз заманының көкейтесті мәселелерін жырға арқау еткен, көркемдік дәрежесі биік, дидактикалық сарында жазылған, бүгінгі түркі тілдес халықтардың бәріне бірдей ортақ мұра болып табылады.

## Әдебиеттер

1. Иүгінеки А. Ақиқат сыйы//Тарих – адамзат ақыл-ойының қазынасы. Он томдық. Т.10. Астана: «Фолиант» 2006.
2. Бердібай Р. Ғасырлар толғауы:мақалар мен зерттеулер.-2-ші бас. - Алматы: «Жазушы» 1977 - 320 б.
3. Қыраубаева, А. Ежелгі әдебиет. 5 томдық шығармалар жинағы. 2-том - Алматы: "Өнер", 2008. - 216 б.
4. Сүйіншәлиев Х. Қазақ әдебиетінің қалыптасу кезеңдері: Ерте дәуірден XIX ғасырдың аяғына дейін. - Алматы: «Қазақстан», 1967. - 384 б.
5. Келімбетов Н.Ежелгі дәуір әдебиеті Алматы: «Ана тілі», -1991. - 264 б.
6. Йүгінеки А. Ақиқат сыйы. Түпнұсқаның фотокөшірмесі, транскрипциясы, прозалық және поэтикалық аудармасы, Баспаға дайындағандар: Ә.Құрышжанов, Б.Сағындықов, Алматы, 1985. Хибат-ул хақайық, Ташкент, 1971.

Göndərilib: 17.12.2020 Qəbul edilib: 19.12.2020

DOI: 10.36719/2663-4619/61/82-86

**Rəna Ağacan qızı Əliyeva**
Bakı Slavyan Universiteti
rena_344@mail.ru

# MƏRASİM FOLKLOR NƏĞMƏLƏRİ TÜRK DİLLİ XALQLARIN BƏDİİ TƏFƏKKÜRÜNÜN İFADƏSİDİR

***Açar sözlər:*** *mərasim, folklor, milli-mənəvi dəyərlər, milli təfəkkür, dini mərasimlər*

**Ceremonial folk songs are the expression of artistic thinking Turkish people (Turkish-speaking people)**

**Summary**

The ceremonies, reflecting national moral values of the ancient Turkish peoples are preserved. The one of the oldest ceremonies is the ceremony "Yug". (Yukh). "Yug" is the archaic song related to the mourning ceremony. This ceremony is held when somebody dies. Songs singigng during the ceremony are called laments (Agi). Died person is praised in this ceremony. This ceremony is executed (held) in Azerbaijan nowdays. Yug ceremonies existed in Azerbaijan long before Islam.
***Key words:*** *ceremony, the national traditional values, national style, national thinking, religious ceremony*

Mənəviyyatımızın zəngin qaynağı olan folklorumuz milli-əxlaqi dəyərlərimizi, adət-ənənələrimizi mənimsəyib dərk etməyimizdə, xalqımızın keçdiyi tarixi inkişaf yolunu öyrənməyimizdə müstəsna əhəmiyyətə malikdir. Tarixən Azərbaycan ərazisində intişar tapan müxtəlif dinlər xalqımızın bədii təfəkkürünün məhsulu olan ədəbi nümunələr üçün də yeni ideyaya, mövzuya çevrilmişdir. Əcdadlarımızın həyat təcrübəsinin araşdırılması baxımından məişət və mərasim nəğmələri diqqətəlayiqdir.

Azərbaycanda mərasim tamaşaları iki qismə bölünür: birincisi mövsümi mərasimlər,ikincisi məişət mərasimləri. Mövsümi mərasimlər yazın gəlişi,əkinin başlanması,məhsulun yığılması,elin-elatın yaylağa çıxması,qoyun qırxımı ilə keçirilir.Məişət mərasimlərinə isə aşıq toyları,dərviş düyünləri,ağlaşma məclisləri və s. aid edilir.

Məişət mərasimləri insanın doğulması, evlənməsi və vəfat etməsi ilə əlaqədar olan prosesləri əhatə edir. Bu zaman adqoyma, elçilik, nişanlama, xınayaxdı, toy, yaş kimi mərasimlərdə müəyyən məişət mərasim nəğmələrindən istifadə olunur. Mərasim və məişət nəğmələri vasitəsilə qədim inanclarla bağlı keçirilən ayin və mərasimlər haqqında məlumat əldə etmiş oluruq.

Azərbaycan milli mədəniyyətinin özəlliyi həm də ondan ibarətdir ki, çağdaş mədəni və sənət düşüncəmizdə bir çox əski mədəni-psixoloji fenomenlər demək olar ki, çox az transformasiya olunmuş halda işləməkdədir. Bu sıradan şifahi xalq ədəbiyyatı, aşıq sənəti, muğam və xalq musiqisi min illik inkişaf yolunu keçərək öz məzmun və dil-ifadə qatlarında qaynaqlarını və tarixi təsirlərin izlərini günümüzə qədər çatdırmışdır. Tarixi poetikaya malik olan bu klassik sənət növləri milli sənət təfəkkürümüzün təməlini təşkil edir.

Xalq yaradıcılığının ən maraqlı növü olan miflər isə tarixilik baxımından daha qədim dövrləri əhatə edir. Folklorumuzda dünyanın, insanın yaranması, Nuhun tufanı, dirilik suyu, əcdadlarımızla bağlı xeyli miflərə rast gəlinir. Coğrafi məkanlar, tarixi şəxsiyyətlərlə şifahi şəkildə yayılan rəvayətlər folklorumuzun maraqlı nümunələrindəndir. Bibiheybət, Əshabi-Kəhflə bağlı yaranan rəvayətlər geniş yayılmışdır.

Eyni zamanda atalar sözü və məsəllər folklorumuzun ən dəyərli incilərindəndir. Milli təfəkkürümüzdən xəbər verən bu örnəklər xalqımızın müşahidələrini, təsəvvür və təfəkkür tərzini, onun dünyagörüşünü, inam və etiqadını əks etdirir. Atalar sözlərində Allah – Tanrı, din, peyğəmbərlə bağlı kifayət qədər məsəllərə rast gəlmək mümkündür: "Tanrı dəvəyə qanad versəydi, yıxmadığı dam qalmazdı", "Allah bir, söz bir", "Allah bir qapını bağlayanda bir qapını açar", "Allah bu əli o ələ möhtac eləməsin", "Allah demiş: səndən hərəkət, məndən bərəkət", "Allah deyən namurad qalmaz", "Allah min dərd verib min bir dərman", "Allah var, rəhmi də var", "Allahdan nə gəlsə xoşdur", "Dinsizin ağzını imansız yumar" və s.

Azərbaycan yazılı ədəbiyyatının ən qədim nümunələrindən hesab edilən, Zərdüştliyin müqəddəs kitabı "Avesta" xalqımızın monoteist dünyagörüşü, xeyirlə şərin mübarizəsi haqqındakı təsəvvürlərini əks etdirir. "Avesta"nın əsasını xeyirlə şərin,işıqla qaranlığın,doğru ilə yalanın mübarizəsi barədəki dini-fəlsəfi fikirlər təşkil edir.Avestada aşılanan dini, fəlsəfi, humanist fikirlər Şərq ədəbiyyatı və onun ayrılmaz tərkib hissəsi olan Azərbaycan ədəbiyyatına dərin təsir göstərmiş, Xeyirlə Şərin, İşıqla Qaranlığın mübarizəsi yaranan yeni əsərlərin əsas motivini təşkil etmişdir.

Azərbaycanda tanrıçılığa, Tanrı dininə söykənən inanclar yayılmışdır. Ölkəmizin yerləşdiyi regionun hələ eramızdan əvvəldən ümumtürk məkanının mühüm tərkib hissəsi olması Azərbaycanda türklüyün sosial, siyasi, mədəni mövqeyini gücləndirərək Azərbaycan ədəbiyyatının ideya istiqamətlərinə əsaslı təsir göstərmişdir. Türk mədəniyyətinin şah əsərlərindən olan "Kitabi Dədə-Qordud" eposu Azərbaycanda müxtəlif türk etnoslarının qaynayıb-qarışması nəticəsində vahid xalqın formalaşdığı dövrdə ortaq, ümumi dastan şəklində təşəkkül tapmışdır. Tariximizin bədii inikası olan dastanda Azərbaycan türklərinin öz əski etiqadlarından İslama keçməsinin işartıları hiss olunur. Dastanın bəzi boylarında "Ağ qayanın qaplanının erkəyində", "Ağ sunqur quşunun erkəyində" kökləri olduğunu unutmayan oğuzlara saqqallı mollanın azan çəkməsi "saqqallı uzun tat ərinin banlaması"kimi görünür. Duxa Qoca oğlu Dəli Domrul isə "yaxşı igidlərin canını alan" Əzrayılla döyüşə girir. Lakin zaman keçdikcə oğuzlar "adı gözəl Məhəmməd dini" yolunda döyüşlərə başlayırlar.

Ala gözlü üç yüz igid qoş mənə,
Məhəmməd dini yolunda döyüşüm mən.

Milli-mənəvi dəyərlərin bütün tarixi ehtiyatlarını səfərbər etməyi, bu ehtiyatlardan xalqımızı tarixən ayaq üstə saxlamış, məhv olmağa qoymamış, onu özü olaraq qorumuş, dəyərləri əxz edərək müasir milli mənəvi-dəyərlər sistemimizə daxil etməyi tələb edir. Heç şübhəsiz ki, milli-mənəvi dəyərlərimizin ən nəhəng və möhtəşəm tarixi potensiyasını özündə qoruyan qaynaq "Kitabi-Dədə Qorqud" eposudur. Bu abidə milli düşüncə qaynağı kimi tarixən və bu gün milli mövcudluğumuzun etnoenergetik potensiyasıdır. "Kitabi-Dədə Qorqud" ensiklopedik lüğətində yuğ mərasimində "bozlama" taledən, qədərdən narazılığı ifadə edən hal kimi verilir və göstərilir ki, bozlama Anadoluda melodik olaraq ahənglə söylənilir. Dastanda bozlamaq sözünə çox yerdə rast gəlmək mümkündür: a) "Qadın ana! Qarşum alub, nə bögrərsən? Nə bozlarsan, nə ağlarsan?" b) "Bəybörə bəg, nə ağlayub bozlarsan?" c) "Oğul", "oğul" deyübəni bozlayayınmı?" (4, 105). Ölünü uca səslə oxşamağa bəzən zarıma da deyirlər. Dastanda zarıma zarılıq qılma kimi ifadə olunmuşdur: "Boyı uzun, beli incə Burla xatın boynıyla qulağın aldı düşdi; güz alması kibi al yanağın dartdı yırtdı; qarğu kibi qara saçını yoldı; "oğul", "oğul" deyübən zarılıq qıldı, ağladı" (4, 105). "Qopuz çalıb, ağu döyüb" mərhumu son mənzilə ötürən Dədə Qorqud dastanlarının qəhrəmanları yuğ mərasimini musiqi ilə rövnəqləndirirdilər. Dini mərasimlər kütlələr üzərində böyük psixoloji təsir qüvvəsinə malikdir.Dini mərasimlər zamanı insanların sosial statusu unudulur,bütün təbəqələrdən olan insanlar bir-birinə yaxınlaşır.Çünki dini mərasimlər ictimai həyatın ayrılmaz tərkib hissəsini təşkil edir.

"Kitabi-Dədə Qorqud" ən etibarlı qaynaq, ən mükəmməl şifahi tarixdir. Abidəyə böyük önəm verən Ulu Öndər Heydər Əliyev göstərir ki, "Kitabi-Dədə Qorqud" bizim milli estetikamızın mötəbər qaynağı olaraq mənəvi və estetik dəyərlərin vəhdətini özündə əks etdirir. Gözəllik və eybəcərlik, ülvilik və alçaqlıq, komiklik və faciəlik, məhəbbət və nifrətlə bağlı olan fikirlər, bizim əcdadlarımızın estetik duyumu lakonik ədəbi formalarda eposun müxtəlif boylarında ifadə olunur. Gözəllik və hikmətin, gözəllik və qeyrətin, gözəllik və sədaqətin qırılmaz daxili harmoniyası da "Kitabi-Dədə Qorqud"a xas olan estetik və etik kateqoriyaların mahiyyətini açıqlayır" (1, 10).

Təsadüfi deyil ki, adət və ənənələrin hər bir millətin həyatında oynadığı əvəzsiz rolunu yüksək qiymətləndirən Azərbaycan xalqının böyük oğlu Heydər Əliyev: "Milli adət və ənənələr hər bir xalqın milli mədəniyyətinin zənginliyindən, qədim tarixi kökə malik olmasından xəbər verir" deyib. Ümummilli Lider Heydər Əliyev 1997-ci il aprelin 20-də Kitabi-Dədə Qorqud dastanının 1300 illik yubileyi haqqında Fərman və 1999-cu il fevralın 21-də Kitabi-Dədə Qorqud dastanının 1300 illik yubileyi üzrə Dövlət Komissiyanın tədbirlər Planı haqqında Sərəncam imzalamışdır.

Folklordan bəhrələnmənin ən çox diqqət çəkən aspektlərindən biri olan xalq mərasimləri ədəbiyyatda geniş miqyaslı inikasıdır. Türk bədii təfəkkürünün parlaq təzahür forması olan yuğ mərasimlərində, oğuznamə və dastanların ifasında musiqidən geniş istifadə olunurdu. Qədim insanların dünyagörüşünə görə, musiqinin sədaları, qədim çalğı alətlərinin özünəməxsus tembri həm ifaçını, həm də dinləyiciləri sanki zaman və məkandan qopararaq, onları bədii obrazlarla zəngin sehrli dünyaya aparırdı. Yoğ isə qədim türklərdə matəm mərasimlərinə deyilirdi. Bəzi türk birliklərində yas mərasimləri xüsusi xarakter daşıyırdı. Hər hansı sayılıb-seçilən, qəhrəman, cəsur bir şəxs, yaxud başçı, xan dünyasını dəyişdikdə onun matəm mərasimi daha ciddi bir ənənəylə keçirilirdi. Belə hüzr məclislərində sığıtçı və yuğçular iştirak edirdilər. "Sığıtçı" matəmçilərə, "yuğçu" isə mərasimdəki ağlayıcılara verilən ad idi. Bu cür məclislərdə mərhumun ünvanına və onun ölümü münasibətiylə söylənən kədərli, hüznlü şeirlərə – ağılar deyilirdi.

Türk xalqlarında olduğu kimi qədim Qaraqalpaqlarda da dəfn nəğmələri "joklau" (yəni "yoxluq" nəğməsi) "ağılar"mövcuddur. Bu nəğmələr qırğızlarda "koşok", qazaxlarda "joktau" adlanır. Joklau qaraqalpaqların əskidən yaşatdıqları adət ənənənin tərkib hissəsi kimi dərk edilən nəğmələrdir. Bu nəğmələri

qaraqalpaqlar da azərbaycanlılar da olana uyğun qadınlar və qızlar ifa etdikləri kimi ifa edirlər. "Joklau" nəğmələri bütün yaxın insanlar dünyasını dəyişdikd ə oxunur:

Dayanmağa dirəyim,
Hər bir yerdə gərəyim,
Məndə can saxlayan ürəyim,
Böyük evdə duran çırağım.
Qabırğamda qanadım,
Xan surətli, bəy görkəmli,
Ayı gövdəli özü, …
At başı tək ürəkli… …
Otağımın sahibi
Ürəyimin qalası. (5.45)

Mərasim folklor nəğ mələri qədim türk xalqlarının məişətində, gün-güzəranında, həyat tərzində əsaslı yer tutur, xalqın tarixi-mə nəvi həyatının həm mifopoetik, həm də fəlsəfi-estetik baxış və dünyagörüşünü özündə cəmləşdirə bilir.

Qədim türk poeziyasında ən çox işlənən janrlar sav, qoşuq və saqudur. Bunların arasında saqu özünəməxsus yer tutur. Saqu matəm mərasimlərində qəhrəmanın ölümü münasibəti ilə söylənən mərsiyələrə və ağılara deyilirdi. Belə şeirlərdə vəfat etmiş şəxsiyyətin ayrılığından doğan kədər, onun igidlikləri və sağlığında gördüyü işlər yanıqlı, ələmli poetik dillə ifadə olunurdu.

Yuğ və ya Sağu — yas mərasimi ilə bağlı arxaik nəğmələridir. Bu mətnlər ortaq türk folklor arealında geniş yayılmış "yuğ", "ağı", "sağu", "yedi", "edi" adları ilə tanınmışdır. Bu mərasim insanların vəfatı zamanı ya evdə, ya da basdırılan zamanı düzəldilir. Əsas hissə yasın qurulduğu yerdə icra edilir. Oxunan mahnılar ağı adlanır. Qədim türklərdə yuğçu ozanlar - ağıçılar qopuzda çalaraq ölən haqqında mahnılar deyərlərmiş. Həmin mərasimdə ölən adam təriflənər, onun yaxşı cəhətləri, xeyirxahlıqları mövzu olarmış.

Türk şivələrində Yoğ, Yox, Yığ şəklindədir. Cənazə mərasimi, cənazə yeməyi kimi mənaları vardır. Ölü bir çadıra qoyulub, ətrafında doqquz dəfə dolanırlar. Beləcə ruhunun göyə çıxacağına inanırlar. Cənazə mərasimlərində Ağu, Sağu və ya Yuğu adı verilən ağılar oxunur. Bunlar ölünün arxasından yaşanan yas prosesində ağrını kənarlaşdırmaq ilə əlaqədardır və bənzər mənalar ehtiva edər. Cənazə mərasimləri yer üzündəki bütün İslam dini Azərbaycan xalqının milli-mənəvi dəyərlərində, dünyagörüşündə, həyat tərzində, adət-ənənələrində dərin izlər buraxıb. Zaman keçdikcə cəmiyyət dəyişdikcə sadəcə din və onun qayda-qanunları, hökmləri dəyişilməz qalır.

Yuğ həm də qədim türklərin musiqi, mahnı, rəqs, ağı parçaları ilə müşayiət olunan ölübasdırma mərasimi olub. Qədim Azərbaycanda yuğ (yuğlamaq-ağlamaq sözündəndir) adlanan ayin olmuşdur ki, sonralar onun tərkib hissələrinin çoxu matəm mərasiminə keçmişdir. Yas-matəm nəğmələri ağılar və mərsiyələr bizim dövrlərdə də qalmışdır. Mərsiyələr adətən matəm ayı olan məhərrəmlikdə çox ifa olunurdu.

Ə.B.Haqverdiyev "yuğ" mərasimi haqqında belə yazmışdır: "Qədim Azərbaycanda ölən böyük qəhrəmanlar üçün ağlamaq bir adət idi. Qəhrəman ölən günü camaatı bir yerə toplayırdılar. Bu toplantıya "yuğ" deyirdilər. ("yuğlama" – "ağlamaq" sözündəndir). Toplananlar üçün qonaqlıq düzələrdi, xüsusi çağrılmış "yuğşular" isə ikisimli " qopuz" çalıb oynayırdılar".

Ə.B.Haqverdiyev "Azərbaycanda teatr" adlı məqaləsində yuğ mərasimini digər xalq tamaşaları ilə bir yerdə öyrənir, "Şaxsey-vaxsey" mərasimindən, "Şəbeh" dini tamaşasından söhbət açır. O, yuqlamaq sözünü "ağlamaq" kimi izah etsə də, yuqçuların ikisimli qopuz çalıb oynadıqlarını bildirir (4, 104-105).

Qədim tarixçi Musa Kalankatlı isə ölübasdırma mərasimini belə təsvir edirdi: "Qılıncla, bıçaqla parçalanmış meyitlər üzərində təbil, zurna çalırlar... Qılıncla vuruşurlar. Qəbristana çatanda sevişirlər... Bir sırası ağlayır, hönkürür, bir sırası isə iblisanə adətlərinə görə rəqs edirdilər. Onlar oyunlar, rəqslər oynayır və oxuyurlar".

Əzizim el arasın
Cənnət say el arasın,
Ölüm yaddır o kəsə,
El sevsin, el arasın...

Bir çox türk xalqlarında, o cümlədən oğuzlarda ölümlə, dəfnlə bağlı mərasimlərin sırasında "yuğ" ritual-ayini xüsusi yer tutur. Yas mərasimlərində ifa olunan yuğ, yuğlama, ağılar, oxşamalar, bayatılar və s. ədəbi-musiqi formaları daxildir. Xalq arasında geniş yayılmış məişət mərasim nəğmələrindən biri olan ağılar,

əsasən yeddi hecadan ibarətdir və yas mərasimlərində avazla söylənən mənzum parçalardır. Yüksək obrazlılıq və emosionallıq ağıların bədii keyfiyyətinin əsas göstəricisidir. Ağılarda musiqi-improvizasiya üslubu əsas olsa da, həm də reçitativ-deklamasiya üslubunda oxunur. Ağılar şikəstə kimi "Segah" muğamı pərdələrində improvizə olunduğu halda,bayatılar "Qatar" muğamı üstə "Rast" ladında improvizə olunur.

Ağılar ölümlə, fəlakətlə bağlı olduğu üçün bu folklor nümunələrində daha çox hüzn, kədər, qəm-qüssə, iztirab əhval-ruhiyyəsi daha güclüdür.

Dağlara dolu düşər,
Qar yağar, dolu düşər.
Qəbrimi yol üstə qaz
Anamın yolu düşər.

Əzizim, qazan ağlar,
Od yanar, qazan ağlar
Qəriblikdə ölənin
Qəbrini qazan ağlar

Ağı-şifahi xalq şerində yas mərasimi ilə bağlı qüssə, dərd, kədər ifadə edən poetik formadır. Faciəli, sarsıntılı hadisələrlə, əsasən, ölümlə bağlı söylənir. Vaxtilə qədim türklərdə meyit yanında ağıları əsasən qopuz adlı musiqi alətinin müşayiəti ilə oxumuşlar. Bu günümüzə qədər gələn bu yuğ törənləri indi də davam etməkdədir. Xalq şairi Zəlimxan Yaqubun dəfn mərasimində aşıqların saz çalması tarixdən süzülüb gələn qədim yuğ mərasimlərinin ifadəsidir. Bu kimi nümunələr yüzlərlədir.

Elin hünəri getdi,
Gümüşü-zəri getdi.
Əcəlmi aldı görən,
Nəslin Sərvəri getdi.

Mən qəribi kim yoxlar
Yaraların kim bağlar
Qürbətdə kimsəm yox
Ölsəm görən kim ağlar?

İslam dini Azərbaycan xalqının milli-mənəvi dəyərlərində, dünyagörüşündə, həyat tərzində, adət-ənənələrində dərin izlər buraxıb. Zaman keçdikcə cəmiyyət dəyişdikcə sadəcə din və onun qayda-qanunları, hökmləri dəyişilməz qalır.

Yuğ– mərasimləri hələ islamdan çox əvvəl Azərbaycanda mövcud olub. İgid oğulların ölümünə həsr edilən bu mərasimlərdə ölən igidi anmaq, onun haqqında dəyərli sözlər, ürək yaxan ağılar deyib ağlayırdılar. Bu mərasimdə beş dəstə bir-birilə üzləşərdi: qılınc oynadanlar, çalğıçılar, ağçı qadın və kişilər, birdəki çalğıçılar.

Bədii nəsrdə qədim xalq mərasimlərinin arxaik bir qatının-"yuğ mərasimi"nin müəyyən cizgiləri öz bədii ifadəsini tapmışdır. Başdan-başa tarixi-etnoqrafik mədəniyyət abidəsi olan Mövlud Süleymanlının "Köç" romanında Qarakəllə tayfasının igid oğlu Amanın onlara düşmən olan Qurtan ağanın tayfası tərəfindən namərdcəsinə öldürülməsindən sonra oğuz elinin keçirdiyi bənzərsiz yas mərasimi qeyri-adi icra əlamətlərinə görə əslində qədim "yuğ" törənidir."...ağlaşma səsi qalxdı. Səhər tezdən Amanı götürdülər. Qarakəllələrin böyüyüb yurd boyda olmuş qəbiristanlığına apardılar. Qurtan ağanın alaçıqlarından bir dəstə atlı gəlmişdi. Dilmanc da aralarında gendən-genə tamaşa eləyirdilər. Arvadlar-gəlinlər, qızlar üç-üç, dörd-dörd cənazənin qabağına çıxıb əllərini yelləyə-yelləyə avazla ağlayıb oynayırdılar. Bu elə qəribə, həm anlaşılan, həm anlaşılmayan elə bir oyun idi ki, Qurtan ağanın adamları atın üstündə qala bilmədilər, düşüb papaqlarını çıxartdılar. Dilmanc batıq səslə tez-tez deyirdi:

-Bizim xəbərimiz yoxdu,Uğur bəy ,bizdən görmüyün.

Dilmancı eşidən yox idi. Cənazə gedir-gedir, dayanır, arvadlar bir yerəcə sancılır,cənazənin qabağında əllərini titrədə-titrədə,silkələnə-silkələnə oynayıb ağı deyirdilər. Amanın ölümü də addı, ağır toylar kimi hamının sümüyünə düşmüşdü.Amanın ölümünü oynayırdılar.Cənazənin qabağında ayaqlarını cütləyib, dizlərini bükə-bükə qollarını oynadan gəlinlərin,qızların əlləri vurulmuş kimi havada avazla çırpınıb-çırpınıb yanlarına düşüb can verirdi"(2.150-151)

Bu günlərdə tarixi Azərbaycan diyarını – Qarabağımızı mənfur düşmən işğalından azad etməklə Azərbaycan tarixində yeni səhifə açan şanlı Azərbaycan ordusu qırx dörd gün ərzində yeni bir tarix yazdı. Şəhidlərimizin qanı bahasına əldə olunan zəfər ən yeni tariximiz oldu. Bu qırx dörd gün ərzində yumruq kimi birləşən Azərbaycan xalqı öz milli qüruru, tarixi-etnoqrafik mədəniyyəti, milli-mənlik kimi milli mənəvi dəyərlərimizi gələcək nəsillərə ötürəcək bir tarix yazdı- 2783 şəhid verdi.

Ən qədim yuğ mərasimlərinin şahidi olduq bu Vətən müharibəsində. Qəhrəman oğullar böyüdən qəhrəman analar, Şəhid anası olaraq başlarını dik tutdular. Oğlunun tabutunu çiynində aparan Ana, qardaşının tabutun qürurla tutan bacı, ömür-gün yoldaşını mətanətlə qarşılayan Azərbaycan qadının yeni obrazı yarandı bu müharibədə. Şəhid balasını qarşılayan, meydanda qol qaldırıb "oynayan" Ana-sən qədim "yuğ"törənini nümayiş etdirdin.

Oğlun Şəhid oldu Anacan üzün ağ olsun,
Çətin də olsa de ki,Vətən sağ olsun!
Hamımızın anasısan Şəhid Anası
Belə ağlama, ağlama, ağlama Şəhid Anası...

**Ədəbiyyat**

1. A.Fərəcova "Kitabi Dədə Qorqud" da qəhrəman və cəmiyyət. Bakı. 2018.
2. M.Süleymanlı. Köç. Bakı, Yazıçı, 1984.
3. İ.Həbibli, S.ibrahimov "Orta əsrlər vahid Şərq ədəbi prosesi", Bakı. 2018. Hüseynov.
4. Hüseyinov (Alarlı) B.Viləş çayı boyunca (Yardımlının folklor dünyası). Bakı, Sözün işığı, 2015.
5. Nizami Məmmədov - Tağısoy "Qarapapaq ədəbiyyatı", Bakı, 2015.

**Rəyçi: dos. F.Əliyeva**

Göndərilib: 10.12.2020 Qəbul edilib: 10.12.2020

DOI: 10.36719/2663-4619/61/87-90

**İlahə Adil qızı Məcidova**
Azərbaycan Dillər Universiteti
goddess_adu@mail.ru

# ANTİUTOPİYA JANRİ REY BREDBERİNİN YARADICILIQ TENDENSİYALARINDAN BİRİ KİMİ

***Açar sözlər:*** *elmi-fantastika, utopiya, antiutopiya, proqnoz, kiçik həcmli nəsr*

## The dystopian genre as one of Ray Bradbury's creative trends

**Summary**

Utopia is a common literary theme, especially in a speculative and science-fiction genre. Authors use utopian genre to explore what a perfect society would look like. Utopian fiction is set in a perfect world, while a dystopian novel drops its main character into a world where everything seems to have gone wrong. Dystopian fiction can challenge readers to think differently about current world. The article is devoted to the etymology of dystopia genre within Ray Bradbury's creativity. In his short stories he tried to show the depth of his imagination. In Ray Bradbury's fiction the world is a terrible place. He exposes the destructive side of technological progress and paradoxes of human personality in a grotty society.

***Key words:*** *science-fiction, utopia, dystopia, prognosis, short story*

## Giriş

Elmi fantastik ədəbiyyata aid olan utopiya janrı yazıçının təxəyyülündə canlandırdığı ideal cəmiyyət modelinin bədii mətndə təzahürüdür. Qədim dövrlərdən başlayaraq yunan şairi Hesiod, Platon, F.Rable, F.Bekon kimi dahi mütəfəkkirlər utopiya ideyasını öz əsərlərinin əsas mövzusu etmiş və ideal dünya modelini özlərinə xas şəkildə təsvir etmişdirlər. Gerçəkləşməsi qeyri-mümkün olan substantiv cəmiyyət modelinə əsaslanan utopiya, həmçinin də mövcud cəmiyyətin tənqidinə əsaslanırdı və məhz bu səbəbdən zaman irəlilədikcə ideallığa meylin absurdluğu qəbul olundu və onun antitezisi olan antiutopiya anlayışı yarandı. Mahiyyət etibarı ilə xəbərdarlıq janrı da adlandırılan antiutopiyaya müraciət etmiş müəlliflər gələcəkdə dünyada baş verə biləcək hadisələrin proqnozlarını verməyə cəhd edir, mövcud prizmadan çıxış edərək gələcək dünyanın hansı fəlakətlərlə qarşılaşacağını təsvir etməyə çalışırlar. Çağdaş Amerika ədəbiyyatında elmi fantastika janrının əsas simalarından sayılan R.Bredberi də "Səhra", "Təbəssüm", "Piyada" kimi hekayələrində antiutopiya janrının elementlərindən istifadə edərək gələcək dünyanın portretini yaratmağa çalışmışdır.

Fantastika janrına müraciət etmiş yazıçıların dərin təxəyyül bacarığı sayəsində oxucu fərqli dünyalara səyahət edir, kosmik fəzanın ənginliklərindəki sirli dünya ilə tanış olur, elmin, texnikanın inkişaf edərək hansı mərhələyə qədər insanı təəccübləndirəcəyi barədə fərziyyələr irəli sürür, insan faktorunun yavaş-yavaş sıradan çıxdığı, robot və cihazların idarə etdiyi dünyada yaşamağın absurdluğunu dərk edir və qorxunc, dəhşətli, təhlükə dolu hadisələrin tüğyan edəcəyi yaxın gələcək barədə düşünür.

Yaşadığı dünyadakı qlobal problemləri dərk edən və onların həll yollarını axtaran insan övladı hələ qədim zamanlardan ideal dünya modeli barədə düşünməyə başlamışdır. İlk dəfə 1516-cı ildə ingilis yazıçısı T.Mor tərəfindən işlədilən utopiya termini antik dövrdən bəri bədii ədəbiyyatda öz yerini tutmuşdur.

"Müasir ədəbiyyatda distopik impuls" adlı əsərində "M.Keyt Buker (1994: 5) qeyd edir ki, utopik roman növünü məşhurlaşdıran T.Mor, öz ideal cəmiyyətini yaradarkən etik və mədəni baxımdan təbiət elmlərindən yararlanmışdır. Günümüzdə elm anlayışı Morun zamanındakından fəqli olsa da, XVII əsrdən bəri müasir elmlə utopik düşüncə uyğunlaşdırılmışdır. Platonun "Dövlət" adlı müasir zamanda geniş miqyasda oxunan utopik əsəri müasir texnologiyanın carçısıdır".

Cəmiyyətin yeni inkişaf mərhələlərinə qədəm qoymasının, elmi-texniki tərəqqinin, yeni və fərqli cəmiyyətlərin bir-birini əvəz etməsinin insanın düşüncə tərzinə, dünyagörüşünə qarşısıalınmaz təsiri bəşər övladının təxəyyül imkanlarının genişlənməsinə, düşüncə potensialının artmasına səbəb olmuşdur.

Elmi-fantastik ədəbiyyat müxtəlif sahələri əhatə etdiyindən, fərqli mövzu və ideyalara müraciət etdiyindən bir neçə alt-janrlara bölünür: utopiya, antiutopiya, xronofantastika, alternativ-tarixi fantastika, apokaliptik və postapokaliptik fantastika, kosmik opera, kiberpank və nanopank (4).

Yunan sözü olan "utopiya" "mövcud olmayan yer" mənasını ifadə edir. Utopik əsərlərdə reallıqda mövcud olmayan, qüsursuz, problemsiz cəmiyyət və ya dövlət quruluşundan bəhs edilir. Təsvir edilən utopik cəmiyyətlərdə sosial, siyasi, iqtisadi mənada qeyri-müəyyənlik mövcud olmur. Utopik əsərlərdə fövqəlreal,

mistik ünsürlərə rast gəlinmədiyindən bütün utopik romanları fantatsik hesab etmək doğru hesab olunmur. Fantastik əsərdən fərqli olaraq utopik əsərin müəllifi fövqəlreal və mistik motivlərə müraciət edərək oxucunu intizarda və narahatlıqda saxlamaq niyyətində olmur, bu romanlarda hər şey bəlli və açıq formada oxucuya təqdim olunur.

Antiutopiya, başqa sözlə, distopiya janrı utopiya janrına parodiya, sarkazm kimi yaranmışdır. "Xəbərdarlıq" janrı da adlandırılan antiutopiyada gələcəklə bağlı narahatlıqlar öz əksini tapır. Belə ki, antiutopiya janrına müraciət edən sənətkar gələcəkdə gerçəkləşəcəyi halda bəşər nəslinə qarşı yönələ biləcək qorxunc problemlərin məhz indiki durumun daxilində rüşeyim şəklində mövcud olması faktından çıxış etməlidir.

Antiutopiya ədəbiyyatda həyatın təsviri, simvolu kimi çıxış edir. Amerikan ədəbiyyatında da antiutopiya janrına marağın yaranmasının səbəbi məhz janrın özündə müasir problemləri ehtiva etməsi və real tarixi hadisələrə əsaslanması ilə əlaqədardır. Antiutopiya müasir dünyada insan şüuru tərəfindən yaradılan dağıdıcı hisslərin təsiri altında fəlakətə düçar olmuş, atom bombası, nüvə və bioloji silahla dağıdılmış, ekoloji böhranın qurbanına çevrilmiş cəmiyyəti təsvir etməklə mövcud dünya modelinin yaxın gələcəkdə rastlaşa biləcəyi fəlakətləri proqnozlaşdırraraq qarşısını almağa çalışır. Elmi fantastik ədəbiyyatın bir qolu olmağına baxmayaraq antiutopiya daha real mövzulara əsaslanır. Dövrün koloritini yaratmağa cəhd edən, meliorist dünya görüşünə sahib R.Bredberinin yaradıcılığında hər iki ədəbi janrdan məharətlə istifadə etməsi şübhəsiz ki, yazıçının dərin intellektualizmindən xəbər verir. Çağdaş dövrdə bir çox ABŞ yazıçılarının müraciət etdiyi elm və texnika qarşısında insanın acizliyi, totalitar idarə üsulu, kütlənin fərdə təsiri, müasir sivilizasiyasının deqradasiyası, yeni müharibə, yeni silah təhlükəsi, ekoloji fəlakətlərin məhv etdiyi Yer kürəsinin başqa planetlərlə əvəz olunması, ölüm qorxusu, yaşamaq arzusu kimi ciddi mövzular R.Bredberini də narahat edirdi.

"Bizi əhatə edən absurd şəkilə çatdırılmış reallıqdır" (5) deyən R.Bredberi XXI əsrin Amerikasını təsvir edərkən elmi texniki, hərdən də sosial proqnozlaşdırmada istifadə edilən ekstropolyasiya adlanan metoddan istifadə edir: gələcəyin portretini bu gün mövcud olan tendensiyalar əsasında modelləşdirir. Yazıçı əsərlərində fantastik simvolların köməyi ilə mövcud dünyaya antimodel yaradır.

Onun 1951-ci ildə işıq üzü görən "Səhra" hekayəsində texniki inkişaf və insanın ondan asılılığı probleminə müraciət edilib. Süni intellekt, insanın robot və texnikadan asılılığı nəticəsində hətta doğma ailə üzvlərinə qarşı qəddarlaşması kiçik nəsr nümunəsinin əsas mövzusunu təşkil edir. Belə ki, Vendi və Piter adlı iki övladı olan Corc və Lidia cütlüyü texnologiyanın ən yüksək həddə istifadə olunduğu bir evdə yaşayırlar. Hətta evləri və zehinləri texnikanın əsirinə çevrilib desək yanılmarıq. Evlərinin ən dəbdəbəli və maraqlı otağı hesab olunan uşaq otağından gələn qəribə səslər və övladlarının davranış pozğunluqları valideynləri otağa baxmağa vadar edir və onlar otaqda uşaqları tərəfindən himayə olunan vəhşi şirlərlə qarşılaşırlar. Valideynlər övladlarının psixologiyasının normal olduğuna özlərini inandırmağa çalışır, həyəcan axtarışı üçün onların bu qədər qəddarlaşıb qana maraq göstərdiklərinin səbəbini anlaya bilmirlər. Corc yaşadıqları evi daha sadə evə dəyişməyi təklif edəndə Lidia bir qədər narazılıq bildirir, axı bu evdəki texnologiya onun əvəzinə həm ana, həm qadın kimi demək olar ki, bütün öhdəlikləri həll edir. Evdən köçmək fikrinə uşaqlar da aqressiv reaksiya bildirirlər, hətta valideynlərini şirlərin önünə atmaqla hədələyirlər. Çünki yaşadıqları bu ev onlara bioloji valideynlərindən daha çox valideynlik edir. Nəticədə ruhları və beyinləri texnologiyanın əsirinə çevrilmiş uşaqlar valideynlərini şirlərə yem edir və heçnə olmamış kimi oyunlarına davam edirlər.

Hekayədə təsvir olunanların reallıqla əlaqəsi olmasa da, R.Bredberi texnoloji inkişafın insan həyatına vura biləcəyi zərərləri hiperbolalarla göstərməyə çalışır. Texnologiyanın hipnotik təsirinə məruz qalan ailənin üzvləri arasında demək olar ki, ünsiyyət yox dərəcəsindədir və bunun nəticəsi olaraq hər kəsdə eqoizm, özünəqapalılıq və qeyri-sağlam ruh halı mövcuddur. Paradoksal hal odur ki, insanlar texnikanın onların həyatını yavaş-yavaş məhv etdiyini anlasalar da ondan uzaqlaşa bilmirlər. Artıq elə bir dövr gəlib çatıb ki, insan yaratdığı "anti-insan"lı dünyada özünə yer tapa bilmir. Yazıçı sürətlə inkişaf edən texnologiyanın gələcəkdə səbəb ola biləcəyi fəsadları antiutopik tərzdə ifadə etməklə yanaşı həm də dərin psixoloji nüanslara da toxunur. Uşaq otağı uşaqların təlim tərbiyəsi üçün nəzərdə tutulduğu halda, hekayədəki otaq texnoloji "bumun" əsirinə çevrilmiş uşaqların qəddarlığının simvolu kimi təsvir olunur.

R.Bredberi bütün yaradıcılığını, istedadını insanın rifahına, gələcəkdəki fəlakətlərdən xəbər verərək xilas yollarının axtarılmasına sövq edən bir yazıçıdır. Texnokratik erada bəşəriyyətin gələcəyindən narahat olan yazıçının demək olar ki, hər əsərində fəlakət siqnalı duyulur. Yazıçı gec olmadan insanların fiziki və mənəvi böhrandan çıxış yolu tapmağını istəyir.

R.Bredberinin gələcək postapokaliptik dünyada bəşəriyyətin qarşılaşa biləcəyi cəhalətpərəstliyə həsr etdiyi digər bir hekayəsi isə "Təbəssüm"dür. 1952-ci ildə qələmə alınmış hekayədə yazıçı intibah dövrünün

şah əsəri sayılan "Mono Liza" portretinə çağdaş dünyada olan münasibətdən söz açır. "Mono Liza"nın portretinə baxmaq üçün sırada dayanan insanların arasında Tom adlı bir uşağı təsvir edən müəllif ilk başdan oxucuya onun portretə baxışının kütlədən fərqli olduğu impulsunu ötürür. 2061-ci ildə yaşayan bu insanlara görə dünyada heç nə dəqiq deyil, hər şey eynidi və dəyərli heç nə yoxdur. Müharibələrdən, fəlakətlərdən çıxmış bu insanlara heç nə maraqlı deyil, onlar xoşbəxtliyin, təbəssümün nə olduğunu unudublar. Sadəcə müəyyən bayramlarda əylənə bilə bu insanların əyləncə anlayışları da qəribə aqressivlik ehtiva edir. Belə ki, elm bayramı adlandırdıqları bayramda insanlar kitabları cıraraq, şəhərə ən son gətirilmiş avtomobilə çəkiclə zərbələr endirərək əylənməyə, xoşbəxt olmağa çalışırlar. İndi isə onların növbəti əyləncəsi "Mono Liza"nın portretini parçalamaq arzusudur. Tom isə kütlədən tamamilə fərqlidir, o portretin ecazkarlığı qarşısında donub qalır, qadının gözəlliyi, təbəssümü onu valeh etdiyindən o portretə toxuna bilmir. Lakin digər insanları düşündürən bugünə qədər yaxından baxmaq belə qadağan olunan, dəyərli bilinən bir portreti parçalamaq ehtirası idi və hər biri istəklərinə nail olurlar. Tomun bu çirkin vəziyyətdən qaçmaq, qurtulmaq, ona mane olmaq kimi bir şansı yox idi, onun edə biləcəyi yeganə manevr "Mono Liza"nın təbəssümünü qorumaq idi və portret parçalanan zaman Tom qadının təbəssümü olan parçanı heç kəsin cırıb dağıtmağına icazə verməyərək özü ilə götürür. "Mono Liza"nın portretinə münasibət əslində bütün mədəniyyətə, incəsənətə münasibət kimi dəyərləndirən R.Bredberi insanların incəsənəti heçə saydığı dövrdə Tom kimi bir obraz təsvir edərək az da olsa gələcəyə olan ümidini göstərməyə çalışmışdır.

Tədqiqatçı İ.Rodnyanskaya qeyd edir ki, "R.Bredberiyə görə sivil cəhalətpərəstliyin bütün dəhşətləri diktatura rejiminin yaranması ilə deyil, əksinə, təkamül yolu ilə, rahatlıq və çiçəklənməyə doğru can atan insanların dincliyinin qorunması üçün görülən zərərsiz tədbirlər nəticəsində doğulurlar" (6). R. Bredberi hesab edir ki, mənəvi mədəniyyətin ölümü müasir sivilizasiyanın öz qurğuları ilə proqramlaşdırılmışdır. İctimaiyyətin mənəvi böhranı totalitarizasiyanın səbəbi deyil, "müasirləşdirilmiş" dünyada sosial adaptasiya cəhdlərinin nəticəsidir. Yazıçının "Piyada" hekayəsində də insan və texnika arasındakı uçurum öz əksini tapmışdır. R.Bredberinin təsvri etdiyi gələcək, antiutopik dünya əslində oxucuya bugünün dünyasından çıxış edərək müəyyən proqnozlar ötürür. Belə ki, 2052-ci ildə Amerika cəmiyyətində soyuq, daşqaəlbli insanlar texnikanın əsirinə çevriliblər. Evlərindən çıxmayıb bütün gün televizora baxan insanlarsız küçələr boş qəbirstanlıq kimi təsvir olunub. Yalnız Leonard Mid insanların bu davranışlarını anlaya bilmir və ətrafa baxmaq, hava almaq üçün piyada gəzmək vərdişini itirmir. Onun gəzinti üçün belə olsa, maşından istifadə etməməyi gerilik, anormallıq hesab olunur və məhz bu səbəbdən içərisində adam olmayan polis maşını tərəfindən saxlanılır. Maşının radio dalğasından gələn səs texnologiya erasında hekayənin qəhrəmanının piyada gəzməsinin absurd olduğunu bildirir və ondan hava almaq üçün niyə evdəki kondinsionerdən istifadə etmədiyi soruşulur. Evindən çıxmağı, televizora baxmamağı, cəmiyyətə ayaq uydurmamağı və piyada gəzməyi obrazdakı repressiv meyl kimi qəbul edilir və onun psixi problemlərinin olduğu güman edilir. R.Bredberi Leonard obrazı ilə kütlə psixologiyasını bir mənalı şəkildə rədd edən, təbiəti, əsl insan kimi yaşamağı üstün tutan insanların antiutopik cəmiyyətdə qarşılaşa biləcəyi situasiyanı təsvir etmişdir. Bununla yazıçı həm də özünün texnologiyaya və inkişafa olan skeptisizmini göstərməyə çalışmışdır.

Qeyd edildiyi kimi, R.Bredberinin yaradıcılığında "insan-texnika" qarşıdurması vasitəsizdi. Onun fikrincə, "bir-biri ilə bağlılığı olmayan insanlardan ibarət texniki cəmiyyət mütləq şəkildə insana özünü ifadə etməsi üçün yer qoymayan tiranlığa səbəb olur". Yazıçının hekayələr toplusundan birinə son söz yazmış müəllif P.Molitvin hesab edir ki, "texnika yazıçını müqayisə edilməyəcək dərəcədə az maraqlandırır." "Farengeit 451" romanı sonra nəşr olunduqdan sonra bəzi tənqidçilər P.Molitvin fikrini də əsas götürərək, R.Bredberini texnofob, luddit adlandırdılar. Lakin müəllif bu fikirlə heç vaxt razılaşmayıb. Yazıçı avtoqəzaların səbəb olduğu fəlakətlərdə sevdiyi insanları itirsə də, KİV-dən uzaq həyat tərzi yaşamağa çalışsa da, əsələrinin hər birində texnoloji inkişafın son həddi əsas mövzu olmuşdur (7). Bu təkcə gələcək fəlakətləri təsvir edən "xəbərdarlıq" üslubunda deyil, həmçinin texniki inkişafın insan həyatında səbəb ola biləcəyi müsbət hadisələrlə də bağlıdır. Çünki R.Bredberi üçün hər zaman birinci yerdə texniki prosesin ümumbəşəri əhəmiyyətidir. "Elektrik bədəni nəğmələrimdə tərənnüm edirəm", "Pas" hekayələrində yazıçı texnologiyanın insanların həyatına olan müsbət təsirini göstərməyə çalışır və bununla da özünəməxsus formada luddit və texnofob olmadığını sübut etmiş olur.

Yazıçının yaşadığı dövr elmin və texnikanın zirvəyə çatdığı dövr olduğundan, müəllifin təxəyyül sərhədlərinin materiyadan kənar, başqa planetlərə qədər uzanması məntiqə uyğun hesab olunur. Elektromaqnit dəyişmə, şüa axını, fərqli dünyaların kəşf edilməsi təkcə elm adamlarının deyil, həmçinin geniş kütlənin də marağındadır. Yazıçı elm dünyasını gündəlik həyatla əlaqələndirdiyindən onun fantastikası da, antiutopiyası da oxucuya sanki yaxın gələcəkdə gerçəkləşmək impulsu ötürür.

Əsərlərində fantastika və reallığı çulğalaşdıran yazıçı təxmin etdiyi proqnozlarla insanları qorxutmur, əksinə onları qoruyur. Onun bəşəriyyətin gələcəyi naminə səsləndirdiyi proqnozlar ədəbiyyatın sərhədlərini aşaraq gerçəkliyə nüfuz edir.

## Nəticə

Məqalədə, çağdaş ədəbiyyatın aparıcı tendensiyalarından olan antiutopiya janrının təməlində dayanan utopiya anlayışı təhlil olunmuş, antiutopiya janrına xas xüsusiyyətlər araşdırılmışdır, janrın spesifikasının və əsas elementlərinin Rey Bredberinin nəsr nümunələrində inikası tədqiq edilmişdir.

## Ədəbiyyat

1. Booker M. Keith, Tbe Dystopian İmpulse in Modern Literature, London, Greenwood Press, 1994.
2. Negley G., Patrick J.M. - The Quest for Utopia: An Anthology of Imaginary Societies, The Canadian Journal of Economics and Political Science, Vol. 20, No. 2 (May, 1954), 599 p.
3. Sargisson L., Sargent L.T. Living in utopia. Ashgate publishing. Ltd, 2004, 221p.
4. http://parafr.az/oxu.php?id=2051
5. http://raybradbury.ru/articles/shlionskaya_disser/part1/
6. http://www.dissercat.com/content/khudozhestvennyi-mir-reya-bredberi-traditsii-i-novatorstvo
7. https://www.biography.com/people/ray-bradbury-9223240

**Rəyçi: prof. A.Sabitova**

Göndərilib: 23.12.2020 Qəbul edilib: 24.12.2020

DOI: 10.36719/2663-4619/61/91-93

**Mehriban Asif qızı Mehdiyeva**
Bakı Dövlət Universiteti

# MÜASİR DÖVRDƏ TÜRK DİLLƏRİNİN LEKSİK SİSTEMİNDƏ BAŞ VERƏN DƏYİŞMƏLƏRƏ BİR BAXIŞ

***Açar sözlər****: dil əlaqələri, təmaslı əlaqə, təmassız əlaqə,  sözalma, leksika*

## A look to the contemporary changes of lexical system of the Turkic languages

**Summary**

In this paper were given the changes met in the lexical system of a language, some information on international words, there also made necessary analyses on the contemporary processes taken place in lexic systems of Turkic languages. There met vivid examples of nationalizing vocabulary in the system of Turkic languagea as a result of qaining independence in these Republics. And in this view-point one can note that borrowings for now mainly come from Turkey. Contemporary researches prove that the process of borrowings in the meantime go rather apart from these languages. And this cannot serve forming one common Turkic language for all.

***Key words:*** *language, contacts, close contacts, disjointed contacts, borrowing, lexics*

Tarixi inkişaf prosesində dildə müxtəlif dəyişmələr baş verir. Bu cəhət özünü dilin ayrı-ayrı səviyyələrində, daha çox isə leksik sistemində büruzə verir. Lüğət tərkibində zənginləşmə siyasi, ictimai, iqtisadi yeniləşmələrlə bağlı meydana çıxır. XX əsrin sonlarında dünyada baş verən hadisələr, yeni müstəqil dövlətlərin yaranması, bu dövlətlərin milli dil sistemində müəyyən proseslərlə müşaiyət olundu. Həmin dövrdən 30 ilə yaxın bir müddət keçsə də bir sıra dillərin leksik sistemində sabitləşmə hələ də nəzərə çarpmır.

Hər bir dilin formalaşması onun daşıyıjısı olan xalqın inkişaf tarixindən, əlaqədə olduğu başqa dillərin təsirindən asılı olur. Dillərarası əlaqələrin dillərin genaloji xüsusiyyətinə görə üç forması vardır: 1) qohum dillər arasında əlaqələr; 2) qohum olmayan dillər arasında əlaqələr; 3) qarışıq əlaqələr.

Başqa bir meyara, daha doğrusu dil sisteminə görə əlaqələr də üç şəkildə təzahür edir: 1) eynisistemli dillər arasında əlaqələr; 2) müxtəlif sistemli dillər arasında əlaqələr; 3) qarışıq əlaqələr.

Dil əlaqələrinin təmaslı (kontaktlı) və təmassız (kontaktsız formaları da vardır. Qeyd edək ki, təmaslı əlaqələr zamanı dillərin bir-birinin leksik sisteminə təsiri daha güclü və sürətli olur.

T.Hacıyev «Ortaq türk dili» problemi ilə bağlı tədqiqatında göstərmişdir ki, türk dil ailəsini başqa dil ailələrindən fərqləndirən buradakı ailədaxili anlaşma faktıdır. Türkcələrin bir-birini anlama dərəcəsində yaxınlığı dünya dillərinin ailə quruculuğu tarixində xüsusi haldır. Ansaq bu anlaşma qismən anlaşmadır.; ideya da bundan ibarətdir ki, bu qismən anlaşma bazasında bir ümumi, ortaq dil yaradılsın [Bax: 1, s. 8].

Azərbaycanın, o cümlədən də digər türkdilli dövlətlərin müstəqillik qazanması, müstəqilliyin əsas atributlarından biri olan dövlət dilinin istifadəsi üçün geniş imkanlar yaratdı. Türk dilləri ictimai-siyasi, iqtisadi, sosial, hüquq, beynəlxalq münasibətlər, diplomatiya və s. terminoloji sahələri yeni inkişaf dövrünə qədəm qoydu. Belə bir vəziyyətdə türk dillərinin bir-birinə yaxınlaşması üçün də əsaslı zəmin yarandı. Yaxınlaşma, şübhəsiz ki, ilk öncə, bu dillərin leksik sistemində dəyişmələrlə mümkün idi. Leksik sistemin sözalma imkanlarının qohum dillərin lüğət fondlarındakı türk mənşəli sözlərə, leksik vahidlərə yönəldilməsi əhəmiyyətli məsələlərdən biri idi. Lakin bu günə olan vəziyyət prosesin bütün türk dillərində eyni istiqamətdə getmədiyini göstərir. Aydındır ki, dilin sözalmasına təkan verən və mane olan səbəblər vardır. Sözün alınması intralinqvistik və ekstralinqvistik cəhətlərlə səciyyələnir.  Ekstralinqvistik səbəblər sırasında siyasi, iqtisadi, sosial, mədəni sahələrdəki dil əlaqələri dayanır. Son dövrlərdə ayrı-ayrı türk dilləri arasında əlaqələri artır. Bunu qarşılıqlı əlaqələr zəminində nəzərdən keçirsək, bir vaxtlar SSRİ-nin tərkibində olan türkdilli dövlətlərin Türkiyə ilə əlaqəsinin genişlənməsinin şahidi oluruq. Lakin bu türkdilli dövlətlərin bir qismində və demək olar ki, əsas qismində Rusiya ilə bağlılıq hələ də özünü göstərir. Bu bağlılıq bir çox məqamlarda müstəqil türkdilli dövlətləri zorla müəyyən siyasi, hərbi və iqtisadi birlik buxovunda saxlamaqla əldə olunur. Nəticədə bu sahələrdəki əlaqələr dilə də təsir göstərir, onun müstəqil inkişafına mane olur.

Azərbaycan və Türkiyə arasında əlaqələrin daha geniş spektr qazanması, Azərbaycanın müstəqil siyasət yürütməyə üstünlük verməsi Azərbaycan-türk dil əlaqələrinin daha intensiv şəkildə getməsinə səbəb olmuşdur. Bu cəhət özünü Azərbaycan dilinin leksik sistemində baş verən dəyişmələrdə göstərir.

Məlumdur ki, müstəqillik beymnəlxalq dillərlə, o cümlədən ingilis dili ilə əlaqələrin də miqyasını artırmışdır. Azərbaycan və ingilis dil əlaqələri qohum olmyan dillər və ya müxtəlifsistemli dillər arasında əlaqələrə aiddir. Azərbaycanla İngiltərə arasında ərazi yaxınlığı olmadığından bu dillər arasında əlaqənin tarixi lap qədimlərə getmir. İngilis və Azərbaycan dilləri qarışıq dil əlaqələrində iştirak etmişdir və bu tipli əlaqə müasir dövr üçün də müəyyən qədər səciyyəvidir.

Azərbaycan-ingilis dil əlaqəlrinin mövcudluğunu sübut edən əsas amil müasir Azərbaycan dilinin lüğət tərkibində ingilis mənbəli xeyli sözün olmasıdır. Məsələn, qazon, qol, bunker, buldoq, bluminq, biznes, biznesmen, blok, blokada, beysbol, bar, banknot, banket, ballast, noutbuk (notebook), laptop, audiobuk, peycer, taymer, şreder (shreyder), plotter, skayner, printer və sair. Bu cür alınma sözlərin həm izahlı və terminoloji lüğətlərdə, həm də ayrı-ayrı funksional üslublara aid rabitəli mətnlərdə işlənməsinə dair külli miqdarda misallar gətirmək olar. Təhlil göstərir ki, belə alınmaların bir qismi başqa türk dillərinin, o cümlədən də türk dilinin leksik sistemində qeydə alınır. Məsələn, "**Laptop** fiyatları, en uygun dizüstü bilgisayar modelleri ve distribütör firma garantili markalar sadece Vatan Bilgisayar'da. Bilgisayar kategorisinde **Laptop** modellerinde 59 adet ürün bulundu"[2]. "Hp **plotter** modellerini en uygun fiyatlara firmamızdan temin edebilirsiniz. Güncel **plotter** Hp modelleri ve **plotter** fiyatları konusunda iletişime geçip farkımızı görün" [3].

Sözalma səbəbinin müxtəlif dillər üçün eyniliyi bu dillərin eyni leksik vahidi öz lüğət fonduna daxil edir. Tədqiqatçıların fikrinə görə, sözalmanın aşağıdakı səbəbləri vardır: "1) reseptor dilin koqnitiv bazasında müvafiq anlayışın olmaması; məs.: noutbuk, laptop, audiobuk, peycer, taymer, şreder, plotter, skayner, printer, tüner, toner; 2) reseptor dildə müvafiq adın olmaması: virtual, investor, daycest, spiçrayter, sponsor, sprey, prays-list, imic (obraz), top-model" [4, s.24].

Qeyd edilən iki səbəb bir-biri ilə bağlıdır. Təbii ki, anlayış, predmet və s. olmadıqda onun adına da ehtiyac olmur. Müasir dövrdə yeni texnologiya vasitələrinə bir qayda olaraq ingilis dilinin vasitəsi ilə adın verilməsi və bu adların sözalma prosesində müxtəlif dillərə, o cümlədən də türk dillərinə keçməsi hadisəsi baş verir. Əgər "Ortaq türk dili" problem prizmasından yanaşsaq, son döv alınmaları, ümumiyyətlə, beynəlmiləl söz və terminlər bu dillərin leksik sistemində bir ortaq lay yaratmaqdadır. Müasir dövrün səciyyəvi cəhətlərindən biri də qabaqcıl texnologiyanın qərbdə toplanması, ingilis dilinin millətlərarası dil rolunda çıxış etməsidir. Ona görə də yeni əşya və anlayışlar artıq daha çox adları ilə birgə alınır. Nəticədə bu adlar dillərdə beynəlmiləl alınma sözlər kimi öz yerlərini tuturlar.

Sözalma öz tarixinə görə qədim olan dil hadisəsi olub yalnız müasir cəmiyyətdə baş verən dilxarici və dildaxili proseslərlə tənzimlənmir. Azərbaycan, türk, türkmən, qazax və başqa dillərinə müxtəlif dövrlərdə daxil olmuş sözlərin həm miqdarı, həm də geneologiyası fərqlidir. Məsələn, Azərbayjan dilinə ərəb-fars sözlərinin və rus sözlərinin daha çox keçməsi müxtəlif inkişaf dövrləri ilə bağlıdır. Qazax, türk, özbək və s. dillərdə bu prosesin özünəməxsusluğu da şübhə doğurmur. Təbii ki, qeyd olunanlar türk dillərinin leksik sistemində artıq baş vermiş proseslərdir. Onların gedişinə deyil, nəticələrinə təsir göstərmək mümkündür.

Hər bir dövrün öz sosial, iqtisadi, mədəni əlaqələr kompleksi vardır. Dil elementlərinin qeyri-müntəzəm inkişafı haqqında ümumi qanuna görə, dilin daha vacib elementləri təsirə tez məruz qalır. Dildə belə elementlər dilin lüğət tərkibinə daxil olan sözlərdir. Dilin qrammatikası isə kənar təsirə qarşı davamlıdır. Bu və ya digər dilin təsiri tarixi səbəblərlə -müharibələr, ərazinin işğalı, səyahət, ticarət və s. ilə əlaqədardır. Bütün bu hadisələr dillərarası əlaqələri sürətləndirir. Yeni alınma sözlərin intensivliyinin artması müxtəlif dövrlərdə fərqlidir. Konkret tarixi şəraitdən asılı olaraq alınma sözlərin sayı artır və ya da azalır.

Hazırda mövcud olan müstəqil türk dillərinin öz dialekt və şivələri vardır. Eyni zamanda bu dillər fonetik, leksik və qrammatik cəhətdən də tam üst-üstə düşmür. Doğrudur, onların ortaq olan ümumtürk dil xüsusiyyətləri vardır. Bu xüsusiyyət türk dillərinin leksik sistemində də qorunub saxlanmışdır. Onu da qeyd edək ki, ümumtürk mənşəli leksik vahidlərin müxtəlif türk dillərində hansı səviyyədə qalması kompleks şəkildə öyrənilməmişdir. Əgər belə bir ümumtürk leksik layın tam şəkildə qurulması mümkün olarssa, həmin laydakı leksik vahidlərin ayrı-ayrı türk dillərində istifadə imkanlarını genişləndirmək olar.

Türk dillərinin leksik sistemlərinin, lüğət tərkibinin bir-birinə yaxınlaşmasında yalnız alınma internasionalizmlərə istinad etmək düzgün deyildir. Alınmalar bütün dil sistemi üçün yaddır və onlardan istifadə olunması dilin fonetik və qrammatik normalarına öz təsirini, şübhəsiz ki, göstərir.

Türk dillərinin leksik sistemlərində dəyişmə ümumtürk sözlərinin, həmçinin mənşəcə türk sözlərinin artması istiqamətində getməlidir. Doğrudur, bu zaman qloballaşmanın, beynəlxalq inteqrasiyanın diqtə etdiyi əsaslar da nəzərə alınmalıdır.

Türk dilində alınmaların qarşılıqlarının tapılmasına xüsusi diqqət verilir, bu problemlə xüsusi qurum məşğul olur. Bunun nəticəsində müstəqilliyini yeni əldə etmiş türk dillərindən fərqli olaraq türk dilində mənşəcə türk olan leksik vahidlərin sayı artır. Bu dildə bir sıra alınma sözlər milli sözlərlə əvəz edilmişdir.

Məsələn: kompromis (anlaşıt), konvensiya (antbeti), vitse-prezident (asbaşkan), orator (aytac), koalasiya (bağlaş), sektor (bölge), instansiya (başvurak), eksport (çıkat), deklarasiya (diyev), period (dönem), faktor (etmen), prosedura (eylem), tradisiya (gelenek), vizit (göret), qarantiya (inanca), atmosfera (kalik), kompensasiya (karşılıqa), konversiya (kesne), konsessiya (kesi), kontrakt (koluşuk), deleqasiya (salkur), transport (taşıt) və s. Əgər bu sözləri, deyək ki, Azərbaycan dilinə proyeksiyalandırsaq onların dərhal dilin leksik sistemində yer alacağı, dildə işləklik qazanacağı şübhə doğurur.

Onu da qeyd edək alınmaların türk mənşəli və ya dilin öz sözləri ilə əvəz edilməsi, yaxud dilin normaları əsasında yeni sözlərin yaradılması cəhdlərini başqa türk dillərində də müşahidə edirik. Bu proses Qazaxıstanda da gedir. Qazax dilində də son illər alınma leksikanın milli sözlərlə əvəzlənməsi baş verir. Məsələn: rubrika (aydar), veteran (ardaqer), universal (əmbebap), şantaj (bopsa), kosmos (ğarış), kosmonavt (ğarışker), auditoriya (dərisxana), plyaj (cağaçay), daça (jazxana), flaqman (calauqer), petruşka (casılşa), çempion (cenısker), putevka (coldama), komandirovka (colsapar), professional (kəsipkoy), rekomandasiya (kepildeme), demonstrasiya (körsetu), polemka (pikirtalas), vizit (sapar), vizitka (saparnama), zaçet (sınak), konstruktiv (sındarlı), kontakt (tüyispe) və s.

Qazax dilində prezident-elbası, suverenitet-eqemendilik, sivilizasiya-erkeniem, informasiya-aknapam ilə əvəz edilmişdir. Əvəzlənmələrin qazax dili səviyyəsində hansı dərəcədə uğurlu olmasını bir tərəfə qoyub, onun ümumtürk müstəvisindəki tətbiqini düşünsək əhəmiyyətli müsbət nəticə almağın çətinliyini aşkar görürük. Bu baxımdan başqa türk dillərində də milli söz yaradıcılığı, ortaq türk mənşəli sözlərdən istifadənin artırılması prosesinin fərli şəkildə getməsini müşahidə edirik. Bu prosesdə diqqəti daha çox cəlb edən cəhət fonetik, qrammatik və semantik səviyyələrdə norma pozulmalarının meydana çıxmasıdır. Dəyişmənin vahid ortaq mexanizmi işlənməmişdir. Ayrı-ayrı türk dillərindəki əvəzləmələr müvafiq dilin xüsusiyyətlərinə əsaslanır, başqa türk dillərini əhatə etmir.

Azərbaycan dilində də bir sıra alınmaların müəyyən mənada milli vahidlərlə paralel olaraq işlədilməsinin şahidi oluruq. Məsələn region-bölgə, kredo-əqidə, faktor-amil, kompromis-güzəşt, konflikt-münaqişə, geopolitik-geosiyasi və s. Bu vahidlər, daha doğrusu əvəzetmə nəticəsində işlədilən sözlər heç də tam ümumtürk mənşəli deyildir. *Politika* əvəzinə *siyasət*, *konflikt* yerinə *münaqişə* və s. işlətmək yeni alınmanın dildə mövcud olan əvvəlki alınma ilə əvəz edilməsidir. Türk dilləri üçün ortaq lüğət fondunu yaratmaq zamanı bir dilə çox-çox əvvəl keçmiş alınmanın başqa bir türk dilində olub-olmaması da nəzərə alınmalıdır.

“Türk dillərinin lüğət tərkibində son dövrdə baş verən dəyişikliklər aşağıdakı göstərildiyi kimi qruplaşdırıla bilər:

1. Türk dillərinin fonetik, morfoloji normalarına müvafiq yeni sözlər yaranır;
2. Dilin passiv fondunda qalmış söz və terminlər (xüsusilə arxaik və dialekt sözlər) yeni mənada dilə daxil olur;
3. Dünyaya inteqrasiya ilə əlaqədar iqtisadiyyat, mədəniyyət elm və siyasətlə bağlı əcnəbi söz və terminlərin müstəqil türk birbaşa dillərinə güclü axını baş verir” [1, s.297].

Bir türk xalqı aldığı leksik-terminoloji vahidi olduğu kimi işlədir, digər türk xalqı isə öz dilində həmin vahidin qarşılığını axtarıb tapır. Bu baxımdan türk dillərinin leksik sistemlərində fərqli proseslər baş vermiş olur. Mahiyyət etibarı ilə bu proseslərin vahid bir məcraya yönəldilməsi əhəmiyyətli və vacibdir.

Son illərdə türk dilindən Azərbaycan dilinə keçmiş «canlı yayım», «soyqırım», «gündoğar», «ulusoy», «toplum», «özəllik», «bilgi», «ilişgi», «yazar», «cizgi filmi», «iş adamı», «durum», «yetərsay» kimi sözlərlə yanaşı xeyli sayda başqa sözlər vardır ki, onların işlənməsində sabitlik hələ ki, yoxdur. Məsələn: endirim, sənətçi, özəlləşdirmək, öndər, öncül, önəm, önəmli, öndə getmək, öndə gəlmək, öncə, yapıt, suç, bilgi, ötərgiləşdirmə, dışarı, sonuc, açım, ünlü, deyim, anlam, anlatma (kursiv), anlaşıt, anım, anıt, açıqlama, bazarlama, bakan, başkənd, bağlam, qurum, qudsal və s.

Əgər başqa türk dillərini , daha doğrusu, qazax, türkmən, qırğız, özbək kimi dillərinin müasir dil materiallarını araşdırsaq onlarda da xeyli sayda yeni sözlər tapa bilərik. Türk dillərinin leksik sisteminin ümumi yeniləşmə mənzərəsini bu şəkildə öyrənmək olar. Yalnız bundan sonra bu dillərin leksik sistemlərində ortaqlaşdırma ideyası üzərində dərindən düşünmək olar.

**Ədəbiyyat**

1. Hacıyev T. Türklər üçün ortaq ünsiyyət dili. Bakı, Təhsil, 2013
2. Laptop// https://www.vatanbilgisayar.com/laptop/?__cf_
3. Plotter//plottersistem.com
4. Брейтер М.А. Англицизмы в русском языке: история и перспективы: Пособие для иностранных студентов-русистов. - Владивосток: Диалог, 1998.

**Rəyçi: dos. D.Hümbətova**

Göndərilib: 08.12.2020 Qəbul edilib: 10.12.2020

DOI: 10.36719/2663-4619/61/94-97

**Rəna Yaqub qızı Təhməzova**
Bakı Dövlət Univeristeti

# EPOS MƏTNLƏRİNDƏ GİRİŞ HİSSƏSİNİN MƏZMUN XÜSUSİYYƏTLƏRİ

***Açar sözlər:*** *epos, giriş, ozan, skop, informasiya, zaman, məkan*

## The meaning features in introductory parts of Epos texts

**Summary**

This article is dealing with the analyses of the contents of introductory parts of epos texts being as a part of folk literature.

In epos texts introduction is mainly covering the ozan's or the narrator's speech of a sender the first information to the addressee.

The analyses show that in the introductory part the narrator gives necessary information on the participants or the place of the events too or time and the place as well.
***Key words:*** *epos, introduction, ozan, scope, information, time, place*

Eposlar uzun tarixi bir yol keçmiş fərdlərin qrupda, qəbilədə, tayfada birləşərək yaratdıqları cəmiyyəti, bu cəmiyyətin adamlarını, rəhbərlərini, qəhrəmanlarını, həyat və məişətlərini, adət və ənənələrini tərənnüm edir. Birləşmə, birgələşmə, kollektivləşmə, nəhayət cəmiyyətləşmənin ilk rüşeymləri eposlarda müşahidə olunur. Bu əsərlərdə toplumun razılıq əsasında formalaşmış yasaqları onu göstərir ki, bu toplum qayda qanunlarla tənzimlənən bir birliyə doğru inkişaf edir və o, hələ dövlət adlanan müasir ictimai-siyasi sistem halına gəlməmişdir. Eposun təqdim etdiyi cəmiyyət ən ibtidai dövlət formasındadır, tayfalara, icmalara, etnoslara parçalanmış və ya belə elementlərin sərt deyil, zəif, kövrək birləşməsi şəklindədir. Bir tam kimi onun başında, həmçinin tərkib hissələrinin başında bir rəhbər durur (Bayandır, Qazan, Aruz, Baybura, Skild Skevinq, Beovulf, Xrodqar, Xalfdan və b.). Eposda haqqında bəhs açılan birlik İç Oguz, Daş Oguz, Uç oq, Boz oq, danlar, qaytlar və s. şəkildə birləşir. "İbtidai quruluş "Bəsit dövlət" kimi təqdim edilən birliyin "Xaosdan Kosmosa keçid" mərhələsində olması **mifin** yaşama, mövcud olma məkanına fərdin davranış tərzinin daxil olması birliyidir. Mifin "azad bir ruhun, hələ müxtəlif qanun-qayda əsarətinə alınmamış daxili azad ruh məkanı vardır" və mif özü onu (məkanı) çərçivəyə salmağa başlayır. O, məkanı yaratmağa, yəni başqa sözlə desək, kollektivi, cəmiyyəti pərçim eləməyə başlayır. Kollektivi yaratmaq onun üçün pərçim üsullarını icad eləmək deməkdir. Və yazılmamış qanunlar kodeksi belə pərçim üsullarından olur" (Abdullayev K.1991, c.15,30).

Epos etiketi belə cəmiyyətin etiketidir, onun yasaqları, qadağaları etiketin pozulmasıdır və fərdlərarası konfliktlər də yasaqları pozmaqdan doğur. Belə konfliktlər yasaqları pozmağa etirazdır. KDQ eposunda təsvir olunan cəmiyyətdə artıq çoban, ər, alp, bəy, xan statusları müəyyənləşib, dəqiqləşib. Qazan bəydir, Qaracıq çoban isə çobandır və Qazanın "Ağzın qurusun, çoban! Dilin çürüsün, çoban! Qadir sənin alnına qada yazsun, çoban!" qarğışını dilə gətirmək statusu var. Çobanın isə Qazan olan yerdə onun evini almağa getmək statusu yoxdur. Çünki Qalın Oğuz bəgləri bunu Qazanın başına "qaqanc qaxarlar, çobanla getməsəydi Qazan kafiri almazdı deyərlər" (KDQ c.46). Yasağı pozmaq, Qazanın yağısına ondan izinsiz girmək istəyi Qazanla çoban arasında konflikt situasiyası yaradır. Qazanın köməyinə çatan igidlərin "Çal qılıncın, ağam Qazan, yetdim" harayı da Qazanın yağısına Qazandan sonra girmək, yasağı pozmamaq etiketinin təsdiqidir. Qanturalı onu ölümdən qurtarmağına baxmayaraq, Selcan xatunu dəstursızca onun yağısına girməyinə görə bağışlamaq istəmir və deyir: "Dəstursızca yağıya girmək bizim eldə ayıb olur".

Tozan quş oluban uçadınmı?
Saqalınla boğazından tutadınmı?
Qafillücə sənin başın mən kəsəyinmi?
Alca qanın yer üzünə tökəyinmi?
Qara başın tərkinə asayınmı? (KDQ c.92)

KDQ-də belə konflikt situasiyaları, etiketin, yasaqların pozulması halları müxtəlif boylarda qeydə alınır. Bəzi hallarda qəhrəmanlar özləri etiketin qorunmasına nəzarət edirlər. Məsələn: "Uşun qoca oğlı Səgrək" boyunda Qazanın divanında bəyləri basıb keçən Əgrəkə tərs uzanmış deyir: "Mərə Uşun Qoca oğlı, bu

oturan bəglər hər biri oturduğu yeri qılı-cilə-ətməgilə olubdur. Mərə, sən başmı kəsdin, qanmı tökdün, acmı toyurdun, yalıncığımı tonatdın. ( KDQ c.110).

Yaranmış, formalaşmış birliyin, cəmiyyətdə baş verən hadisələr haqqında nəğmələr qoşub, boy boylayıb, soy soylayan ozan da yaradıcılığında yasaqları nəzərə alır, onlar barədə məlumat verir və özü də yasaqlara əməl edir. Ozanın yasaqlara əməl etməsinin bəzi göstəriciləri eposların giriş hissələrində nəzərə çarpır.

Hər bir eposun xüsusi maraq doğuran tərəflərindən biri epik aləmin elementləri, ünsürləri və sosial quruluşudur. Anqlo-sakson eposu "Beovulf"da obrazlar sistemini kral, drujinaçılar, kraliça, qəhrəmanlar, onların drujinaları olub epik aləmin ideal cəmiyyətini təşkil edir. KDQ-də bu cəmiyyət xan, bəylər, qəhrəmanlar, onların sevib seçdikləri xanımlar, qəhrəmanları başına toplaşan igidlərdən ibarətdir. Hər iki eposda epik mikrososium da yer alır. Qazan da bəydir, Bəybörə də, Aruz da bəydir. Lakin onların arasında Qazan üstün mövqedədir. Bu cəhət ola bilsin ki, Qazanın Bayandırdan sonra xan olmaq statusundan irəli gəlir. Tayfa fərqliliyi də mikrososiumlar əmələ gətirir. KDQ-də İç Oğuzun Taş Oğuza asi olduğu boyda bu aydın görünür. KDQ-də cəmiyyətin sosial quruluşundakı əsas fərqlərdən biri burada başqa dinli cəmiyyətlə qarşıdurmanın aparıcı xətt olmasında özünü göstərir. "Beuvulf"da hadisələrin aparıcı xətti mifik düşmənlərlə mübarizə təşkil edir. "Beovulf" da epik sosium məhduddur və burada real ictimai münasibətlərə cüzi yer verilir. Sosial strukturun yeganə qanadı qəhrəmanlıq idealına cavab verən rəhbər və onun drujinasıdır. Bu mikrososium nəql edənin və dinləyicinin şüurunda bütün qalan aləmi əvəz edir. "Beovulf" da əkinçilər, tacirlər, sənətkarlar və s. yoxdur. KDQ-də idə sosial qruplara bölgünün izləri zəif şəkildə də olsa özünü göstərir, dastnda çoban, bəzirganlar, qul-qaravaşlar, adi cəmiyyət üzvləri iştirak edir. Qeyd etmək lazımdır ki, "Beovulf"da yalnız bir dəfə qul obrazı canlandırırlır. Qul əjdahanın xəzinəsindən qızıl camı oğurlayır. Eposda bu hərəkət ən alçaq işlərdən biri sayılır və əjdahanın qautlara hücumunun səbəbi olur.

Qeyd etdiyimiz kimi, eposu nəql edən də müəyyən yasaqlara əməl edir. Fikrimizcə, ozanın və ya skopun əməl etdiyi yasaqlardan biri birlik, cəmiyyət rəhbərini həm statusa, həm də ona müraciətə görə ayırmadır. Bu faktlar eposların giriş hissələrində aşkar nəzərə çarpır.

"KDQ"-də tədqiqatçıların "müqəddimə" adlandırdığı hissəni nəzərə almasaq, on iki boyun hər biri giriş və sonluğa malikdir. Giriş hissələrini boyların ardıcıllığı ilə qeyd edək:

1. "Bir gün Qam Ğan oğlı xan Bayandır yerindən turmışdı. Şami günlügi yer yüzinə dikdirmişdi. Ala Sayvanı gög yüzinə aşanmışdı. Bin yerdə inək xalicəsi döşənmişdi". (KDQ, s.34)
2. "Bir gün Ulaş oğlı Tülü quşun yavrısı, bizə miskin umudı, Amit soyının aslanı, Qaracuğın qaplanı, Qonur atın iyəsi, xan Uruzun ağası, Bayandır xanın göygüsi, Qalın Oğuzın dövləti, qalmış yigit arxası Salur Qazan yerindən turmuşdı. Toqsan başlu ban evlərin qara yerin üzərinə dikdirmişdi. Toqsan yerdə ala qalı-ipək döşəmişdi. Səksən yerdə badyələr qurulmuşdu. Altun ayaq sürahilər düzülmüşdü. Toquz qara gözlü,xub yüzlü, saçı ardına urulu,köksi qızıl dügməli, əlləri biləgindən qınalı, barmaqları nigarlı məhbub kafər qızları Qalın bəglərinə sığraq sürüb içərlərdi". (KDQ.s.42)
3. "Qam Ğan oğlı Bayandır yerindən turmışdı. Qara yerin üstünə ağ ban evin dikdirmişdi. Ala sayvan gög yüzinə aşanmışdı. Bin pərdə ipək xalicəsi döşənmişdi. İç Oğuz, Daş Oğuz bəgləri Bayandır xanın söhbətinə dərilmişdi". (KDQ.s.52)
4. "Bir gün Ulaş oğlı Qazan bəg yerindən turmışdı. Qara yerin üzərinə otaxların tikdirmişdi. Bin yerdə ipək xalicəsi dösətmiş idi. Ala Sayvan gög yüzinə aşanmışdı. Ağzı böyük xümrələr ortalığa salınmış idi. Toquz yerdə badyələr qurılmışdı. Altun ayaq surahilər dizilmişdi". (KDQ.s.68)
5. "Oğuz zamanında Qanlı qoca, derlərdi bir gürbiz ər vardı. Yetişmiş bir cılasun oğlı vardı. Adına Qanturalı deirlərdi". (KDQ.s.85)
6. "Məgər xanım Duxa qoca oğlı Dəli Domrul deyirlərdi, bir ər var idi.Bir quru çayın üzərinə bir körpü yapdırmışdı. Keçənindən otuz üç aqça alurdı, keçmiyənindən dögə-dögə qırq aqça alurdı"ş (KDQ.s.79)
7. "Qam ğan oğlı xan Bayandır yerindən turmışdı, qara yerin üzərinə ağ-ban evini dikmişdi. Ala Sayvan gög yüzinə aşanmışdı. Bin yerdə ipək xalicəsi döşənmişdi. İç Oğuz (Taş Oğuz) bəgləri söhbətə dərilmişdi. Yemə-içmə idi".(KDQ.s.94)
8. "Məgər xanım, bir gün Oguz oturırkən üstünə yağı gəldi. Dün içində ürkdi, köçdi. Qaçub gedərkən Aruz qocanın oğlancığı düşmüş, bir aslan bulup götirmiş, bəsləmiş. Oğuz gilə əyyamla gəlüb yurdına qondı". ( KDQ.s.98)
9. "Qam Ğan oğlı xan Bayandır yerindən turmışdı. Ağ ban evini qara yerin üzərinə dikdirmişdi. Ala Sayvan gög yüzinə aşanmışdı. Bin yerdə ipək xalicəsi döşənmişdi. İç Oğuz,Taş Oğuz bəgləri yığnaq olmışdı". (KDQ.s.104)
10. "Oğuz zamanında, Uşun qoca derlər, bir kişi vardı. Ömründə eki oğlı vardı. Ulu oğlının adı Əgrək idi. Bahadır, dəlü, yaxşı igid idi. Bayandır xanın divanına qaçan istəsə varır-gəlürdi. Bəglər-bəgi olan Qazan

divanında buna heç qapu-baca yoğdı. Bəgələri basub, Qazan ögündə oturardı. Kimsəyə ittifaq eyləməzdi". (KDQ.s.110)

11. "Məgər xanım, Tırabuzan təkurı bəglər bəgi olan xan Qazana bir şahin göndərmişdi. Bir gecə yeyub oturarkən şahinçibaşına aydır: "Mərə, sabah şahinləri al, xəlvətcə ava binəlim!"-dedi" (KDQ.s.116)

12. "Üç oq, Boz oq yığnaq olsa, Qazan evin yağmaladardı. Qazan gerü evin yağmalatdı. Əmma Taş Oğuz bilə bulunmadı. Həmin İç Oğuz yağmaladı". (KDQ.s.123).

Boylardan üçü "bir gün" zaman zərfliyi ilə başlanır və onlardan biri "Qam Ğan oğlı xan Bayandır", ikisi "Ulaş oğlı" ilə davam edir. "Bir gün" ifadəsini nəzərə almasaq, dörd boyda giriş qəlibi Bayandır xanın, iki boyda Qazan bəyin ağ-ban evini dikib məclis qurması barədə məlumat verir. İstər Bayandır xanın, istərsə də Qazan bəyin məclis qurması barədəki məlumat, kiçik fərqlər nəzərə alınmazsa, demək olar ki, eynidir. Altı boy oxşar giriş qəlibi ilə başlanır və bu qəliblərdəki "yerindən durmaq" səhər yataqdan durmaq mənasında deyil, hazırlıq gördürmək, məclis qurmaq üçün işə başlamaq, bu işi, yəni hazırlıq işini bitirib qonaqları qəbul etmək anlamındadır. Ozan bu giriş qəlibindən sonra, demək olar ki, hər dəfə məclisin başlanmasına keçid edir. Bəzi hallarda bu keçid yeyib-içmək, bir boyda qonaqları qəbul etməyə keçiddir. Boyun əsas hadisəsinin sujeti, başvermə ardıcıllığı da bundan sonradır. Yəni qeyd edilən giriş qəliblərindən sonra ozan müəyyən bir hadisəni, daha doğrusu, boyun adında qeyd olunan hadisəni nəql edir. Nəqletmə elə qurulur ki, hadisələr bədii zamanın indisində cərəyan edir və gələcəyə doğru axır.

Epik nəğmələrdən epik dastanlara keçid etnik şüurla hər bir xalqın sosial-mədəni təcrübəsi ilə şərtlənmişdir. Şifahi şəkildə yaranmış, ağızdan –ağıza keçərək böyük yaşam yolu keçmiş folklor nümunələri, xalq yaradıcılığı inciləri sonradan yazılı ədəbiyyatla müqayisəsi onların arasındakı fərqləri aşkar şəkildə ortaya qoyur. Belə fərqlərin, eləcə də oxşarlıqların axtarışı epos poetikasının vacib problemlərinin həllində əhəmiyyətli rol oynamışdır.

Giriş hissələrinin müqayisəsini müxtəlif aspektlərdə aparmaq mümkündür. Burada daha çox ilk söyləmlərdə verilən informasiyanın məqsədi və əhəmiyyəti diqqəti cəlb edir.

Epos toplanmış kollektiv üçün nəql edilir. Adamların bir yerə toplanması isə məclisin qurulduğunu təsdiq edir. Girişin "Bir gün Qam Ğan oğlı xan Bayandır yerindən turmışdı.Şami günlügi yer yüzinə dikdirmişdi. Ala Sayvanı gög yüzinə aşanmışdı. Bin yerdə inək xalicəsi döşənmişdi" formasında başlanması zaman parametrinə görə keçmişdə baş vermiş hadisədən bəhs olunmasını göstərir. Əslində, hər bir nəqletmədə hadisə keçmişə aid olur. Belə olan halda ozanın verdiyi ilk informasiya dinləyənlərin Bayandırı tanıdığını, onun xan və Qam Ğan oğlu olmasını bildiyini təsdiq edir. Buradan da belə nəticə çıxır ki, dinləyənlər də oğuzlardır. Ozan xanı təqdimetmədən başlayır. Görünür ki, ozanın danışdığı hekayətlərdə ilk əvvəl xan haqqında məlumat verilməlidir. Belə məlumatın yoxluğu yasaq sayıla bilər. Bu nöqteyi nəzəri qəbul etsək, onda 5, 6, 8, 11, 12-ci boylarda ozan yasağı pozmuş olur.

5 və 10-cü boylar "Oğuz zamanında" temporal birləşməsi ilə başlanır. Birləşmə boyun nəql edildiyi tarixlə boydakı hadisələr arasında zaman fərqinin az olmadığını göstərir. Burada da dinləyənlərin oğuzu tanıması və oğuz zamanından müəyyən mənada xəbərdar oması informasiyası vardır. Həm 5-ci, həm də 10-cu boyun girişindəki narrativ konstruksiya dinləyənlərin haqqında danışılan adamları tanımadığını şərtləndirir. Yəni onlar Qanlı qocanı, onun oğlu Qanturalını, Uşun qocanı və onun oğlu Əgrəki tanımırlar. Əks təqdirdə ozanın nitqində "derlərdi" formasından istifadə olunmazdı.

Ozan 10-cü boyda həm Bayandır xanın, həm də Qazanın adını dilə gətirir. Belə məlum olur ki, qeyd olunan oğuz zamanı Bayandır və Qazan xanın yaşadığı və Oğuz cəmiyyətini idarə etdiyi dövrü nəzərdə tutur. 5-ci boyda isə bu adlar çəkilmir. 5 və 10-cü boylarda oğuz bəyləri üçün məclisin qurulması barədə informasiya yoxdur. Bu giriş hissələri ozanın Bayandırın və ya Qazanın məclisinə toplaşanlar üçün danışması aydınlaşmır. Onun danışdığı rəvayətə oğuz qövmündən olan başqa adamlar qulaq asır. 10-cü boydakı giriş hissəsi qulaq asanların, adresatların Bayandır və Qazanı tanıması barədə informasiya daşıyır. Onu da qeyd edək ki, 11-ci boyda da ozan giriş hissəsində Bayandır xan haqqında məlumat vermir. Bu boyda da danışılan rəvayətin adresantları üzdə deyil. "Məgər xanım, Tırabuzan təkurı bəglər bəgi olan xan Qazana bir şahin göndərmişdi. Bir gecə yeyub oturarkən şahinçibaşına aydır: "Mərə, sabah şahinləri al, xəlvətcə ava binəlim!" -dedi" (KDQ.s.116). Giriş hissəsində Qazanın və Trabzon məkan adının çəkilməsi nəql edilənin oğuzlara aid olmasından xəbər verir. Qazan rəbərdir və ona bəxşişlər göndərilir. Bu giriş hissəsində Qazan xanın şahinbaşının olması qeyd olunur. Qazan ona göstəriş verir. Bu göstəriş ova çıxmaq haqqındadır. Deməli Qazanın ova çıxması üçün görüləcək hazırlıq işləri də onun xidmətçiləri tərəfindən yerinə yetirilməlidir. Giriş hissəsində Trabzon barədə əlavə informasiya yoxdur. Lakin "Trabzon təkürü" ifadəsi bu yerin oğuzlarda olmadığını, ancaq oğuzlarla əlaqələrin mövcudluğunu nəzərə çatdırır.

Epik əsərlərdə istifadə olunan giriş hissələri əvvəldə yerləşir. Belə yerləşmə ilkin vacib informasiyaların daxil edilməsini şərtləndirir. K.Vəliyevin fikrinə görə, söyləm-formula-söyləm-formula-söyləm... sxemi nitq

aktında əmələ gələn formula bir söyləmdən digərinə (bir nitqdən digərinə) keçərək poetik strukturun dayanıqlı elementinə çevrilməsinin inikasıdır (Велиев К.1999, с.214)

Aydındır ki, giriş hissəsi bitmiş fikir ifadə edən hazır nitq konstruksiyası olduqda funksional semantik sistemliyi aşkarlanır. Konkret eposun girişi və ya giriş hissələri eyni epos çərçivəsində müəyyən xronoloji ardıcıllığı qorumalıdır. Belə ardıcıllıq girişdəki zamana aid olduğu kimi adları çəkilən personajlara da şamil edilməlidir.

Hər hansı eposun formullarını müəyyənləşdirmək təsnif prinsipləri əsasında mümkünləşir. KDQ-nın boylara bölgüsü,1 2 boyun mövcudluğu onların başlanğıc (inisial) və son (final) hissələrini müqayisə etməyi sadələşdirir. 12 boyun giriş hissəsindən götürülmüş fraqmentlərin oxşarlığı onların formul kimi qəbul olunmasına əsas verir.

## Ədəbiyyat

1. Abdullayev K. Gizli Dədə Qorqud. Bakı, Yazıçı, 1991, 152 s.
2. Kitabi-Dədə Qorqud. Bakı, Yazıçı, 1988, 265 s.
3. Велиев К. Лингвистическая поэтика. Баку, Гянджлик, 1993, 271 с.

**Rəyçi: prof. A.Abbasov**

Göndərilib: 09.12.2020 Qəbul edilib: 10.12.2020

DOI: 10.36719/2663-4619/61/98-105

**Təranə Həsən qızı Məmmədtağıyeva**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
mamedtaqiyeva@gmail.com

# VIII SİNİFDƏ "NAQİLLƏRİN ARDICIL BİRLƏŞDİRİLMƏSİ" MÖVZUSUNUN TƏDRİSİ PROSESİNDƏ ŞAGİRDLƏRİN PRAKTİK BACARIQLARININ FORMALAŞDIRILMASI VƏ İNKİŞAF ETDİRİLMƏSİNDƏ KOMPÜTERDƏN İSTİFADƏ

***Açar sözlər:*** *kompüter, elektrik dövrəsi, cərəyan şiddəti, gərginlik, müqavimət, ardıcıl birləşmə, praktik bacarıqlar*

## Use of the computer in the course of teaching the topic "Serial wire connection" in the vii grade to build practical skills of pupils

**Summary**

The article shows how to develop students' practical skills using computers. As an example, the method of using the Vocational Laboratory Crocodile Phyiscs has been described in the topic of "Serial wire connection". Through this program, the students learn to experimentally apply the regularity of coupled wires. By means of the program, the students also will be introduced to the demonstration of a consistent wiring before the research, and will be informed about the work they will do. At the same time, the article provides a model of work flow in measuring the intensity and tension of the consecutive coupled wires. The dimensions of the lamp, the ampermeter, and the voltmeter according to Duist are clearly stated in the scheme.

***Key words:*** *Computer, electrical circuit, electric current, voltage,resistance, serial connection, practical skills.*

## Giriş

İnsan düşünə bildiyini yarada bilən varlıq olduğundan şagirdlər də özləri yaratdıqlarından zövq alır və onun arxasınca gedərək uğur qazanırlar. Texnologiya məhz bunu həll edir. Kompüter texnologiyası intellektual cihaz olaraq öyrədən və öyrənənin ideyalarının həyatda tətbiqinə imkan yaradılmasında əlverişli vasitədir. Müasir dövrümüzdə kompüter proqramlarının imkanlarının genişlənməsi, inkişafı, yenilikləri bizə tədrisdə daha səmərəli metodlardan istifadə etməyə kömək edir. Əgər EHM-in istifadəçisi müəllimdirsə, onda o, tədrisdə kompüter modelindən istifadə edə bilər və bu zaman onun qarşısında pedaqoji yaradıcılıq üçün geniş meydan açılır. Müəllim modeli nümayiş etdirərək iş rejimini özü seçə bilir, tədqiq olunan obyektin parametrlərini bu və ya digər ardıcıllıqla özü dəyişə bilir. İşin tempini tənzim edə bilir, zəruri hallarda isə nümayiş elementlərini təkrar edib eyni zamanda siniflə müsahibə apara bilir [2,s.120]. Məhz kompüter texnikası fizikanın tədrisində şagirdlərin praktik bacarıqlarının inkişafında, təlimə maraq tərbiyəsində mühüm rol oynayır. Şagirdin yaradıcılıq qabiliyyətini, məntiqi düşüncəsini inkişaf etdirir.

Məsələn bu gün bütün dünyada məşhur olan "Crocodile Physics" adlı proqram haqqında məlumat verilir. Bu güclü virtual laboratoriya proqramı, fiziki hadisələri modelləşdirməyə, "Elektrik və elektromaqnit", "Hərəkər və güc", "Dalğa hadisələri" və "Optika" mövzuları üzrə virtual sınaqlar aparmağa imkan yaradır. "Crocodile Physics" elektron laboratoriya proqramında 46-dan çox hazır təcrübə nümunələri Beynəlxalq İGCSE, A-Level imtahan tədris planlarına uyğundur. "Crocodile Physics" proqramı fizika dərsini tədris edən müəllimlər üçün laboratoriya təcrübələrini şagirdlərlə birgə aparmaq baxımından olduqca faydalıdır [1 ].

VIII sinifdə "Naqillərin ardıcıl birləşdirilməsi" mövzusunun tədrisi prosesində biz "Crocodile Physics" virtual laboratoriya proqramından istifadə etmişik. Şagirdlər tədqiqat işlərindən əvvəl müəllimin Naqillərin ardıcıl birləşdirilməsinin nümayişi ilə tanış edilir, görəcəkləri iş barədə məlumatlanmış olurlar. Bu halda şagirdlərin dövrənin qurulması zamanı işin gedişi modelindən istifadə etmələri daha faydalı olur.

Aşağıda yeni dərs nümunəsi göstərməzdən əvvəl onu deyə bilərik ki, naqillərin ardıcıl birləşdirilməsi mövzusu üzrə dərsliyin 179, 180 və 182-ci səhifələrində verilmiş şəkil və sxemlər doğru deyildir. Həmin sxemlərdə ampermetrin, voltmetrin və lampaların Duistə görə ölçüləri düzgün göstərilməmiş, sxemdə 3 nümayiş ampermetri və ya 3 nümayiş voltmetrindən istifadə edilməsi təklif olunmuşdur. Əvvəllər və hələ də günümüzdə məktəblərin heç birində 3 nümayiş ampermetri və voltmetri mövcud deyil. Ona görə də həmin sxemləri yenidən işləməyə ehtiyac vardır. Eyni zamanda sxemlər Duistin tələblərinə uyğun çəkilməlidir. Təklif edirəm ki, sxemlərdə məktəb laboratoriyası üçün verilmiş ampermetr və voltmetr cihazlarının şərti

işarələri çəkilib göstərilsin. Səhifə 179-da (a), 180 (b) və 182 (c) verilmiş sxemlər aşağıdakı kimi (şəkil 1, şəkil 2, şəkil 3) verilməlidir.

***Standart: 1.1.3.*** *İstilik hərəkəti və elektrik hadisələrinin qanunauyğunluqlarına aid topladığı məlumatları şərh edir.*

***3.2.1.*** *Texnikada və istehsalatda istifadə olunan istilik hadisələrinə və alternativ enerji mənbələrinə əsaslanan qurğuların iş prinsipini izah edir.*

***Təlim nəticələri:***

- *Elektrik işlədicilərinin dövrəyə ardıcıl birləşdirmə qanunauyğunluqlarını şərh edir.*
- *Ardıcıl birləşməyə aid sadə təcrübələr icra edir.*
- *Məişətdə və praktikada elektrik işlədicilərinin ardıcıl biləşdirilməsinin istifadəsini və üstünlüklərini öyrənir.*

***Dərsin məqsədləri:*** Kompüterdən istifadə etməklə elektrik dövrəsində naqillərin ardıcıl birləşdirilməsini eksperimental yolla öyrədilməsi.

- Şagirdlərdə elektrik dövrəsi qura bilmək bacarığını formalaşdırmaq və inkişaf etdirmək.
- Onlara ölçü cihazlarından istifadə edə bilmək vərdişlərini aşılamaq.
- Şagirdlərdə elektrik işlədicilərinin ardıcıl birləşdirilməsi vərdişini formalaşdırmaq
- Bu birləşmədə dövrənin ümumi cərəyan şiddəti, ümumi gərginlik və ümumi müqavimətinin təyin edilməsi vərdişini formalaşdırmaq.
- Kompüterdən istifadə etməklə praktik bacarıqları inkişaf etdirmək və formalaşdırmaq.

***Dərsin tipi:*** İnduktiv

***İstifadə olunan iş formaları:*** Bütün siniflə iş, qrup işi, fərdi iş.

***İstifadə olunan iş üsulları:*** Beyin həmləsi, müşahidə, araşdırma, nəticə çıxarmaq, modelləşdirmə, danışıb anlatmaq, dinləyib anlama, nümayiş, tədqiqat aparmaq, tətbiq etmək, təqdimat, tapşırıqvermə.

***Təchizat:*** İş vərəqləri, kompüter, proektor, interaktiv lövhə (mimio və ya "Promethean"), ampermetr (4 əd.), voltmetr (4 əd.), elektrik açarı (4 əd.), lampa (4 əd.), rezistor (4 əd.), cərəyan mənbəyi (4 əd.), birləşdirici naqillər (28 əd).

***Fənlərarası inteqrasiya:*** *İnf:* *2.2.3.* Verilmiş məsələnin proqramını tərtib edir. *2.2.4.* Tərtib edilmiş proqramın kompüterdə nümayişini icra edir. *3.2.1.* Qrafiki redaktorda müəyyən çətinlik dərəcəsinə malik şəkillər hazırlayır. *3.3.2.* İnternetin əsas xidməti proqramları ilə işləyir.

*Riy:* *1.2.5.* Nisbət və tənasübün xassələrini , faizin düsturlarını müxtəlif məsələlərin həllinə tətbiq edir.

*Ədəb:* *2.2.1.* Müzakirələrdə dialoji nitq bacarığını nümayiş etdirir.

*Tex:* *2.2.2.* Avtomatik cihaz və qurğuları dövrəyə qoşur, onlara xidmət edir.

***Dərsin vəzifəsi:*** **1.Təhsilverici:**

- Elektrik dövrəsində naqillərin birləşməsinin mümkün variantlarını təsvir etmək.
- Naqillərin ardıcıl birləşməsini kəmiyyət və keyfiyyətcə xarakterizə etmək.
- Əldə edilmiş bilik və bacarıqların tətbiq sahəsini müəyyənləşdirmək və kompüterdən istifadə etməklə praktikada necə tətbiq etməyi öyrənmək.
- Müstəqil nəticələr əldə etmək bacarığını və problemləri həll edə bilmək qabiliyyətini formalalaşdırmaq.

**2. İnkişafedici:** Məntiqi düşüncə, yaradıcılıq qabiliyyətini və praktik bacarıqlarını inkişaf etdirir.

**3. Tərbiyəedici:** Şagirdlərdə öz güclərinə əminlik yaratmaq üçün şərait yaradır. Şəxsi keyfiyyətələri (dəqiq
lik, əzm, fəallıq) inkişaf etdirir. Qruplarda işləyərəkən ünsiyyət mədəniyyətinin inkişafına şərait yaradır.

***Dərsin gedişi:*** ***Sinfin təşkili:*** **- 2 dəq**.

Müəllim sinfə daxil olub salamlaşdıqdan sonra davamiyyəti yoxlayıb, dərsdə iştirak etməyən şagirdləri qeyd edir, sinfi nəzərdən keçirir və vermiş olduğu ev tapşırığını yoxlayır. Sual-cavab əsasında yeni dərsin motivasiyasına giriş edir.

**1. Motivasiyanın yaradılması və problemin qoyulması**-5 dəq. Problemli vəziyyət yaratmaq üçün kompüterin köməyi ilə suallar ekranda görünür və şagirdlər suallara cavab verməyə çalışırlar.

1. Elektrik dövrəsi nədir?
2. Elektrik dövrəsi hansı elementlərdən ibarətdir?
3. Voltmetr dövrəyə necə qoşulur?
4. Ampermetr dövrəyə necə qoşulur?
5. Ardıcıl birləşmə nəyə deyilir?
6. Paralel birləşmə nəyə deyilir?

***Tədqiqat sualı: "Naqillərin ardıcıl birləşməsindən hansı hallarda istifadə edilir? Naqillərin ardıcıl birləşməsində cərəyan şiddəti, gərginlik və müqavimət necə olar?"*** Bu suallar ətrafında tədqiqat aparmaq üçün şagirdlərə aşağıdakı suallar verilir.

M-Uşaqlar, naqillərin ardıcıl birləşməsinin qanunauyğunluqlarını araşdırmaq üçün hansı cihazlardan istifadə edərik?

M-Bu cihazlar dövrəyə necə birləşdirilər?

M-Ardıcıl birləşdirilmiş naqillərdən ibarət dövrənin prinsipial sxemi necə olar?

Şagirdləri dinlədikdən sonra ekrana bu qanunauyğunluğu nümayiş etdirmək üçün istifadə edilən cihazlar və ardıcıl birləşdirilmiş dövrə üzərində işin yerinə yetirilməsi modeli gəlir. Şagirdlər işin yerinə yetirilməsi ilə tanış edilirlər.

Cədvəl 1

| ***Naqillərin ardıcıl birləşdirilməsinin qanunauygunluqlarını nümayiş etdirmək üçün aşagıdakı cihazlardan istifadə edilir.*** | | |
|---|---|---|
| **Cihazın adı** | **Cihazın sayı** | **Cihazın modeli** |
| 1. Ampermetr | 4 ədəd |  |
| 2. Voltmetr | 4 ədəd |  |
| 3. Cərəyan mənbəyi | 4 ədəd |  |
| 4. Elektrik açarı | 4 ədəd |  |

Cədvəl 2

| Cihazln adı | Cihazln sayı | Cihazın modeli |
|---|---|---|
| 5. Reostat | 4 ədəd |  |
| 6. Rezistor | 4 ədəd |  |
| 7. Lampa | 4 ədəd |  |
| 8. Birləşdirici naqillər | 32 ədəd |  |

**Araşdırma:** *İşin gedişi:* Ardıcıl birləşdirilmiş dövrə üzərində işin yerinə yetirilməsi (şəkil 1, şəkil 1 (a)) və dövrənin prinsipial sxemi (şəkil 2, şəkil 3) aşağıdakı kimidir. Verilən sxemə uyğun elektrik dövrəsi yığın.

Şəklil 1-ə əsasən kompüterdən istifadə edib, "Crocodile Physics" proqramı ilə mimio və ya promethan lövhədə təcrübəni aşağıdakı kimi nümayiş edirəm. Şəkildə təsvir edilən elektrik dövrəsi modelini açılmış səhifədə proqramın bizə verdiyi imkanlarından istifadə edərək qururam və işin necə yerinə yetirilməsi haqqında məlumatlar verirəm (şəkil 1(a)). Tədqiqatın aparılmasını şagirdlərin öz öhdəlikərinə buraxıram.



2. ***Şəkil 1.***



***Şəkil 1 (a).*** *Crocodile Physics proqramında ardıcıl birləşdirilmiş dövrə üzərində işin yerinə yetirilməsi modeli.*



**Tədqiqatın aparılması - 10 dəq.**

Şagirdlər 2 böyük qruplara bölünür. Sonra hər qrup ayrı-ayrılıqda 2 kiçik qruplara bölünür. (Cərəyan qrupu 1, Cərəyan qrupu 2, Gərginlik qrupu 1, Gərginlik qrupu 2). Şagirdləri belə qruplara ayırmaq ilə eyni işin hər bir şagirdin görməsinə və vaxtın səmərəli istifadəsinə nail olmaq olar. Bu mərhələ əyləncəli xarakter daşısın deyə hər qrupun şagirdləri qrup adlarını və araşdırma üçün verilən tapşırıqları kompüterdə qrup nömrələrini seçdikdən sonra görə bilirlər.




İş vərəqləri paylanılır və iş vərəqlərində tədqiqatın aparılması üçün suallar qeyd olunur. Hər qrupun şagirdləri tədqiqat sualı əsasında axtarış aparır, düşünür, verilmiş tapşırıqları icra edir və iş vərəqlərində müvafiq qeydlər aparırlar. Dərsin bu mərhələsində müəllim fasiltator rolunu oynayır və şagirdlərin çətinlik çəkdikləri problemlərin həlində kömək edir.

**1. "Cərəyan 1, Cərəyan 2" qrupu.** 1. Ardıcıl birləşdirilmiş dövrənin bir işlədicisində cərəyan kəsilərsə, digərində nə baş verər? 2. Dövrənin naqillərindən keçən cərəyan şiddətinin qiymətlərini ayrı-ayrılıqda ölçün.

Araşdırma üçün verilmiş suallardan dərhal sonra kompüterdən istifadə edərək interaktiv lövhədə açılmış səhifədə şagirdlərə işin gedişi haqqında məlumatlar verilir və şagirdlər lazım olan təchizatlarla (cərəyan mənbəyi (2 əd.), ampermetr (2 əd.), reostad (2 əd.), lampa (4 əd.), birləşdirici naqillər (12 əd.)) təmin edilirlər.

**İşın gedişi:** *1. Şəkil 1-də təsvir edilən elektrik dövrəsini qurun, sxemini çəkin.*

- *Açarı qapayın, lampaların işıqlanmasına diqqət edin və ampermetrin göstərişini qeyd edin.*

• *Açarı açın, dövrədəki lampalardan birini açıb çıxarın, naqilləri bir-biri ilə birləşdirmədən açarı yenidən qapayın və ampermetrin göstərişinə diqqət edin. Baş verən hadisəni izləyin.*

• *Nəticəni müzakirə edin. Cavabı əsaslandırın. Nə üçün dövrədən cərəyan keçməz?*

*2. Reostadın sürgüsünü sabit saxlamaqla dövrənin hər bir naqilindən keçən cərəyan şiddətinin qiymətini ölçün. Sürgünün yerini dəyişməklə bu təcrübənu iki dəfə aparın. Qiymətləri cədvələ qeyd edin və nəticəni müqayisə edin.*

**2.**




*Şəkil 2. Ardıcıl birləşdirilmiş naqillərdə cərəyan şiddətinin ölçülməsi.*

| |
|---|
| $J_1=$ |
| $J_2=$ |
| $J_3=$ |

| |
|---|
| $J'_1=$ |
| $J'_2=$ |
| $J'_3=$ |

**"Gərginlik 1, Gərginlik 2" qrupu.** 1. Ardıcıl birləşdirilmiş naqillərin uclarındakı gərginliklərin qiymətlərini ölçün. 2. Dövrə hissəsində Om qanunundan istifadə edib müqaviməti təyin edin.

Araşdırma aparmaq üçün şagirdlər lazım olan təchizatlarla (cərəyan mənbəyi (2 əd.), ampermetr (2 əd.), voltmetr (2 əd), reostad (2 əd.), rezistor (4 əd.), birləşdirici naqillər (16 əd.) təmin edilirlər və şagirdlərə interaktiv lövhədə açılmış səhifədə işin gedişi haqqında məlumatlar verilir.

**İşin gedişi:** *1. Sxemə əsasən elektrik dövrəsini qurun (şəkil 3). 2. Reastatın sürgüsünü sabit saxlamaqla elektrik dövrəsinin ümumi gərginliyini (U) və dövrə hissəsində hər bir naqilin uclarındakı gərginlikləri ölçün ($U_1$, $U_2$), cədvələ yazın, təhlil edib naticə çıxarın. 3. Naqillərin ardıcıl birləşməsi üçün aldığınız ümumi gərginliyin tənliyində Om qanunundan istifadə edib müqavimətləri təyin edin. Qiymətləri verilmiş cədvələ yazın. ( $R_1$, $R_2$, $R$ ).*




*Şəkil 3. Ardıcıl birləşdirilmiş naqillərdə gərginliyin ölçülməsi.*

| |
|---|
| $U=$ |
| $U_1=$ |
| $U_2=$ |

$R_2$

| |
|---|
| $R=$ |
| $R_1=$ |
| $R_2=$ |

**3. Məlumat mübadiləsi – 5 dəq.** Qrup üzvləri öz aralarında informasiya mübadiləsi aparır. Hər qrupdan bir nəfər lövhəyə çıxıb iş vərəqlərini lövhədən asırlar. Sonra növbə ilə gəldikləri nəticəni təqdim edirlər və tapşırığı necə yerinə yetirdikləri barədə məlumat verirlər. Beləliklə bir qrup digərindən məlumat almış olur, səhvlər varsa, düzəldilir.

**4. Məlumatın müzakirəsi - 5 dəq.** Alınan bütün təqdimatlar ümumiləşdirilir, yekunlaşdırılır. Qrup işləri bir-biri ilə əlaqələndirilir, nəticə lövhədə yazılır. Müəllim yönəldici, köməkçi suallardan istifadə etməklə əldə edilmiş biliklərin məqsədyönlü müzakirəsinə və onların təşkilinə kömək edir.

**M. Ardıcıl birləşmə nəyə deyilir?**

*Ş. Birinci naqilin sonu ikinci naqilin başlanlanğıcı, ikinci naqilin sonu üçüncü naqilin başlanğıcı ilə birləşərsə, belə birləşməyə ardıcıl birləşmə deyilir.*

**M. Ardıcıl birləşmədə dövrənin müxtəlif hissələrində cərəyan şiddəti necə olur?**

*Ş. Ardıcıl birləşmədə dövrənin istənilən hissəsində cərəyan şıddətinin qiyməti eynidir.*

**M. Ardıcıl birləşmədə ümumi gərginlik necə olur?**

*Ş. Ardıcıl birləşmə zamanı dövrədəki tam gərginlik bu dövrənin ayrı-ayrı hissələrindəki gərginlikləri cəminə bərabərdir.*

**M. Ardıcıl birləşmədə tam müqavimət necə olur?**

*Ş. Ardıcıl birləşmədə dövrənin ümumi müqaviməti, onun ayrı-ayrı hissəsindəki müqavimətləri cəminə bərabərdir.*

***5. Nəticə və ümumiləşdirmə*** **- 5 dəq.** İnteraktiv lövhədə təcrübədən alınan nəticə şagirdlərə səsli şəkildə təqdim edilir.

***Apardığımız təcrübə nəticəsində alındı:***

***1. Birinci naqilin sonu ikinci naqilin başlanlanğıcı, ikinci naqilin sonu üçüncü naqilin başlanğıcı ilə birləşərsə, belə birləşməyə ardıcıl birləşmə deyilir.*** Ardıcıl birləşdirilmiş işlədicilər bir ardıcıl xətt üzrə birləşır. Elektrik cərəyanı bir işlədicidən digərinə ardıcıllıqla keçir ( şəkil 4).




**Şəkil 4. Naqillərin ardıcıl birləşdirilməsi.**

**2. Ardıcıl birləşmənin çatışmazlıqları.**

- ✓ Əgər bir işlədicinin fəaliyyəti dayanarsa, digər işlədicinin də fəaliiyəti dayanmış olar. Bu ona görə baş verir ki, cərəyanın dövrədə axını dayanar. (Şəkil b).
- ✓ Dövrəyə işlədicilər artırılarsa, cərəyan bir o qədər zəifləmiş olar. Belə halda lampaların közərməsi zəifləyər.

**3. Ardıcıl birləşmənin üstünlükləri. Ardıcıl birləşmədən nə zaman istifadə edə bilərik?**

- ✓ Cihazları ümumi şəkildə cərəyandan ayırmaq və ya birləşdirmək lazım gəldikdə
- ✓ Bütün cihazlarda eyni cərəyan şiddəitinin olmasına ehtiyac olduqda.

**4. Ardıcıl birləşmənin qanunauyğunluqları.**

**1)** Ardıcıl birləşmədə dövrənin istənilən hissəsində cərəyan şıddətinin qiyməti eynidir.

$I = I_1 = I_2$

**2)** Ardıcıl birləşmə zamanı dövrədəki tam gərginlik bu dövrənin ayrı-ayrı hissələrindəki gərginlikləri cəminə bərabərdir.

$U = U_1 + U_2$

**3)** Ardıcıl birləşmə zamanı dövrədəki tam müqavimət bu dövrənin ayrı-ayrı hissələrindəki müqavimətləri cəminə bərabərdir.

$R = R_1 + R_2$

Dövrə hissəsi R müqavimətli n sayda naqildən ibarətdirsə, dövrənin ümumi müqaviməti

$R_{üm} = n R$ olar.




Şəkil 5. Cərəyan şiddətinin sabit qiymətində gərginliyin müqavimətdən asılılıq qrafiqi.

**4)** Om qanununa görə ardıcıl birləşmədə müqavimət artdıqda gərginlik də artar və ya əksinə. Ardıcıl birləşmədə gərginlik müqavimətlə düz mütənasib asılıdır (şəkil 5).

$$\frac{U_2}{U_1} = \frac{R_2}{R_1}$$

**6. Yaradıcı tətbiq etmə - 6 dəq.** Aşağıdakl tapşırıqlar əsasında şagirdlər öyrəndiklərini praktik şəkildə tətbiq edirlər.

**7. Qiymətləndirmə. - 5 dəq**. İş vərəqlərini təhlil etməklə meyarlar əsasında qiymətləndirilir.

**Ev tapşırığı- 2 dəq.** Tapşırıq vərəqdə şagirdlərə paylanılır.










## Nəticə

Beləliklə, biz aldıq ki, "Crocodile Physics" virtual laboratoriya proqramından istifadə etməklə "Naqillərin ardıcıl birləşdirilməsi" mövzusunu şagirdlər daha asan mənimsəyir, onlarda elektrik dövrə hissəsi qurmaq bacarıqları formalaşır və şagirdlər cihazların modelləri ilə tanış olmuş olurlar. Dərsin "Tədqiqat işi" mərhələsindən əvvəl naqillərin ardıcıl birləşdirilməsinin elektron təcrübədə tətbiqi şagirdlərə prosesi əyani həyata keçirməkdə kömək edir. Bundan əlavə şagird ardıcıl birləşdirilmiş dövrə hissəsinin prinsipial sxemində lampa, ampermetr və voltmetrin Duistdə qəbul edilmiş ölçüləri dəqiqləşdirir, məişətdə "Naqillərin ardıcıl birləşdirilməsi" nin üstünlükləri və çatışmazlıqlarını təcrübədən öyrənirlər. Şagird öyrəndiklərini yaradıcı tətbiq etməklə özündə sərbəst praktik bacarıqlar formalaşdırır. Nəticədə alırlar ki, 1) Ardıcıl birləşmədə dövrənin istənilən hissəsində cərəyan şiddətinin qiyməti eynidir $I=I_1=I_2$. 2) Dövrədəki tam gərginlik bu dövrənin ayrı-ayrı hissələrindəki gərginlikləri cəminə bərabərdir $U= U_1+ U_2$. 3) Ardıcıl birləşmə zamanı dövrədəki tam müqavimət bu dövrənin ayrı-ayrı hissələrindəki müqavimətləri cəminə bərabərdir $R= R_1+ R_2$.

**Ədəbiyyat**

1. Alışov M. "Təhsildə İKT-dən düzğün istifadə etmək və bu bacarıqların təkmilləşdirilməsi olduqca əhəmiyyətli məsələdir". https://aztehsil.com, 2018
2. Alışov M. "Kompüter texnikasının köməyi ilə şagirdlərin idrak fəaliyyətinin fəallaşdırılması (X-XI siniflərdə riyaziyyat və fizika fənlərinin tədrisi nümunəsində) "Bakı-2001. Səh. 176.
3. Murguzov M, Abdurazaqov R, Əliyev R, Əliyeva D. Fizika- 8. Dərslik. Bakı. "Bakınəşr", 2015. Səh. 199.

**Rəçyi: prof. Ş.Əlizadə**

Göndərilib: 23.12.2020 Qəbul edilib: 24.12.2020

DOI: 10.36719/2663-4619/61/106-108

**Məhəmməd Hüseynov**
Azərbaycan Dövlət Pedaqoji Universiteti Ağcabədi filialı

# AĞDAMIN TARİXİNƏ VƏ BU GÜNÜNƏ DAİR

***Açar sözlər:*** *Ağdam, Pənahəli Xan, Qarabağ xanlığı, Üçoğlan təpə, Qarqar çayı, tarixi abidələr, Xudu Məmmədov, "Qarabağ bülbülləri"*

## On the past and today of Aghdam

**Summary**

According to some sources, the word Aghdam means "small fortress" in ancient Turkish. Archaeological excavations carried out by the famous archeologist Ideal Narimanov in Uchoglan Tepe, Aghdam, show that the first people lived in the region 6-8 thousand years ago and were engaged in agriculture and cattle breeding. There were many architectural and artistic monuments with ancient history in the territory of Aghdam region. Aghdam was also rich with its museums and galleries. Ensembles "Shur", "Karabakh Nightingales" operated in Aghdam Mugam Center. Many prominent scientists grew up in Aghdam. Academicians Khudu Mammadov, Adila Namazova, Ziyaddin Goyushov, professors Rafig Aliyev, Zakir Mammadov, Salman Garayev, Rashid Goyushov, Zabil Bayramov, Habil Gurbanov, and others have achieved great success in various fields of science.

***Key words:*** *Aghdam, Panahali Khan, Karabakh khanate, Uchoglan hill, Gargar river, historical monuments, Khudu Mammadov, "Karabakh nightingales"*

Bəzi mənbələrə görə Ağdam sözü qədim türk dilində "kiçik qala" deməkdir. Məşhur arxeloq İdeal Nərimanovun Ağdamın Üçoğlan təpə adlı yerdə apardığı arxeloji tədqiqatlar zamanı məlum olur ki, ilk insanlar rayon ərazisində 6-8 min il bundan əvvəl yaşamış, əkinçilik və maldarlıqla məşğul olmuşlar. Ağdam rayonunun ərazisində qədim tarixə malik olan çoxlu memarlıq və incəsənət abidələri vardı. Ağdam öz muzey və qalereyaları ilə də zəngin idi. Şəhərdə "Şur", "Qarabağ bülbülləri" ansamblları Ağdam Muğam Mərkəzi fəaliyyət göstərirdi. Ağdamda çox görkəmli elm xadimləri yetişmişdir. Akademiklər Xudu Məmmədov, Adilə Namazova, Ziyəddin Göyüşov, professorlardan Rafiq Əliyev, Zakir Məmmədov, Salman Qarayev, Rəşid Göyüşov, Zabil Bayramov, Habil Qurbanov və başqaları müxtəlif elm sahələrində böyük uğurlar qazanmışlar.

Ağdam adının mənşəyi haqqında müxtəlif fikirlər mövcuddur. Bəzi mənbələrə görə Ağdam sözü qədim türk dilində "kiçik qala" deməkdir. Bu versiyaya görə burada yaşayan türk dilli qəbilələr özlərini müdafiə etmək üçün kiçik qalalar inşa etmişdir. XVIII əsrin I yarısında Qarabağ xanlığının banisi Pənahəli Xan şəhərdə özü üçün "ağ daşdan" imarət tikdirmişdir. Bu mənada "Ağdam" işıqlı, ağ ev deməkdir.

Ağdam rayonu Azərbaycanın qədim, füsunkar təbiətli torpağı olan Qarabağın mərkəzində, Qarabağ dağ silsiləsinin şimal-şərq ətəklərində, Kür - Araz ovalığının qərbində yerləşir. Ağdamın qədim tarixi abidələri min illərdən keçərək bu günə qədər qəlib çatmışdır. XX əsrin 50-ci illərindən başlayaraq rayon ərazisində aparılan arxeloji tədqiqatlardan məlum olmuşdur ki, rayonun ərazisi qədim insanların yaşayış məskənlərindən biridir. Məşhur arxeloq İdeal Nərimanovun Ağdamın Üçoğlan təpə adlı yerdə apardığı arxeloji tədqiqatlar zamanı məlum olur ki, ilk insanlar rayon ərazisində 6-8 min il bundan əvvəl yaşamış, əkinçilik və maldarlıqla məşğul olmuşlar.

XX əsrin 80-ci illərin ortalarında rayonun Sarıçoban kəndi yaxınlığında tapılan son Tunc və Dəmir dövründə aid (e.ə. XIX-XIII əsrləri əhatə edir) möhtəşəm kurqan tarixilik baxımından çox qiymətlidir. Kurqanda aşkar edilən məişət və zinyət əşyaları bu abidənin varlı bir insanın qəbri olduğundan xəbər verir. Bu isə həmin dövrdə Azərbaycanda ibtidai-icma quruluşunun dağılması və sosial bərabərsizliyin yaranmasına ən yaxşı süburdur.

Sonralar Azərbaycanda qedən tarixi proseslər nəticəsində ilk dövlət qurumları formalaşır. Belə dövlət qurumlarından biri Albanya quldar dövləti idi. Antik yunan mənbələrinə görə qədim Albanya ərazisində 26 sayda ittifaq var idi ki, bunlardan biri yüksək mədəniyyətə malik olan qarqarlar Ağdam ərazisindəki Qarqar çayı boyunca məskunlaşmışdılar. Bu isə Ağdamın Azərbaycan ərazisində formalşan dövlət quruculuğunda mühüm rol oynadığını bir daha sübut edir.

Ağdamın dəniz səviyyəsindən yüksəkliyi 410 metr, maksimum yüksəklik 1365 metrdir. İqlimi əsasən mülayım isti, quraq subtropikdir. Ən çox yığıntı dağətəyi sahələrə düşür. Rayon ərazisinin 1700 hektarlı

meşəlik, 91.3 min hektarı isə kənd təsərrüfatına yararlı torpaqlardan ibarətdir. Rayonun iqtisadiyyatında pambıqçılıq, üzümçülük və heyvandarlıq mühüm yer tuturdu.

İşğala qədər olan dövrdə Ağdamda yeyinti, yüngül və ağır sənaye sahələri də inkişaf etmişdir. Ağdamda gəzgah avadanlıqları, aerokosmik və rabitə cihazları,traktor və avromobil təmiri, asfalt, konserv, yağ-pendir, barama toxumu, pambıq, şərab və mexanikləşdirilmiş çörək zavodları, xalça fabriki, taxıl məhsulları, tikinti materialları və ət kombinatları fəaliyyət göstərirdi. 1860-cı ildə Ağdamda çaxır zavodu tikilmişdir ki, bu da respublikamızda tikilən ilk çaxır zavodlarındandır. 1948-ci ildən "Ağdam" portveyn tipli şərab istehsalına başlanmşdır ki, bu da keçmiş SSRİ-də çox məshur idi. 1949-cu ildə Ağdam rayonunun Eyvazxanbəyli kəndində atçılıq zavodu yaradılıb. Burada bəslənən cins Qarabağ atları bütün dünyada məşhur idi. Çox sevindirici haldır ki, bu gün həmin atçılıq zavodu öz fəaliyyəti Ağcabədi rayonunuda davam etdirir.

Ağdam şəhəri olduqca gözəl, yaraşıqlı və füsunkar idi. Şəhərdə möhtəşəm yaşayış binaları, ticarət obyektləri və istirahət məkanları var idi. Ağdam rayonunun ərazisində qədim tarixə malik olan çoxlu memarlıq və incəsənət abidələri vardı. Ağdam şəhərində Uzərlik Təpə abidəsi, rayonun Xaçındərbənd kəndindəki Qutlu Sarı Musa oğlu günbəzi (1314-cü il), Kəngərli kəndindəki türbə və daş abidələr (XIV əsr), Papravənd kəndindəki türbələr, Cümə məscidi (XVIII əsr), Xanoğlu türbəsi (XVII əsr), Qarabağ xanı Pənahəli xanın Ağdam şəhərindəki imarəti (XVIII əsr), Xan qızı Natəvanın və onun oğlunun türbəsi (XIX əsr), Şahbulaq qalası və s. kimi tarixi və mimarlıq abidələri var.

Ağdam öz muzey və qalereyaları ilə də zəngin idi. Ağdam tarix-diyarşunaslıq muzeyi, Qurban Pirimovun xatirə, Rahib Məmmədov adına Döyüş Şöhrəti Muzeyi, dünyada ikinci hesab edilən Ağdam Çörək Muzeyi öz ziyarətçilərinin sayına görə şöhrət qazanmışdır. Həmin muzeydə çörəyin istehsalı üçün lazım olan hər cür alət və avadanlıqlar toplanmışdır. Bu muzey hər bir tamaşaçıya müqəddəs torpağa, vətən və çörəyə bağlılığı, mədəniyyət ənənəsinə rəğbəti əks etdirirdi. Muzeydə uzaq əsrlərdən qalmış, daş yaddaşlara çevrilmiş alətlər çoxluq təşkil edirdi. Təəssüf ki, bu muzey erməni hərbçilərinin Ağdamı işğalı zamanı dağıldıldı.

1986-cı ildə akademik Xudu Məmmədovun ideyası ilə şəhərdə üç mərtəbəli məşhur Çay evi inşa edilmiş, istifadəyə verildyi ilk gündən ağdamlıların və şəhərin qonaqlarının istirahət məkanına çevrilmişdir. Bu orijinal memarlıq nümunə də erməni vandalları tərəfindən yerlə-yeksan edilmişdir.

Ağdam musiqi sahəsində də böyük uğurlara imza atılmışdır. Şəhərdə "Şur", "Qarabağ bülbülləri" ansamblları Ağdam Muğam Mərkəzi fəaliyyət göstərirdi. Ə.Haqverdiyev adına Ağdam Dövlət Dram Teatrı nəinki rayonda, habelə bütün respublikada şöhrət qazanmışdır. Ötən əsrin 70-80-ci illərində teatrın səhnəsində bir çox yerli və xarici müəlliflərin əsərləri uğurla tamaşaya qoyulmuşdur. Qarabağ müharibəsindən əvvəl şəhərdə 7 orta məktəb, 1 səkkizillik məktəb, 3 texnikum və 2 texniki peşə məktəb fəaliyyət göstərirdi. Ağdam şəhərində 8 xəstəxana əhalinin sağlamlığı keşiyində dayanmışdı.

Ağdam şəhərindəki stadion, müxtəlif idman qurğuları ağdamlıların müntəzəm olaraq idmanla məşğul olmaları üçün əlverişli şərait yaratmışdır. Hal-hazırda Ağdamı Azərbaycan Premyer Liqasında "Qarabağ" futbol klubu təmsil edir. 2017-ci ildə "Qarabağ" futbol klubu Azərbaycan fudbolu tarixində ilk dəfə Çempionlar Liqasının qrup mərhələsində vəsiqə qazanmışdı.

Ağdamda çox görkəmli elm xadimləri yetişmişdir. Akademiklər Xudu Məmmədov, Adilə Namazova, Ziyəddin Göyüşov, professorlardan Rafiq Əliyev, Zakir Məmmədov, Salman Qarayev, Rəşid Göyüşov, Zabil Bayramov, Habil Qurbanov və başqaları müxtəlif elm sahələrində böyük uğurlar qazanmışlar. Ağdamın mədəniyyət və incəsənət xadimləri xalqımızın qəlbində özünə məxsus yer tutmuşdur: Müğənnilər Arif Babayev, Qədir Rüstəmov, Mənsim İbrahimov, Səxavət Məmmədov, Nəzakət Teymurova, tərzən Ramiz Quliyev, gitaracı Rəmiş, kamançaçı Elman Bədəlov musiqi sənətində öz dəst-xəttini yaratmışdır. Bədii yaradıcılıq və publisistik, sahəsində də həmyerlilərimiz böyük uğurlar əldə etmişlər. Şahmar Əkbərzadə, Əlfi Qasımov, Famil Mehdi, Ziyəddin Sultanov və başqaları öz dəyərli əsərləri ilə xalqımızın ən oxunacaqlı müəlliflərinə çevrilmişlər.

1988-ci ilin fevralından başlayaraq mənfur qonşularımız olan ermənilər Azərbaycana qarşı ərazi iddiaları irəli sürmüş, Dağlıq Qarabağın Ermənistana birləşdirilməsi barədə, separatçı tələblərlə nümayişlərə başlamışdılar. Ağdam rayonu Dağlıq Qarabağla qonşu olduğundan hadisələrinin ilk günlərindən ən böyük ağırlıqlar Ağdam rayonunun, onun əhalisinin üzərinə düşmüşdür. 1988-ci ilin son aylarında Ermənistandan, daha sonra Dağlıq Qarabağ Muxtar Vilayətindən silah gücünə amansız vəhşiliklərlə qovulub, didərgin Salınan on minlərlə azərbaycanlı məhz Ağdam rayonuna pənah gətirdi.

1992-ci ildə Dağlıq Qarabağı bütünlüklə işğal edən Ermənistan bununla kifayətlənməyərək, Dağlıq Qarabağın ətraf rayonlarına da hücum etdi. Xüsusən Ağdama olan hücumların ardı-arası kəsilmirdi. Ağdama edilən son hücumda 6 min nəfər erməni əsgəri iştirak edirdi. Onların arasında çoxlu sayda xaricdən gətirilmiş ermənilər və muzdlu əsgərlər var idi. Həmin dövrdə Azərbaycan ordusunda vahid komondanlığı olmaması ucbatından Ağdamı müdafiəsi etibarlı təşkil edilə bilmirdi. Nəticədə 1993-cü il iyulun 23-də Ağdam şəhəri

bitterness, ridicule, and skepticism. Broken hopes cannot be saved even by the fire saved by Dickensian, the fire of the hearth. However, this consequence of the collapse of "great hopes" is of interest to Dickens - the artist and moralist is no longer social, but moral and ethical.

In his most recent adult novels, Dickens has a philosophical and psychological understanding of the problem of old art - the face and mask that hides it. In the first works of the writer we find many images-masks / u200b / u200b. This can be partly explained by the writer's love for the theater, and partly by his static-fantastic character. For example, the image of Quilp is a mask of evil. In the early works of the writer, the mask / u200b / u200b "for better or for worse - did not hide anything." But he is already hiding under a real face mask in Little Dorrit. These are the distinctive features of the face and mask / u200b / u200bhe character in Dickens' novel. The masked game and the real face of the protagonist are based on Charles Dickens' latest novel, Our Common Friend.

Dickens' latest novel, The Secret of Edwin Drude, remains unfinished. Today, it remains a mystery to readers, critics and literary critics. It has something very mysterious, ridiculous and even paradoxical. "Later, Dickens's novels were not only more serious and colorful, but also better constructed than the previous novels, written at a higher level of mastery" (3, 375), writes a modern English researcher who examines the author's writings.

Dickens opens a new stage in the history of English realism. This is before the achievements of the 18th century and half a century of realism of Western European romance. Like Balzac, Dickens combined the essence of both styles in his work. Dickens calls his favorite writers Cervantes, Lesage, Fielding and Smollet. However, it is typical to add "Arabian fairy tales" to this list.

To some extent, in the first period of his work, Dickens repeats the stages of development of English realism in the early 18th and 19th centuries. The origins of this realism are Moral Weekly by Style and Addison. A great novel is a spiritual description while waiting. The conquest of reality in eighteenth-century literature occurs primarily in genres approaching journalism. This is where the accumulation of vital material takes place, and new social types are built that will be used by a real social novel for a long time as a kind of starting point.

The realist novel of the 18th century comes from everyday literature. The attempt to generalize and systematize the materials of reality is especially characteristic of the ideology of the third realm, which seeks to realize and regulate the world by the power of thought.

The creators of a real nineteenth-century novel, Dickens being one of the first, begin by destroying the tradition they inherited. Dickens, who bears a striking resemblance to the heroes of Fielding or Smollett, is an important reformer in this type of novel. Dickens is living in a period of unregulated internal contradictions in bourgeois society. Therefore, following the moral and utopian design of the eighteenth-century novel, Dickens is replaced by a more organic plot that follows the contradictions, gaining a deeper understanding of the essence of bourgeois reality. In the first period of his work, the plot of Dickens's novels also has a family character. But in fact, this plot often goes into the background and takes the form of bringing the story together, because it always solves social problems that are more general and more directly expressed from within. to the narrow framework of the "family genre." The reality of Dickens's novel is enriched with new themes and new materials. The novel's horizon is clearly expanding.

The new era taught Dickens to see the world in contradictions, and in the insolubility of its contradictions. Contradictions of reality gradually become the basis of the plot and the main problem of Dickens' novels. This is especially evident in later novels, where the "family" plot and the "happy ending" make room for the primitive role of the large-scale social reality scene.

Dickens has a profoundly negative effect on bourgeois reality. Deep knowledge of the inner space between the world you want and the world you live in is Dickens' addiction to contradictions and a romantic mood swing - from harmless humor to sentimental pathos, from pathos to mockery, from mockery to true description again.

In the later stages of Dickensian creativity, these seemingly romantic features often disappear or acquire a different, darker character. However, the concept of "another world", which is not so beautifully decorated, but clearly contradicts the practice of bourgeois society, remains here.

But this utopia is only a secondary point for Dickens, and does not require a full-blooded depiction of real life with all its catastrophic injustices. However, as one of the best realist writers of his time, Dickens, whose interests went deeper than the outside of events, was not content with a simple expression of casual, "casual," and the injustice of modern life and a dark ideal. The internal laws of this chaos inevitably approached the question of the social laws that still govern it. Only such writers deserve the name of real nineteenth-century realists who mastered the material of new life with the courage of real artists.

Dickens's realism and "romanticism", the elegant, humorous and satirical current in his work, are directly related to this forward movement of his creative thinking. If Dickens's first works are still "inseparable" by including these components ("Nicholas Nickleby", "Antique of Shop"), then in his later development Dickens comes up with some synthesis, in which the previously separate sides are subjected to a single theme, the task "is a complete reflection of the basic laws of modern life" ("Cold House", "Little Dorrit").

## The result

Dickens is a writer whose works we can judge from, and very precisely, the public life of England in the mid-19th century. It is not only about the official life and history of England, not only about the parliamentary struggle and the labor movement, but also about the seemingly small details that are not included in the "big history". We will not dwell on Dickens's novels, the state of railways and water transport in his day, the nature of exchange operations in London, prisons, hospitals and theaters, markets and entertainment venues, all kinds of restaurants, taverns and old hotels.

“Dickens's works, like all the great realists of his generation, are like an encyclopedia of his time: different classes, characters, ages; the lives of the rich and the poor; a doctor, a lawyer, an actor, a representative of the aristocracy and a person without a certain profession, a poor seamstress and sociologist, a producer and a worker - this is the world of Dickens' novels” (4, 6).

## Literature

1. M.Y.Yelizarova, S.P.Qajdeu, B.İ.Kolesnikov, N.P.Mixalskaya “XIX əsr xarici ədəbiyyat tarixi” (tərcümə: İsmayıl Şıxlı), Azərbaycan Dövlət Tədris-Pedaqoji Ədəbiyyatı nəşriyyatı, Bakı-1964, 654 səh.(səh.7-528-ci səh.)
2. Ə.Xəlilov, “Dünya ədəbiyyatı” III cild, Ali məktəblər üçün dərslik, (XIX əsr Dünya ədəbiyyatı), Bakı, “Bilik”, 2014, 552 səh.
3. Dikkens Ç. Oliver Tvistin macəraları : roman. (tərc. ed. Ə.Ağayev). Bakı, Çaşıoğlu, 2005. - 456 s.
4. Dikkens Ç., Devid Kopperfild. Ön söz. uşaql. üç. işl. İ.B.Umudlu; red. İ.İlyaslı; rəs. E.Cabbarov. -Bakı: Altun Kitab, 2014. -128 s.

**Rəyçi: dos. F.Məmmədova**

Göndərilib: 16.12.2020 Qəbul edilib: 17.12.2020

DOI: 10.36719/2663-4619/61/121-124

**İlahə Ağakişi qızı Balakişiyeva**
Xəzər Universiteti

# MÜƏLLİMİN TƏHSİLDƏ ROLU: ƏNƏNƏVİ VƏ MÜASİR MÜSTƏVİDƏ

***Açar sözlər:*** *müəllimin rolu, ənənəvi müstəvidə müəllim, müasir müstəvidə müəllim*

## The role of the teacher in education: traditional and modern

**Summary**

The teacher prepares the learning process in such a way that, if possible, all students participate in it, and they manage the process themselves. Involving all students in the teaching process, arousing their interest in the lesson, building the lesson in accordance with their wishes and desires increases the teacher's sense of responsibility and he becomes an observer of the learning process. In traditional training, the requirements were not very wide, as the teacher gave more theoretical knowledge and the students listened. However, in active learning, the teacher must have a broader knowledge, use different resources, develop their competencies, and constantly learn. Only on the basis of such activity can a teacher guide students correctly. The teacher must learn different theories, approaches, methods in order to use them correctly in the learning process. Thus, we see that in traditional learning and active learning, the tasks, functions, and work of the teacher differ from each other. The requirements for the teaching profession are changing and updated in accordance with the requirements of each period. Therefore, the teacher must constantly improve himself.
***Key words:*** *the role of the teacher, the teacher at the traditional level, the teacher at the modern level*

Sürətlə modernləşən respublikamızda təhsilin insan kapitalının inkişafı çağırışlarına cavab verməsi üçün yeni, daha səmərəli və təsirli addımların atılmasına ehtiyac yarandı. Həmin ehtiyacların ödənilməsi, ölkədə insan kapitalının davamlı inkişafı üçün şəraitin yaradılması, mövcud infrastrukturun təkmilləşdirilməsi, müasir düşüncəyə, yeni təhsil-tərbiyə texnologiyasına, əxlaqi-mənəvi saflığa, yüksək peşə və ixtisas hazırlığına malik pedaqoji kadr hazırlığının təkmilləşdirilməsi dövrün tələbinə çevrilmişdir. Akademik bacarığı, tədris təcrübəsi və peşəkarlıq səviyyəsi ilə fərqlənən keyfiyyətli müəllim kadrlarının hazırlanması müəllim peşəsinin nüfuzunun yüksəldilməsini tələb edir.

Bu tip peşə sahibinə aşağıdakı cəhətlər xasdır: 1) tərbiyə etmək, idarə etmək, rəhbərlik etmək, öyrətmək bacarığı; 2) başqasını dinləyə bilmək bacarığı; 3) geniş təfəkkür, ətraflı anlayış; 4) nitq və kommunikativ mədəniyyət; 5) ağlın ürəyi istiqamətləndirməsi, insanın xarakterini, davranışını, bacarığını görə bilmək, onun daxili aləmini modelləşdirməklə yanaşı, xüsusi, yaxud digərinin təcrübəsindən məlum olanı məcburən onun adına yazmamaq; 6) insana layihələndirici yanaşma bacarığı; 7) digərlərinin halına acıma bacarığı; 8) müşahidə etmək; 9) xalqına xidmət ideyalarının düzgünlüyünə dərin inam; 10) qeyri-standart vəziyyətlərin həlli; 11) özününizamlamanın yüksək səviyyəsic[4, s.28].

Müəllim peşəsinin seçiminin əksi üçün isə ünsiyyətcil olmamaq, insana yardım hissinin formalaşmaması, qeyri-standart anlarda vəziyyətə hakim ola bilməmə, dar dünyagörüşü, özünəqapalılıq və s. kimi keyfiyyətlər misal gətirilə bilər.

Müəllim peşəsinin funksiyaları bunlardır: diaqnostlaşdırma, proqnozlaşdırma, layihələşdirici, informasiyavermə, təşkiletmə, qiymətləndirmə, nəzarətetmə və korreksiya, analitik. Müəllimin yerinə yetirdiyi funksiyaların çoxluğu onun əməyinə bir çox ixtisasların komponentlərini daxil edir.

Müəllim şəxsiyyətinin başqa zəruri cəhətləri də vardır. Bu cəhətlər arasında ən əsas olan müəllimin mənəvi keyfiyyətləridir. Diqqətlilik, qayğıkeşlik, təvazökarlıq, vicdanlılıq, obyektivlik kimi cəhətlər müəllimdə birləşməlidir. Müəllim yalnız bu keyfiyyətləri sevgiylə şagirdə təqdim etdikdə onlarda qarşılıqlı əməkdaşlıq hisləri formalaşır.

**Müəllimin rolu ənənəvi müstəvidə.** Ənənəvi təlim metodunda (buna ənənəvi təlim də deyilir) müəllim əsas sima olub yalnız şagirdlərə diktə edir, öyrədir. Müəllim komandirdir, yeganə təşəbbüskar şəxsdir, hakimdir (“daim haqlıdır”). Buna ənənəvi təlim prosesi deyilir ki, uzun illər belə təlim prosesi mövcud olmuş və bu gün də yeniliyə can ataraq yaşamaqdadır. Ənənəvi təlimdə müəllim hər zaman fəaldır, şagirdlər isə passiv mövqedədir. Müəllim dərsi izah edir, şagirdlər isə dinləyir. Ona görə də onların arasında əks əlaqə prosesi yoxdur. Şagird həmin prosesdə sadəcə bir obyektdir. Müəllim ancaq sual-cavab prosesində, və ya yazılı nümunələrdə şagirdlərləünsiyyət qurur. Müəllim dərsin məqsədini özü seçir, şagirdlərin şəxsi maraqlarının nəzərə almır. Belə əks-əlaqə olmadan, şagirdlərin marağı nəzərə alınmadan həyata keçirilən metodlar gözlənilən nəticəni vermir. Ancaq biz ənənəvi təlim prosesinə sadəcə mənfi mövqedən yanaşa

bilmərik, onun müsbət cəhətləri də mövcuddur. Bu təlim növündə şagirdlərə mütəmadi olaraq, nəzəri biliklər ötürülür. Şagirdlərin ensiklopedik bilikləri genişlənir və daha çox məlumatlanırlar.Belə təlim prosesi təhsilalanları inkişaf etdirir. Lakin biz bunu inkişafetdirici təlim adlandıra bilmərik. Şagirdin bu növ fəaliyyəti produktiv deyil, reproduktivdir.

Reproduktiv təlim prosesi odur ki, şagird sadəcə yazır, hazır bilikləri qəbul edir, yadda saxlayır, əzbərləyir, tətbiq edir. Bu təlimin əsas məqsədi şagirddə bilik, bacarıq, vərdiş formalaşdıraraq diqqət və yaddaş inkişaf etdirilsin.

Reproduktiv təlimin müsbət xüsusiyyətlərini görən müəllimlər düşünürlər ki, bu metod hər zaman yaşayacaq. Lakin bəzən elə hallar olur ki, təcrübəli müəllimlər şagirdlərin belə passiv fəaliyyətində də dərsin məqsədini və mahiyyətini açıqlayaraq öz fənnini mükəmməl şəkildə tədris edib, onları inkişaf etdirməyi bacarırlar.

Təlimdə ənənəvi metodların aşağıdakı səciyyəvi cəhətləri vardır:

1. Bir qayda olaraq ənənəvi dərslərdə əsas diqqət şagirdlərdə bacarıqların formalaşmasına deyil, biliklərin mexaniki mənimsənilməsinə yönəldilir.

2. Ənənəvi təlimdə hazır informasiyanın çatdırılması ilə onun mənimsənilməsi üçün şərait yaradılması müəllimin başlıca funksiyasını təşkil edir.

3. Müəllimin şagirdlə rəftarında avtoritar, avtokratik iş üsulu, üslubu qabarıq şəkildə təzahür edir. Ənənəvi təlimdə hər bir dərs hazırlığın yoxlanması, yeni materialın izahı və dərsin möhkəmləndirilməsi mərhələləri ilə səciyyələnir [2, s. 633].

Ənənəvi təlimdə dərs prosesi müəllimlərin vacib hesab etdiyi mövzular üzərinə qurulur. Bu zaman isə şagirdlər dərs müddətində passiv mövqedə olur. Dərslərin belə tipdə keçirilməsi şagirdlərin dərsə marağını azaldır. Fənlər yalnız öz predmetlərinə uyğun olaraq tədris olunur. Buna görə də fənlər arası inteqrasiya demək olar ki, həyata keçirilmir. Bu prosesə interpassiv proses deyilir.

Ənənəvi təhsildə təlim prosesi fəaliyyət kimi müstəqiliiyin və yaxud məktəblinin tədris əməyinin zəif motivasiyası ilə xarakterizə olunur. Şagirdin təlim fəaliyyətinin tərkibində aşağıdakılar mövcuddur:

- Müstəqil məqsədə yönəlmənin yoxluğu, təlimin əsas məqsədini müəllim müəyyən edir;
- Fəaliyyətin planlaşdırılması kənardan aparılır, şagirdin arzusunun əksinə olaraq bu və ya digər şey ona məcburən yeridilir;
- Uşaq fəaliyyətinin nəticəsi və qiymətləndirilməsi onlar tərəfindən yox, müəllim yaxud digər yaşlılar tərəfindən aparılır [4, s.130]

Bununla yanaşı, ənənəvi təlimin bəzi imkanları da var. Belə ki, ənənəvi təlimdə müəllim daima şagirdlərə yeni bilikləri izah edir, məlumat verir, şərh edir. Şagirddən isə bu bilikləri əzbərləməyi və yadda saxlamağı tələb edir. Şagirdlər də öz növbəsində hazır bilikləri yadda saxlamaq üçün onu dəfələrlə təkrarlayırlar və çalışırlar ki, məsələlərin həllinə tətbiq etsinlər. Burada öyrədici fəaliyyət müəllimin fəallığı əsasında keçirilir. Təlimin bu xarakterinə görə isə onu reproduktiv (təkraredici) və ya izahedici-illustrativ adlandırırlar.

Tədris prosesi zamanı öyrədilən biliklər real həyata da tətbiq oluna bilməlidir. Ənənəvi təlimdə isə ən vacib şərt şagirdin biliyi tətbiq edə bilməsi yox, bilikləri yadda saxlamasıdır. Buna görə də dərsdə öyrədilən məlumatlar ensiklopedik – nəzəri səciyyə daşıyır və real həyatın tələbatlarına uyğunlaşmır. Şagirdin fərdi xüsusiyyətləri, maraqları, bacarıqları, arzu və istəkləri nəzərə alınmır.

Bu tədris prosesinin nəticəsində şagirdlərin bilikləri hansı səviyyədə mənimsədiyini aşkara çıxarmaq olmur. Heç kim əmin ola bilməz ki, bütün şagirdlər bu bilikləri lazımi səviyyədə dərk edəcək.

Şagirdlərin bilikləri hazır şəkildə öyrənməsi yaradıcılıq qabiliyyətlərinə, təfəkkür, təxəyyülün inkişafına mane olur, idrak prosesini kütləşdirir. Şagirdlərdə tədqiqatçılıq, kəşfetmə kimi xüsusiyyətlər öz əksini tapmır. Onları biliyi hazır şəkildə mənimsəməyə alışdıqlarından təcrübə qazana bilmirlər.

Müəllim dərs materialını sözlə izah etdiyinə görə şagirdlər sadəcə bir müddət diqqətlərini cəmləyə bilirlər, daha sonra isə diqqətləri yayınır. Araşdırmalar göstərir ki, məktəb yaşlı uşaqların diqqətinin mərkəzləşməsi ortalama 10-15dəq müddət davam edə bilir. Nəzərə alsaq ki, dərs müddəti 45 dəqiqədir, şagirdin bu müddət ərzində diqqətini cəmləməsi mümkün deyildir.

Ənənəvi təlimdə biliklər yadda saxlamağa yönəldiyi üçün şagirdlərin yaddaşı həddən artıq yüklənir. Yaxşı yaddaşa malik şagirdlər məlumatı daha yaxşı yadda saxlasalar da, bu onların gələcək fəaliyyətində köməkçi rolu oynaya bilmir. Çünki gələcək peşə fəaliyyətində əzbərçilik və dəqiq yaddaş deyil, biliklərin tətbiqi əhəmiyyət daşıyır. Beləliklə, ənənəvi təlim metodunda təlim prosesinin tələbləri ilə real peşə fəaliyyətinin tələbləri arasında boşluq müşayiət olunur.

Deməli, ənənəvi təlim zamanı şagirdlərin dərketmə fəallığı passiv, reproduktiv xarakter daşıyır. Belə dərsdə yalnız informasiyaların toplanmasına və yaddaşın məşq etdirilməsinə yönəlmiş, həyatın real

tələbatlarından kənar olan təhsil şəraitində müasir dövrün şəxsiyyətinin, hərtərəfli inkişaf etmiş insanın formalaşdırılması çətindir. Belə dərslərdə şablonçuluq, formalizm, əzbərçilik geniş yayılmış olur.

**Müəllimin rolu müasir müstəvidə.** Ölkəmiz müstəqillik qazandıqdan sonra bütün sahələr, eləcə də təhsil qarşısında mühüm vəzifələr qoyulmuşdur. Təhsil sisteminin dəyişilməsi və yeniləşməsi məsələsi irəli sürülmüş, təhsilin ABŞ, Avropanın qabaqcıl ölkələrinin təhsil məkanına inteqrasiyası ön plana çəkilmişdir. Ulu öndər Heydər Əliyev demişdir: "İndi təhsil sistemində islahatların əsas məqsədi ondan ibarətdir ki, Azərbaycan təhsil sistemi dünya təhsil sisteminin standartlarına uyğunlaşsın".

"Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nda təhsil sisteminin dövlət təhsil standartlarına cavab verən inkişaf istiqamətləri və müasir tələblərə uyğun hədəfləri müəyyənləşdirilmiş, təhsil işçiləri qarşısında yeni məsul vəzifələr qoyulmuşdur. Ölkəmizin təhsil sistemi dünyanın ən qabaqcıl ölkələrinin təhsil prinsiplərindən istifadə etməklə təkmilləşdirilir, məzmun və struktur dəyişiklikləri aparılır, təhsilin bütün pillələri üzrə kurikulumların hazırlanması məsələlərinə baxılır.

Təhsilin bütün pillələrində yeni informasiya texnologiyalarının tətbiqi ilə müasir tələblərə uyğun təlimin nəticələrinin yaxşılaşdırılması probleminin həlli üçün müəllim şagirdin bilik səviyyəsinə görə yeni təlim metodlarından istifadə etməlidir.

Yeni metodların işlənib hazırlanması təlimin yeniləşməsini tələb edir, hansı ki, bu yeniləşmə şagirdin idrak səviyyəsinin dəyişilməsinə və təfəkkürünün inkişafına səbəb olur. Yeni pedaqoji yanaşmalar olmadığından bu nəzəriyyənin elementlərinin orta məktəbdə təlimi ənənəvi öyrənmə metodikasının yeniləşməsini tələb edirdi, yəni törəmə və inteqral anlayışlarının təlimindəki nəticələrin yaxşılaşdırılması üçün yeni təlim metodlarının meydana gəlməsi tələb olunurdu.

Hazırda respublikamızda ali məktəblər sistemli dəyişiklər ərəfəsindədir: bu ali təhsil müəssislərinin məzunlarının yüksək peşəkarlıq səviyyəsini, onlarda universal bilik, bacarıq və vərdişlər sisteminin tam formalaşmasını, həmçinin müstəqil təcrübə fəaliyyəti və şəxsi məsuliyyət tələb edir.

N.Gəncəvi əsərlərində özünü dərk edənləri “əbədi yaşayanlar”, dərk etməyənləri isə “bir qapıdan girib, o biri qapıdan çıxanlar” hesab edir. Alim şəxsiyyətin ictimai bacarıqlara, məntiqi və tənqidi təfəkkürə, problem həll etmək kimi yüksək idraki bacarıqlara malik olmasını vacib hesab edir və əsərində Fitnənin simasında göstərir ki, “insan məşq və vərdişlə möcüzələr yaradar, mühüm bacarıqlara malik ola bilər”.

Ə.Marağayiyə görə, “əgər insan müəyyən biliklərə malikdir və onları tətbiq etmirsə, deməli, həmin insan ya “tətbiqi ağıldan” məhrumdur, ya da onun tətbiqi ağlı “kamil” deyil. İnsanın savadının yeganə sübutu onun praktik fəaliyyəti, davranış və hərəkətləridir. Tətbiqi elmsiz ümumi elm bəhərsizdir, ölüdür, faydasızdır”. Bu və digər alimlərimizin fikirləri bu gün təlim prosesinə olan yeni yanaşmalarla üst-üstə düşür.

Fəal təlim metodunda ənəvi təlimdə sadaladığımız nöqsanlar, mənfi cəhətlər ardan qaldırılmağa, təhsil sahəsindəki boşluqlar doldurulmağa çalışılır. Bu metodda müəllim və şagird arasında qarşılıqlı əks-əlaqə, əməkdaşlıq, ünsiyyət mövcuddur. Artıq şagirdlər passiv olaraq dərsi yalnızca dinləmirlər. Onlar dərsin fəal iştirakçılarıdır. Ənənəvi təlim metodunda müəllim fəal, şagird passiv idisə, fəal təlim metodund bunun əksinə olaraq, şagird daha fəal, müəllim isə passivdir. Şagird və müəllim birlikdə dərs prosesinin yaradıcısı, qurucusu hesab olunurlar.

Ənənəvi təlimdə dərs avtoritar, avtokrat üsulla aparılsa da, fəal dərs tipi demokratik, əməkdaşlıq prinsipləri üzərinə qurulub. Burada sadəcə müəllim şagirdə deyil, həmçinin, şagird də öz növbəsində müəllimə təsir göstərir. Müəllim sadəcə olaraq dərs öyrətmir, o həm də öyrənir. Fəal təlimdə qarşılıqlı dialoq, əməkdaşlıq hökm sürür.

Fəal təlimin prinsiplərini aşağıdakı kimi qruplaşdırmaq olar:

1. Şəxsiyyətə yönəlmiş təlim prinsipi
2. Fəal idraki prinsip
3. İnkişafetdirici təlim prinsipi
4. “Qabaqlayıcı təlim” prinsipi
5. Təlim-tərbiyənin çevikliyi prinsipi
6. Əməkdaşlıq prinsipi
7. Dioloji təlim prinsipi [2, s.635].

Fəal təlim metodu şagirdləri fəallaşdırmağa istiqamətlənmişdir. Müəllim şagirdlərə hazır biliklər verilmir, onlar bilikləri özləri əldə etməyə çalışır, tədqiqat aparırlar. Müəllim və şagird arasında ünsiyyət, münasibət daha da artır.

Fəal təlimdə müəllimin əsas vəzifəsi şagirdlərə köməkçi olmaqdan, onları yaradıcılığa, axtarışa sövq etməkdən, öyrəndiklərini həyatla əlaqələndirməkdən, öyrənməyi öyrətməkdən ibarətdir.

Fəal təlim bir çox təlim məqsədinə nail olmaq üçün güclü vasitədir. Didaktik aspektdən idrak fəaliyyətinin fəallaşdırılması, dünyagörüşünün artırılması, bilik, bacarıq, anlayıçların təcrübədə tətbiqi,

ünsiyyətcillik, əməkdaşlıq kimi keyfiyyətlərin yaranmasında əvəzsiz rola malikdir. Bu zaman şagirdlər cəmiyyətə hazırlıqlı olur, peşə keyfiyyətlərinə yiyələnir, daha dərindən düşünə bilir, mühakimə aparmağı bacarır, özünü daha yaxşı ifadə edir, multikulturallıq, tolerantlıq kimi dəyərlərə yiyələnirlər.

Fəal təlim zamanı müəllimin əsas məqsədi şagirdə dərsi dərindən öyrətmək, onda dərsə qarşı həvəs oyatmaqdır. Şagirdlər bilikləri öyrənməyə həvəsli olmalıdır. Onlar dərsə maraqla yanaşmalı, öyrənilən biliklərin əhəmiyyətini dərk etməlidir. Ona görə də təlim prosesində şagirdlərin maraqları, arzu və istəkləri nəzərə alınmalıdır. Müəllim təlim prosesini əməkdaşlıq şəraitində aparmalıdır. Çalışmalıdır ki, şagirddə fənnə qarşı maraq oyatsın. Yalnız bu halda şagird təlimdə fəal olacaqdır.

Ənənəvi təlimdən fərqli olaraq, fəal təlimdə müəllim şagirdlərə hazır bilikləri ötürmür, şagirdlər bilikləri kəşf etməyə çalışır. Hələ vaxtı ilə Sokrat peşəkar pedaqoqları "fikrin mamaçaları" adlandırmışdır. Savadlı müəllim şagirdə hazır bilikləri verməməli, onun başında fikrin meydana gəlməsinə, yaranmasına kömək göstərməlidir[3, s.39].

Müəllim fəal təlim texnologiyası ilə təşkil olunan ilk növbədə şagirdlərdə motivasiya yaradır. O, problemi elə qoyur ki, şagirdlər onun əhəmiyyətini anlasınlar və nə üçün öyrəndiklərini bilsinlər. Daha sonra müəllim tədqiqat sualı verir. Bu sual şagirdlərə tədqiqat aparmağa istiqamət verir. Daha sonra həmin problemi araşdırmaq üçün işi təşkil edir. Bu həm fərdi, həm də qruplarla iş ola bilər. Bu zaman tədqiqat aparılır. Müəllim şagirdlərə birbaşa müdaxilə etmir, onların sərbəst araşdırmalarına şərait yaradır. Lakin lazım olduqda şagirdləri tədqiqat üzrə istiqamətləndirir. Şagirdlər tədqiqat zamanı işçi vərəqlərə qeydlər edirlər. Tədqiqat tamamlandıqdan sonra isə təqdimat mərhələsi başlayır. Onlar apardığı tədqiqatı və öz tədqiqatlarının yekununu digər şagirdlərə və müəllimə təqdim edirlər. Bütün tədqiqatlar səsləndirildikdən sonra müəllimin istiqaməti ilə onlar arasında əlaqə yaradılır. Səslənən fikirlər ümumiləşdirilir, sistemə salınır. Müəllim sonra şagirdlərə müxtəlif tapşırıqlar verməli və onlarda müstəqil və yaradıcı tətbiqetmə bacarıqlarının formalaşmasına və inkişafına xüsusi diqqət yetirməlidir. Müəllim təlim prosesində işgüzar iş mühiti, əməkdaşlıq şəraiti yaratdığından şagirdlərin yüksək fəallığı təmin olunur.

## Nəticə

Müəllim təlim prosesini elə hazırlayır ki, bu prosesə imkan daxilində bütün şagirdlər qatılsın, onlar özləri prosesi idarə etsinlər. Bütün şagirdləri dərs prosesinə cəlb etmək, onlarda dərsə maraq oyatmaq, dərsi onların arzu və istəklərinə uyğun qurmaq müəllimin məsuliyyət hissini artırır və o təlim prosesinin müşahidəçisinə çevrilir. Ənənəvi təlimdə müəllim daha çox nəzəri bilik verdiyi və şagirdlər dinlədiyi üçün ona verilən tələblər də çox geniş deyildi. Lakin fəal təlimdə müəllim daha geniş biliklərə malik olmalı, müxtəlif resurslardan, mənbələrdən yararlanmalı, kompetensiyalarını inkişaf etdirməli, daim öyrənməlidir. Yalnız belə fəaliyyət əsasında müəllim şagirdləri düzgün istiqamətləndirə bilər. Müəllim müxtəlif nəzəriyyələri, yanaşmaları, metodları öyrənməlidir ki, təlim prosesində onlardan doğru şəkildə istifadə edə bilsin. Beləliklə, görürük ki, ənənəvi təlim və fəal təlimdə müəllimin vəzifələri, funksiyaları, gördükləri işlər bir-birindən fərqlənir. Hər dövrün tələbinə uyğun olaraq müəllim peşəsinə verilən tələblər də dəyişir, yenilənir. Ona görə də müəllim daima özünü inkişaf etdirməlidir.

## Ədəbiyyat

1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. Azərbaycan Respublikası Nazirlər Kabineti sərəncamı, 2013.
2. İbrahimov F., Hüseynzadə R. Pedaqogika. Bakı: Mütərcim, 2012.
3. Paşayev Ə.X., Rüstəmov F.Ə.Pedaqogika. Bakı: Çaşıoğlu, 2002.
4. Zeynalova N.E., Əhmədov H.H. Pedaqogika. Bakı, Elm və təhsil, 2016.

**Rəyçi: f.f.d. K.Abbaslı**

Göndərilib: 19.12.2020 Qəbul edilib: 20.12.2020

DOI: 10.36719/2663-4619/61/125-128

**Fərəh Ağasəlim qızı Abdullayeva**
Xəzər Universiteti

# AZƏRBAYCANIN MAARİF FƏDAİLƏRİ

***Açar sözlər:*** *yeni əlifba komitəsinin üzvlərindən biri, Azərbaycan orfoqrafiyasının yaradıcısı, pedaqoji təhsil sisteminin əsasını qoyan, dünya şöhrətli azərbaycanlı akademik, repressiya qurbanları*

## Dedicated himself to education the intelligence of Azerbaijan

**Summary**

13 October 1937 entered in the fate of our people with the execution of our intellectuals, who devoted their lives to the development of science, literature, culture, ideas of independence, but whose desires, aspirations were stained with blood. The people of Azerbaijan have lost bright faces, outstanding teachers and world-famous scientists who make up the intellectual wealth of the nation. Among them were Haji Karim Sanili (1878-1937); Bekir Behbud oglu Chobanzade (1893-1937); Hanafi Baba oglu Zeynalli (1896-1937). Presentation of repressed Azerbaijani educators to the world should be the main task of young researchers - teachers, as well as journalists. For this reason, it is recommended that this article be made available to the general public.

***Key words:*** *one of the members of the new alphabet committee, the creator of the Azerbaijani spelling, the founder of the pedagogical education system, the world-famous Azerbaijani academician, the victims of repression*

Azərbaycan pedoqoji fikir tarixində görkəmli yer tutan əsl xalq ziyalısı, pedaqoq, metodist, istedadlı müəllim, xalqın azadlığı və səadəti uğrunda yorulmadan mübarizə aparan simalardan biri Hacı Kərim Sanılı olmuşdur. Milli dəyərlərimizin şagirdlərə kiçik yaşlarından başlayaraq öyrədilməsini əsas götürən Hacı Kərim Sanılı barəsində bu fikri cəsarətlə demək olar ki, onun yaratdığı pedaqoji sistemin əsasını əmək və əməyə məhəbbət tərbiyəsi təşkil edir. Əslində, onun ədris etdiyi fənn və dərsliklər müasir dövrümüzdə "Həyat Bilgisi" kimi tanınan fənnin tədrisi olub desək heç də yanılmarıq. Rəsmxətt və rəsm fənlərini də gözəl bilən Sanılı şifahi xalq ədəbiyyatımızdan götürdüyü şer, kiçik hekayə nümunələrini gözəl illüstrasiyalar şəklində şagirdlərə çatdırmaqla, onların zehni inkişafına, təxəllüyünün formalaşmasına həmişə önəm vermişdir.

1937 və 1938-ci ildə tutulanlar üçün hökm Dövlət başında oturan, heç bir ali təhsili olmayan "Üçlük"dən: Stalin, Beriya və Yejov tərəfindən həyata keçrilərək 12493 nömrəli istintaq işi üzrə mühakimə edilən ziyalıların yer üzündən silinməsi idi. Əhalinin hər min nəfərinə düşən repressiya qurbanlarının sayına görə Azərbaycan keçmiş Sovet respublikaları arasında xüsusilə fərqlənərək ilk yerlərdə qərarlaşmışdı.

Xalqın əqli potensialının fiziki cəhətdən aradan götürülməsi üçün bu ziyalıları yaşayış mühitindən ayırmaq və təcrid etmək zəruri idi. Istintaq ondan ötrü aparılırdı ki, güllələnməmişdən və öldürülməmişdən qabaq əvvəlcədən nəzərdə tutulmuş lazımi ifadələr zorla, əziyyət verməklə, rezin dəyənəklərlə döyülməklə alınsın. Əks halda respublikamızın bütün görkəmli ziyalılarını, alimlərini, genefondunu aradan götürmək planı həyata keçməyəcəkdi.

Alimləri bir-biri ilə üz-üzə qoyurdular, bir adamın belə tab gətirməyəcəyi təkmilləşdirilmiş cəza üsullarından istifadə edilirdi. Müstəntiqlərin əksəriyyətinin nə tutarlı faktları nə də savadları var idi. Tutulan ziyalılarımız xalq düşməni, əksinqilabçı, pantürkist və millətçi kimi ifşa edilərək məhv edilmək üçün nəzərdə tutulmuşdular.

1937-ci ildə Azərbaycan xalqı millətin intellektual sərvətini təşkil edən parlaq simalardan, bütöv bir nəsildən məhrum oldu. Millətimizin on illərlə formalaşmış genofondu məhv oldu. Nəsillər arasında olan mənəvi bağlar qırıldı. Azərbaycan cəmiyyətinin ən istedadlı, elmlı, əməksevər, mütərəqqi təbəqəsi vəhşicəsinə, xüsusi qəddarlıqla məhv edildi.

Xalqımızın taleyinə 1937-ci ilin oktyabrın 13-ü ömrünü elmin, ədəbiyyatın, mədəniyyətin inkişafına, istiqlal ideyalaına həsr etmiş, amma, istək, arzu, məsləkləri qana bələnmiş ziyalılarımızın güllələnmə aktı ilə daxil olub. Arxivlərdə saxlanılan qalın-qalın "Delo"lardan aydın olur ki haqqında ən çox material toplanılan ziyalılar Bəkir Çobanzadə və Hənəfi Zeynallı olmuşdur.Mən isə, məqaləni maarif fədailərindən biri olan Hacı Sanılı haqqında yazı ilə başlamaq istəyirəm.

Azərbaycan pedoqoji fikir tarixində görkəmli yer tutan əsl xalq ziyalısı, pedaqoq, metodist, istedadlı müəllim, xalqın azadlığı və səadəti uğrunda yorulmadan mübarizə aparan simalardan biri Hacı Kərim Sanılı

olmuşdur. O, 1878-ci ildə Qazax qəzasının Çaylı Kəsəmənli kəndində anadan olmuşdur. Yoxsulluğu və vəsaitinin olmamasından 1893-cü ildə dövlət hesabına Qori müəllimlər seminariyasında oxuyur. 1898-1902-ci illər Xaçmaz məktəbində rus dilindən dərs deyərək, həm də müdir vəzifəsində çalışır. Yelizavetpol xalq məktəbləri direktorunun icazəsi ilə yeni açılmış məscid məktəbinə təyin olunsa da, gənc nəslə şəriət dərslərinə dair zəruri biliklər vermək iqtidarında olmadığını yaxşı bilir. Və həmin məktəbin ikisinifli rus-tatar məktəbinə çevrilməsi üçün ardıcıl mübarizə aparır. O, hətta azərbaycanlı qızların qız məktəbinə getməsi üçün ciddi əməli fəaliyyət göstərir. Yerli əhali üçün 1905-ci ildə birsinifli ibtidai məktəblərdə tədris planı hazırlayan komissiyada da yaxından iştirak edir. Sanılının səyi nəticəsində Dağ Kəsəmənli məktəbində müsəlman qızları da rus dili öyrənməyə başlamışdılar. 1910-cu ildə o, Sankt-Peterburqa ezam olunaraq Müəllimlər İnstitutu nəzdində təşkil edilən əl əməyi kursunu bitirir və bu fəndən uzun müddət dərs deyir. Onun molla adı olmadığı üçün ana dili və şəriətdən dərs deməyə icazə vermirlər. 1917-ci ilin Böyük Oktyabr Sosialist İnqilabı baş verəndən sonar Tiflisdən Bakıya gələn Sanılı 1918-1922-ci illərdə Qazax qəzasının hakimi vəzifəsində çalışır. 1921-ci ildə Maarif Komissarlığında yaradılan Elmi Şurada ümumtəhsil məktəbləri üçün tədris planı, proqramlar, dərsliklər yaratmaq məsələləri ilə məşğul olur. 1922-ci ilin mart ayında görkəmli dövlət xadimi və inqilabçı Səmədağa Ağamalıoğlunun rəhbərliyi ilə yaradılan Yeni Əlifba Komitəsinin ən işgüzar fəallarından biri də Hacı Kərim Sanılı olmuşdur. O, hər bir dərslik üçün metodik tələblərə uyğun əsərlər yazır, "Böyüklər üçün Əlifba" kitabı, "Türk Əlifbası", üçüncü il adlı dərslikər tərtib etmişdir. Hörmətli pedaqoq mətnlərin başa düşülməsi və dərindən mənimsənilməsi, tərbiyəvi cəhətdən təsirli olması üçün dərsliklərə daxil etdiyi əsərlərin seçilməsində bacarıqlı bir pedaqoq kimi uşaqların yaş xüsusiyətlərini də nəzərə alırdı.

Milli dəyərlərimizin şagirdlərə kiçik yaşlarından başlayaraq öyrədilməsini əsas götürən Hacı Kərim Sanılı barəsində bu fikri cəsarətlə demək olar ki, onun yaratdığı pedaqoji sistemin əsasını əmək və əməyə məhəbbət tərbiyəsi təşkil edir. Əslində, onun ədris etdiyi fənn və dərsliklər müasir dövrümüzdə "Həyat Bilgisi" kimi tanınan fənnin tədrisi olub desək heç də yanılmarıq. Rəsmxətt və rəsm fənlərini də gözəl bilən Sanılı şifahi xalq ədəbiyyatımızdan götürdüyü şer, kiçik hekayə nümunələrini gözəl illüstrasiyalar şəklində şagirdlərə çatdırmaqla, onların zehni inkişafına, təxəllüyünün formalaşmasına həmişə önəm vermişdir. O, "Difai", "Müdafiə" partiya özvlərindən biri olduğundan, polis idarələri tərəfindən təqib olunurdu. Odur ki, bu səbəbdən də iş yerini tez-tez dəyişirdi.

Hacı Kərim Sanılı ömrünün 40 ilindən çoxunu məktəb və mədəniyyət ocaqlarının genişləməsinə, yeni əsaslarla təlim-tərbiyə işlərinin qurulmasında hazırladığı proqramların tərtibinə, məktəb yaşlı uşaqların, yaşlı əhalinin məktəblərə cəlb edilməsinə, Yeni Əlifbanın tədrisi üçün dərsliklərin tərtibində Azərbaycan orfoqrafiyasının yaradılmasına sərf etmişdir. O, da 1937-ci ilin qurbanlarından birinə çevrilmişdir. Onun pedaqoji fəaliyyəti layiqincə öyrənilməmiş, ömür səhifəsinin yarımçıq qalmış işləri bağlı seyflərdə qalmış, uşaq psixologiyasının bütün incəliklərini özündə əks etdirən çoxlu şer nümunələri isə tədqiqatdan kənarda qalmışdır.

İki görkəmli maarif fədaisinin həyat səhifəsinə nəzər salmamışdan əvvəl Abbasquluağa ağa Bakıxanovun bu dəyərli kəlamları ilə mövzuya keçid etmək mümkün olardı, "tarix elə danışmayan natiqdir ki, xələflərin bütün vəsiyyətlərini bütün təfsilat və təriflərilə xələflərə bildirir, ehtiyac və rifah səbəblərini tərəqqi və tənəzzül yollarını anladır".

İlk günahsız repressiya qurbanları altı nəfər: Böyükağa Talıblı, Bəkir Çobanzadə, Vəli Xuluflu, Hənəfi Zeynallı, Əhməd Cavad, Məmmədkazım Ələkbərli olmuşdur. Müstəntiq dünya şöhrətli alim olan Bəkir Çobanzadəni tutarlı faktı olmadığından, türklərlə əlaqədə olduğu üstündə ittiham etmişdi.

Bəkir Vahab oğlu Çobanzadə 1893-cü ilin mayın 15-də Krım şəhəri Qarasubazarda anadan olmuşdur. 1908-ci ildə ibtidai gimnaziyanı bitirdikdən sonra müsəlman xeyriyyə cəmiyyəti tərəfindən 1914-cü ildə İstambulda liseyin ədəbiyyat şöbəsində, sonra universitetində ərəb və fransız dilləri üzrə kursları bitirmişdir. Ardınca o, Büdapeşt Universitetinin tarix-filologiya fakültəsinə daxil olmuş 1918-ci ilə qədər orada təhsil almışdır.

1920-ci ildə məhşur akademik İqnats Qoldsiyerin elmi rəhbərliyi ilə doktorluq dissertasiyasını müdafiə etdikdən sonra Tavriya Universitetinin dəvəti ilə Krıma qayıtmış və dilşilik kafedrasının dosenti təyin edilmişdir. 1922-ci ildə professor adını alan Bəkir iki ildən sonra Krım Universitetinin rektoru olmuşdur. Elə həmin ildə Azərbaycan Dövlət Universitetinin dəvəti ilə o, Bakıya gəlmiş, həm Şərq fakültəsinin dekanı, həm də türk dili və ədəbiyyatı kafedrasının professoru seçilmişdir. 1925-1933-cü illərdə Azərbaycan Terminologiya Komitəsinin humanitar bölməsinin sədr müavini, sədri və rəhbəri olmuşdur. 1932-ci ildən SSRİ EA-nın Azərbaycan filialında dil bölməsinin baş elmi mütəxəssisi, Azərbaycan Elmi-Tədqiqat Pedaqogika və Psixologiya İnstitutunun həqiqi üzvü olmuşdur. 1930-1934-cü illərdə Fərqanə Ali Pedaqoji

İnstitutunda özbək dili və ədəbiyyatı kafedrasının professoru işləmiş, 1935-ci ildə Paris Dilçilik Cəmiyyətinin üzvü seçilmişdir.

Bəkir Çobanzadə bütün türk illərini, alman, macar, fransız, ərəb, fars, rus dilini bilirdi. O, 150-dən çox kitab və məqalələrin müəllifi idi.Yüzlərlə dilçi və ədəbiyyatşünas mütəxəssizi hazırlayan, öz ixtisası üzrə Sovet Şərqinin ilk professoru olan Bəkir Vahab oğlu Vahabzadə 1924-cü ildə Bakıda yaşadığı dövrdə əksinqilabi fəaliyyətinə görə 1937-ci ilin yanvarın 26-da həbs edilmiş, həmin ilin oktyabrın 12-də güllələnməyə məkum edilmişdir.Onun həyat yoldaşı Ruqiyyə xanım Gireyevnanın üç il qabaq müraciətindən sonra və 1957-ci ilin iyunun 6-da SSRİ Ali Məhkəməsi Hərbi Kollegiyasının qərarı ilə iş xətm olunmuşdur.

Günahsız güllələnən maarif fədailərindən biri də Hənəfi Zeynallı olmuşdur. Hənəfi Baba oğlu Zeynallı 1896-cı ildə Bakıda dəmirçi-nalbənd ailəsində anadan olmuş, altı yaşında ikən yetim qalmışdır. O, 1916-cı ildə Bakı Dövlət Politexnik məktəbinə, sonradan müsbiqə imtahanı ilə Moskva Ali Texniki İnstituna daxil olmuşdur. O, bolşeviklər partiyasının üzvü kimi həm partiya işlərində işləmiş, həm də müəllimlik etmişdir. 1922-ci ildə Azərbaycan Dövlət Universitetinə daxil olmuş, 1927-ci ildə təyinatını Şərq fakültəsinin Azərbaycan türk ədəbiyyatı tarixi kafedrasına, ardınca isə Azərbaycan Pedoqoji İnstitutuna almışdır. 1923-cü ildə Azərbaycan Dövlət Nəşriyyatının baş direktoru olan Hənəfi Zeynallı, 1923-1931-ci illərdə "Kommunist" qəzeti, "Maarif və Mədəniyyət", "İnqilab və Mədəniyyət", "Maarif işçisi" jurnallarında əməkdaşlıq etmiş, geniş miqyaslı ədəbi-publisistik yazılarla çıxış etmişdir.

1930-cu ildən dosent olan Hənəfi həmin ildən Azərb.DETİ-nun ədəbiyyat bölməsində folklor qrupuna rəhbərlik edərək, V.İ.Leninin əsərlərinin tərcüməçilərindən biri olur. 1926-cı ildə yazdığı "Azərbaycan atalar sözləri və məsəllər", 1928-ci ildə "Türk ədəbiyyatı üzrə iş kitabı", folklor, terminologiya və sair ilə bağli çoxlu məqalələr yazmışdır.

1937-ci il 28 yanvar tarixində o, Ruhulla Axundovun əksinqilabi qrupunun üzvü kimi həbs olunanadək, Ədəbiyyat və Dilçilik İnstitunda dil və ədəbiyyat şöbəsinə rəhbərlik edərək, həm də elmi katib olmuşdur. 1937-ci il 20 sentyabr tarixində onu elm cəbhəsində ziyanlı işlər apararaq orta təhsil müəssisələri üçün dil və ədəbiyyat dərsliklərin müntəzəm buraxımasına guya mane olduğuna görə yenidən imtahan edirlər. Qarayaxma kompaniyasının fikrincə, o, ziyanlı terminologiyalar və orfoqrafiyalar tərtib edərək o ziyalılar arasında yaymış, M.F.Axundovun əsərlərinin, "Molla Nəsrəddin"in nəşrinin bilərəkdən saxtalaşdıraraq, əvəzinə "Koroğlu" dastanının materiallarını toplamışdır. Əslində o, Azərbaycanın müstəqillik ideyasını əks etdirən inqilabi folklor tərəfdarlarının əsərlərini toplamalı idi. Bu və bir sıra "günahları" boynuna qoyularaq 1937-ci ilin 13 oktyabrında o, da Bakıda güllələndi. Onun həyat yoldaşı Səyyarə Səttar qızı Şərifova səkkiz il müddətində həbsdə saxlanıldı. 1957-ci il martın 30-u SSRİ Ali Məhkəməsi bu işin cinayət tərkibli olmadığı üçün rədd etdi və işə xitam verildi.

**Nəticə**

Məqalədə Azərbaycanın üç tanınmış, görkəmli ziyalısının represiya tüğyanına düşən talelərindən bəhs edilir. Bu cür ziyalılarımızın bütün türk dünyasında, ümumiyyətlə bütün dünyada tanınmasında fəal iştirak etmək bizim kimi gənc tədqiqatçı-pedaqoqların üzərinə düşür. Onların titullarını təqdin edirik: Hacı Kərim Canılı (1878-1937) -Qori müəllimlər seminariyasının məzunu; Xaçmaz orta məktəbinin müdiri; Sankt-Peterburq müəllimlər İnstitutunun məzunu; Qazax qəzasının hakimi; Yeni Əlifba Komitəsinin ilk fəallarındn biri; ikili, üç sinifli rus-tatar məktəbinin təşkilatçısı; pedaqoji metodist; Azərbaycan orfoqrafiyasının yaradıcısı; pedaqoji təhsil sisteminin əsasını qoyan; əlifba dərsliklərinin tərtibçisi.

Bəkir Vahab oğlu Çobanzadə (1893-1937) - ibtidai gimnaziya; İstanbul litseyi; Budapeşt Univerisitetinin tarix-filologiya fakultəsinin məzunu; Krım Univerisitetinin rektoru; professor; Azərbaycan Dövlət Univerisitetinin Şərq Fakultəsinin dekanı; Umymittifaq Yeni Əlifba Mərkəzi Komitəsinin Elmi Şurasının Sədri; Azərbaycan Terminologiya Komitəsinin humanitar bölməsinin rəhbəri; SSRİ EA-nın Azərbaycan filialinda dil bölməsinin baş elmi mütəxəssisi; Azərbaycan ET Pedaqogika və Psixologiya İnstitutunun həqiqi üzvü, Fərqanə Ali Pedaqoji İnstitutunun Özbək dili və ədəbiyyatı kafedrasının professoru; Paris Dilçilik Cəmiyyətinin üzvü; bütün türk dillərinin; alman, macar, fransız, ərəb, fars, rus dillərinin mahir bilicisi; sovet şərqinin ilk professoru.

Hənəfi Baba oğlu Zeynallı (1896-1937) Bakı Orta Politexnik məktəbi, Moskva Ali Texniki İnstitutu, Azərbaycan Dövlət Universitetinin Şərq fakultəsi, Azərbaycan türk ədəbiyyatı kafedrası; Azərbaycan Pedaqoji İnstitutunun məzunu; Azərbaycan Dövlət Nəşriyyatının baş direktoru; Azərb.DETU-nun ədəbiyyat bölməsinin folklorqrupunun rəhbəri; Azərb. ədəbiyyat və Dilçilik İnstitutunda Dil və ədəbiyyat şöbəsinin rəhbəri; Azərb. atalar sözləri və məsəlləri, folklor, terminolojiya, qəzet, jurnallarda ədəbi-publisistik yazıların müəllifi.

## Ədəbiyyat

1. 100-in elm və təhsil məbədi Bakı Dövlət Universiteti, Bakı – 2019 s.295 86s.
2. Fətəliyev F.Q., İsayev İ.N. Pedaqoji irsimizdən: Hacı Kərim Sanılı, Bakı 1991/Pedaqoji İnstitut tələbələri üçün vəsait 77s.
3. Bayramov T. Tarixin yarımçıq səhifəsi. Repressiya qurbanları/Azərbaycan 2003. 13.X 7s.
4. Bünyadov Z. "Qırmızı Terror" Azərbaycan Dövlət Nəşriyyatı Bakı-1993 s.253 Elm qırımı, Faciə

**Rəyçi: dos. E.Səmədova**

Göndərilib: 19.12.2020 Qəbul edilib: 21.12.2020

DOI: 10.36719/2663-4619/61/129-132

**Nərgiz Mövsüm qızı Hüseynli**
Bakı Dövlət Universiteti
nergizhuseynli1998@gmail.com

# DONOR VƏ RESİPİYENT ANLAYIŞI VƏ ONLARIN HÜQUQİ STATUSU

***Açar sözlər:*** *Transplantasiya, donor, desipiyent, beyin ölümü, donor və resipiyentin razılığı*

## The concept of donor and recipient and their legal status

**Summary**

In the field of transplantation of human organs and tissues, the donor is a person who voluntarily donates his organs and tissues to transplant patients, and the recipient is a person who transplants organs and tissues for therapeutic purposes. It should be noted that if the donor is under 18 years of age, it is not allowed to remove organs and tissues for transplantation purposes, except for bone marrow. Also, the medical decision on transplantation is made directly to the recipient, if the recipient is considered to be under 18 years of age and legally incapable, then the information is passed on to legal representatives of the recipient. Transplantation of human organs and tissues is carried out on the basis of medical instructions in accordance with the rules of surgery. The main point is that if it is not possible to save human life or restore health through other medical methods and through corpse organs and tissues, then the recipient is allowed to transplant organs and tissues from the donor.

***Key words:*** *Transplantation, Donor, Recipient, Brain Death, Donor and Recipient Consent*

Günümüzdə orqan transplantasiyası, son dövrlər üçün aktual olan orqan çatışmazlığının qarşısının alınmasında unikal bir vasitə kimi çıxış edir. Həmçinin transplantasiya, həyatın xilas edilməsində və insanın sağlamlığının yaxşılaşdırılması sahəsində xəstədə olmayan və ya zədələnən orqan və ya toxumaların yenisi ilə əvəz edilməsi prosesində mühüm rol oynayır.

Orqan transplantasiyasının son illərdə orqan çatışmazlığının müalicəsində yeni olmasına baxmayaraq, orqan köçürülməsinin tarixi ilə bağlı bir neçə min il əvvələ aid əfsanələr və miflər mövcuddur. Hindistanda qədim dövrə, hətta eramızdan əvvəlki dövrə aid mənbələrdə orqan köçürülməsinə bənzər əməliyyatlar aşkar edilmişdir. Belə ki, qədim Hindistanda burunları kəsilən məhkumların kəsilmiş burunlarını bərpa etmək üçün cərrahlar həmin məhkumun qolundan alınan dəri parçasından istifadə etmişdilər. Bundan başqa təxminən eradan 500 il əvvəl bir Çinli həkim tərəfindən cərrahiyə əməliyyatı vasitəsi ilə iki əsgərin ürəyi qarşılıqlı olaraq bir-birilə dəyişdirilmişdir. Həmçinin digər bir Çinli həkim tərəfində xəstə orqanlar sağlam orqanlarla əvəz edilmişdir. Qeyd olunan bu əməliyyatlar, orqan köçürülməsi ilə bağlı ən qədim yazılı mənbələr hesab edilir.

Tarixdə təxminən eradan 300 il əvvəl “ Qara Ayaq Möcüzəsi” adlanan bir hadisə baş vermişdir. Bu hadisə zamanı iki məşhur həkim Cosmos və Damien əkiz qardaşları, müharibədə bərpa olunmaz zədə almış bir əsgərin ayağını kəsərək, yerinə yeni ölmüş qara dərili bir əsgərin ayağını tikmişlər və xəstə sağalmışdır. [1]

Azərbaycan Respublikasının qanunvericiliyində orqan köçürülməsinin anlayışı, növləri, xüsusiyyətləri ilk növbədə “İnsan orqan və (və ya) toxumalarının transplantasiyası haqında” 28 oktyabr 1998-ci il tarixli Azərbaycan Respublikasının qanunu ilə tənzimlənib. Bu qanunun 1-ci maddəsində transplantasiyanın anlayışı aşağıdakı kimi göstərilmişdir: İnsan orqan və (və ya) toxumalarının transplantasiyası-insan həyatının xilas edilməsi və sağlamlığının bərpası üçün cərrahiyə əməliyyatı aparmaqla xəstədə olmayan və ya zədələnən orqan və (və ya) toxumaların donorun və ya insan meyitinin orqan və (və ya) toxumaları ilə əvəz edilməsidir. İnsanın orqan və (və ya) toxumaları, şəxsiyyətin xarakterik xüsusiyyətlərini müəyyən etməyən anatomik struktur vahididir. Orqan və toxumların köçürülməsi zamanı, məhz iki subyektən söhbət gedə bilər: Donor və Resipiyent. Yuxarıda qeyd elediyimiz qanunun 1-ci maddəsində, Donor – öz orqan və (və ya) toxumalarını xəstə şəxslərə köçürmək üçün könüllü olaraq verən şəxs; Resipiyent- müalicə məqsədi ilə orqan və (və ya) toxumalar köçürülən şəxs hesab edilir.

Azərbaycanda bir insanın orqanının başqa bir insana köçürülməsi faktı məhz akademik Mirməmməd Cavadzadənin adı ilə bağlıdır. Onun rəhbərliyi ilə 1971-ci ildə nəinki Azərbaycanda, Cənubi Qafqazda və Yaxın Şərqdə ilk dəfə xəstəyə böyrək köçürülmüşdür. Mirməmməd Cavadzadə bu fəaliyyətinə görə, 1974-cü ildə SSRİ dövlət mükafatına layiq görülmüşdür. Müstəqil Azərbaycanın tarixində isə bir insanın orqan və (və ya) toxumalarının başqa bir insana köçürülməsi əməliyyatı 2005-ci ildə akademik Mirəsədulla Mirqasımov adına Respublika Kliniki Xəstəxanasında İranlı həkimlərin rəhbərliyi ilə həyata keçirilmişdir.

Həmçinin postsovet məkanında ilk dəfə bizim ölkəmizdə qaraciyər və böyrəyin eyni anda transplantasiyası icra olunub. Əməliyyat zamanı iki ayrı donordan böyrək və qaraciyər götürülərək, şəkər və xroniki böyrək çatışmazlığından əziyyət çəkən 40 yaşlı xəstəyə köçürülüb.[ 2]

Tibbi praktika zamanı köçürülən orqanlardan əsasən ürək, ağ ciyər, böyrək, qaraciyər və digər əzaların transplantasiyasına daha çox təsadüf edilir. Köçürülə bilən orqan və toxumaların tam siyahısı Azərbaycan Respublikası Nazirlər Kabinetinin 2000-ci il 13 sentyabr tarixli, 168 nömrəli qərarı ilə təsdiq edilmiş “Transplantasiya obyekti olan orqan və (və ya) toxumaların siyahısı” da göstərilmişdir. Bu orqanlara ürək, ağciyər (ürək-ağciyər kompleksi), qaraciyər, böyrəklər, mədəaltı vəzi və onların seqmentləri, mədəaltı vəzi 12 barmaq bağırsaqla birlikdə, dalaq, sümük iliyi, gözün buynuz qişası aiddir.

İnsan orqan və toxumalarının transplantasiyası tibbi göstəriş əsasında cərrahiyyə əməliyyatı qaydalarına riayət etməklə aparılır. Belə ki, Donordan asılı olaraq orqan köçürülməsinin bir neçə növü mövcuddur:

1. Avtogen (avtoloq) transplantasiyas-eyni insanın orqanizminin bir nahiyəsindən digər nahiyəsinə toxuma köçürülməsi;
2. Allogen transplantasiya-bir insanın orqanizmindən digər insanın orqanizminə aparılan orqan (toxuma) köçürülməsi;
3. İzogen (singen) transplantasiya zamanı monoziqot (tək yumurta) əkizi;
4. Ksenotransplantasiya-bir heyvan növündən başqasına orqan (toxuma) köçürülməsi
5. Süni orqanların köçürülməsi
6. Kök hüceyrələrdən orqanların klonlaşdırılması [3]

Həmçinin orqanın nəql edildiyi nahiyədən asılı olaraq üç cür transplantasiya növü mövcud olur: 1. İzotop – orqanın köçürülmə yeri və toxuması eynidir; 2. Ortotop – orqanın köçürülmə yeri eynidir; 3. Heterotop – orqanın köçürülmə yeri eyni deyil. [3]

Transplantasiya məqsədi ilə orqan və ya toxumaların həm canlı şəxslərdən, həm də meyitdən götürülməsi mümkündür. Bu zaman əsas diqqət yetirilməli olan məsələ odur ki, məhz başqa hər hansı üsullarla və ya meyit orqan və ya toxumaları vasitəsi ilə insanın həyatının saxlanması və ya sağlamlığının bərpası mümkün olmadıqda, resipiyentə donordan yəni canlı şəxsdən orqan və ya toxumaların köçürülməsinə yola verilə bilər. Şəxsin donor kimi iştirak etməsi üçün o, mütləq şəkildə yetkinlik yaşına çatmış şəxs hesab edilməlidir. Lakin, qanunvericilikdə istisna hal da kimi donorun yaşı 18-ə çatmadıqda ondan sümük iliyi istisna olmaqla, transplantasiya məqsədi ilə orqan və (və ya) toxumaların götürülməsi qadağandır. Bununla yanaşı, donordan orqan və toxumaların götürülməsini mümkünsüz edən bir sıra hallar da vardır. Belə ki, əgər donorun resipiyentin sağlamlığı üçün təhlükə törədən bir xəstəliyi varsa, bu zaman ondan orqan və (və ya) toxumaların köçürülməsinə yol verilə bilməz. Həmçinin resipiyentin qulluq tabeliyində və ondan fiziki, mənəvi, maddi cəhətdən asılı olan və ya ruhi xəstələrdən, həbsdə olan şəxslərdən, habelə hərbi əsirlərdən transplantasiya məqsədi ilə orqan və (və ya) toxumaların götürülməsi qadağandır.

Orqan və (və ya) toxumaların transplantasiyasını mümkün edən hallardan biri, bu transplantasiyanın məhz mütəxəssis-həkimlərin konsiliumu nəticəsində müəyyən edilməsidirsə, digər halı donorun yazılı razılığının olmasıdır. Razılığı olmadan hər hansı bir şəxsi hər hansı bir yolla orqan və (və ya) toxumalarının götürülməsinə məcbur edən şəxslər qanunla məsuliyyət daşıyırlar. Orqan və toxumaların transplantasiyasının həyata keçirilməsi haqqında qərar müvafiq olaraq tibb müəssisəsində müalicə həkimi, anestezioloq, cərrah və ya ehtiyac yaranarsa, digər mütəxəssislərdən təşkil olunmuş komissiya tərəfindən müvafiq icra hakimiyyəti orqanının müəyyən etdiyi qaydada qəbul edilir.

Praktikada mübahisəli, hətta fikrimizcə, şübhəli faktlar da vardır. Belə ki, Çinin bəzi şəhərlərində çox vaxt ölümə məhkum edilmiş cinayətkarlardan çıxarılmış orqanlardan istifadə edən transplantasiya mərkəzləri mövcuddur. Bu cür hallarda yaxınlarının razılığı ona görə alınır ki, onlar orqanlarının çıxarılmasını öz qohumlarının cəmiyyətə vurduğu ziyana görə ədalətli kompensasiya hesab edirlər. Fikrimizcə, bu cür təcrübə pislənməyə layiqdir. Orqanların canlı, qohum olmayan donorlardan haqqı ödənilməklə transplantasiya üçün çıxarılması Hindistanda təcrübədən keçirilir. Halbuki, transpalantologiya məsələlərinin qanunvericiliklə nizamlandığı ölkələrdə orqanlara görə ödəniş almaq və ya vermək qadağan olunmuşdur. Orqanların verilməsi yalnız əvəzsiz olaraq mümkündür. Hazırda heç bir ölkə köçürülmə üçün insan orqanlarına olan tələbatı tam ölçüdə ödəmək iqtidarında deyil. Belə bir vəziyyət cinayətkar təşkilatlar tərəfindən istifadə edilməmiş qala bilməzdi, çünki orqanların köçürülməsi üçün mövcud qıtlıq şəraitində bu sahədə cinayətkar fəaliyyət yüksək gəlirlər gətirə bilər. Qərb kriminoloqlarının tədqiqatlarında qeyd edilir ki, dünyada insan orqanlarının yüksək qiymətə satıldığı “qara bazar” formalaşmışdır. [4]

İnsan orqan və (və ya) toxumalarının köçürülməsi zamanı transplantasiya əməliyyatı yalnız resipiyentin yazılı razılığı əsasında həyata keçirilə bilər. Həmçinin köçürülməni həyata keçirən həkim və ya həkim komissiyası tərəfindən əməliyyatla bağlı baş verə biləcək ağırlaşmalar haqqında resipiyentə məlumat

verilməlidir. Bu halda əgər, resipiyent 18 yaşına çatmamış şəxs hesab edilərsə və ya məhkəm tərəfindən fəaliyyət qabiliyyəti məhdudlaşdırılmış şəxs olarsa, transplantasiyanın həyata keçirilməsinə onun valideynləri və ya qanuni nümayəndəsi tərəfindən yazılı razılıq verilməlidir. Belə ki, transplantasiya nəticəsində resipiyentin sağlamlığında baş verə biləcək ağırlaşmalar haqqında məlumat da bu zaman resipiyentin qanuni nümayəndəsinə və ya valideynlərinə verilir. Bir halı da qeyd edə bilərik ki, əgər resipiyentin həyatı təhlükədə olarsa, istisna hal kimi onun özünün, valideynlərinin və qanuni nümayəndəsinin razılığı alınmaya bilər.

İnsan orqan və (və ya) toxumalarının transplantasiyası zamanı, bu əməliyyatın həyata keçirilməsi bir tərəfdən resipiyentin razılığı ilə, digər tərəfdən donorun razılığı ilə həyata keçirilir. Donorun razılığının alınması transplantasiyanın həyata keçirilməsi üçün mühüm şərtdir. Donor kimi iştirak edən şəxs əgər sağlığında onun orqan və (və ya) toxumalarının götürülməsinə yazılı razılığını bildirərsə, bu zaman həmin şəxsin ölümündən sonra onun orqan və (və ya) toxumalarının transplantasiya məqsədli götürülməsinə icazə verilə bilər. Bunun əskinə olaraq şəxs sağlığında donorluğdan, yəni orqan və (və ya) toxumalarının götürülməsindən yazılı şəkildə imtina edərsə, onun ölümündən sonra orqan və toxumalarından istifadə oluna bilməz. Üçüncü halda qeyd edə bilərik ki, əgər şəxs sağlığında onun orqan və toxumalarının götürülməsinə nə icazə verib, nə də imtina etməmişdirsə, yəni bu məsələyə münasibətini bildirməmişdirsə, bu zaman onun ölümündən sonra həmin şəxsin yaxın qohumlarının və ya qanuni nümayəndələrinin icazəsi ilə onun orqan və (və ya) toxumalarının götürülməsinə yol verilə bilər.

Transplantasiya zamanı donorun hüquq və azadlıqları qanunvericiliyimizdə qeyd edilmişdir. Bunlara aşağıdakıları aid edə bilərik:

1. Orqan və (və ya) toxumaların götürülməsi nəzərdə tutulan tibb müəssisəsindən planlaşdırılan tibbi əməliyyatla bağlı gözlənilən ağırlaşmalar barədə tam və obyektiv məlumat almaq;
2. Bu əməliyyatla bağlı dövlət tibb müəssisələrində müvafiq icra hakimiyyəti orqanı tərəfindən müəyyən edilmiş qaydada pulsuz müalicə və reablitasiya olunmaq, o cümlədən dərman vasitələri ilə təmin olunmaq;
3. Donorluqla əlaqədar əlil və ya sağlamlıq imkanları məhdud olarsa, qanunvericiliyə uyğun olaraq pensiya almaq.
4. Orqan və (və ya) toxumalarının köçürülməsinə razılıq verən donor özünün zərərli vərdişləri və ona məlum olan xəstəlikləri barədə məlumat verməlidir.[5]

Meyitdən transplantasiya məqsədi ilə orqanların götürülməsi, sadəcə tənəffüs cihazına bağlı olaraq reanimasiya şöbəsində müalicəsi aparılarkən, geri dönüşü olmayan “beyin ölümü” hadisəsi baş vermiş şəxslərdən mümkündür. Hər ölümdən sonra orqanların götürülərək istifadə edilməsi mümkün deyildir. Belə ki, ölümün hansı formada baş verməsi orqanlardan istifadə edə bilmək baxımından böyük əhəmiyyət kəsb edir. Yəni evində, qəza yerində ya da xəstəxanada beyin ölümü baş vermədən ürəyi dayanmış və nəticədə dünyasını dəyişmiş bir insanın orqanlarından, orqan köçürülməsində istifadə edilmir. Müasir dövrdə transplantasiyanın həyata keçirilməsində əsas ümumi qayda odur ki, canlıya zərər vermədən, beyin ölümü baş vermiş şəxslərdən transplantasiya məqsədi ilə orqanların götürülməsidir. 1967-ci ildə Christian Barnard Cənubi Afrikada ürək çatışmazlığından ölməkdə olan bir xəstəyə ilk uğurlu ürək köçürülməsini həyata keçirilmişdir. Beyin ölümü baş vermiş donor aparatdan ayrıldıqdan və ürəyinin dayanmasından 12 dəqiqə sonra cərrahi əməliyyat başlamış və ürək götürülmüşdür. Belə ki, bu əməliyyat zamanı immun sisteminin orqanı rəddetməsi və donorun həqiqətən öldüyündən əmin olmaq üçün xəstə aparatdan ayrıldıqdan və ürəyi dayandıqdan sonra bir müddət gözlənilmişdir və bu zaman ərzində də köçürülməli orqan olan ürəkdə bir sıra problemlər baş vermiş və nəticədə yeni orqan köçürülmüş resipiyent 18 gün sonra ölmüşdür. Buna baxmayaraq bu əməliyyat bütün dünyada ilk ürək köçürülməsi adıyla tarixə düşmüşdür.

Bizim qanunvericilikdə də bu məsələ oxşar baxımdan tənzimlənmişdir. Belə ki, “İnsan orqan və (və ya) toxumalarının transplantasiyası haqqında” 1999-cu il 28 oktyabr tarixli Azərbaycan Respublikasının qanunun 10-cu maddəsində qeyd edilmişdir ki, meyitdən və ya ölüm vəziyyətində olan şəxslərdən transplantasiya məqsədi ilə orqan və (və ya) toxumaların götürülməsi yalnız həkim konsiliumu tərəfindən bioloji ölümün baş verilməsini və baş-beyin fəaliyyətinin tam dayanmasını (“beyin ölümünün”) təsdiq edən inkaredilməz faktın olmasından sonra həyata keçirilə bilər. Donorun ölüm aktının təsdiqində transplantoloq və ya transplantalogiya işinin təşkilində bu və ya digər formada fəaliyyət göstərən hər hansı bir şəxsin iştirakı qadağandır. 11-ci maddədə isə qeyd edilir ki, meyitdən transplantasiya məqsədi ilə orqan və (və ya) toxumaların götürülməsinə tibb müəssisəsinin baş həkimi tərəfindən icazə verilir, həmçinin meyitin məhkəmə-tibb ekpertizası zəruridirsə, məhkəmə-tibb eksperti orqan və (və ya) toxumaların götürülməsinə icazə verməyə bilər.

Tibbi göstərişlər əsasında transplantasiya məqsədi ilə insan orqan və (və ya) toxumalarının götürülməsinə icazə verilir. Transplantasiya məqsədi ilə insanı, onun orqan və (və ya) toxumalarının götürülməsinə məcbur

etmək qadağandır. Toxuma komponentlərindən hazırlanmış köçürmə materialları və preparatları istisna olmaqla insan orqan və (və ya) toxumaları alqı-satqı obyekti ola bilməz və onların alqı-satqısında iştirak edən şəxslər qanula müəyyən edilmiş qaydada məsuliyyət daşıyırlar. [6]

İnsan orqan və toxumalarının köçürülməsi zamanı yerinə yetirilməli vəzifələrdən biri də donordan orqan və (və ya) toxumalarının götürülməsi şərtlərinə əməl edilməsidir. Bu şərtlərdən ən vacibi odur ki, donor cərrahiyə əməliyyatı vasitəsilə orqan və ya toxumaları götürüldükdən sonra onun səhhətində yarana biləcək ağırlaşmalar barədə xəbərdar edilməlidir. Daha sonra transplantasiyanın həyata keçirilməsinə donor başqa kənar təsirlər olmadan özü yazılı razılığını bildirməlidir, həmçinin əməliyyatdan əvvəl donor hərtərəfli tibbi müayinədən keçirilməlidir və donordan transplantasiya məqsədi ilə orqan və (və ya) toxumalarının götürülməsi haqqında mütəxəssis-həkimlər tərəfindən rəy olmalıdır. Digər bir mühüm şərt ondan ibarətdir ki, transplantasiya zamanı sümük iliyinin köçürülməsi istisna olmaqla orqan və (və ya) toxumalarının götürülməsi nəzərdə tutulan donorun resipiyentlə genetik uyarlığı müəyyən olunmalıdır.

A.Mustafazadə (2013: 297) qeyd etmişdir ki, məhbus və əsirlərdən donor kimi istifadə edilməsinin cinayət əməli sayılmasıdır. Bu cür tələblər 1977-ci il tarixli Cenevrə Konvensiyasına Əlavə Protokolda da öz əksini tapmışdır. Məsələn, sənədin 11-ci maddəsində göstərilir ki, münaqişəli şəraitlər zamanı əsirlərdən, yaralılardan, xəstələrdən və ya gəmi qəzasına məruz qalanlardan, hətta onların razılığı olsa belə, orqan və (və ya) toxumaların çıxarılması üzrə əməliyyatlar aparılması yolverilməzdir.

Onu da qeyd edək ki, insan orqan və (və ya) toxumalarının transplantasiyasının həyata keçirildiyi ixtisaslaşdırılmış tibb müəssisələrinin siyahısı qanunvericilikdə göstərilmişdir. Bu müəssisələrə M.M.Cavadzadə adına Respublika Kliniki Uroloji xəstəxanası, Mərkəzi Gömrük hospitalı, Akademik Zərifə Əliyeva adına Elmi Tədqiqat Oftalmologiya mərkəzi, Mərkəzi Meftçilər xəstəxanası, Mərkəzi Klinika MMC, Respublika Müalicəvi Diaqnostika mərkəzi, Respublika Talasemiya mərkəzi, Azərbaycan Tibb Universitetinin tədris cərrahiyyə klinikası, Gəncə Müalicə Diaqnostika mərkəzi MMC aid edilir.[7]

## Nəticə

Belə hesab edirik ki, təbabətin inkişafı, tibb texnologiyalarının daim təkmilləşdirilməsi orqanların köçürülməsinə olan tələbatın artmasına gətirib çıxarmışdır. İnsanların həyatının xilas edilməsində meyitdən, bu mümkün olmadıqda isə canlı şəxslərdən transplantasiya məqsədi ilə orqan və ya toxumaların götürülməsi mühüm rol oynayır. Orqan və (və ya) toxumaların götürülməsi və köçürülməsi hər iki tərəfin, yəni həm donorun, həm də resipiyentin razılığı ilə həyata keçirilməlidir. Habelə transplantasiya barədə məlumatı da donorun və resipiyentin razılığı olmadan yayan tibb işçiləri qanunla məsuliyyət daşıyırlar. Donordan transplantasiya üçün elə orqan və toxumaları götürülməlidir ki, bu zaman əməliyyatdan sonra onun sağlamlığında bərpası mümkün olmayan, həyati təhlükə yaradan xəsarətlər yaranmasın. Belə ki, transplantasiya üçün donorda olan cüt orqanlardan birini, tək orqan və (və ya) toxumalardan isə donorun sağlamlığına təhlükə yaratmayacaq miqdarda və həcmdə götürmək olar. Həmçinin transplantasiya əməliyyatından sonra orqan və (və ya) toxuma köçürülmüş resipiyent və donorların dispanser müşahidəsi tibb müəssisəsində ildə bir dəfədən az olmamaqla klinik, laborator və instrumental müayinələrdən ibarət olmalıdır. Onu da qeyd edək ki, vətəndaşlığı olmayan şəxslərin və əcnəbilərin donor və resipiyent kimi cəlb edilməsi Azərbaycan Respublikasının iştirakçısı olduğu beynəlxalq müqavilələrdə nəzərdə tutulmuş qaydada həyata keçirilir.

## Ədəbiyyat

1. Can F. “Orqan bağışına onay verən və verməyən ailelerin bazı sosyal psikolojik değişkenler yönünden karşılaştırılması”. Doktora Tezi. Ankara, 2016, 146 s.
2. Fərzəliyev Ü. “Tibb qəzeti”, Bakı, 2012, 30 noyabr, 24 s.
3. Mustafazadə A.İ., Aslanov Z.N. “Tibb hüququ”, Dərslik. “Elm və təhsil” nəşriyyatı, Bakı, 2017, 204 s.
4. Mustafayeva A.İ. “Bioetika, Tibbi hüquq və İnsan hüquqları”, Dərslik. “Adventa Group” MMC, Bakı, 2013, 297 s.
5. Azərbaycan Respublikasının “İnsan orqan və (və ya) toxumalarının transplantasiyası haqqında” 1999-cu il 28 oktabr tarixli qanunu.
6. Azərbaycan Respublikasının “Əhalinin sağlamlığının qorunması haqqında” 1997-ci il 26 iyun tarixli qanunu.
7. Azərbaycan Respublikası Nazirlər Kabinetinin “İnsan orqan və (və ya) toxumalarının transplantasiyası haqqında” Azərbaycan Respublikası qanunun tətbiqi ilə bağlı bəzi normativ hüquqi aktların təsdiq edilməsi haqqında 2011-ci il 17 noyabr tarixli 187 nömrəli qərarı.

**Rəyçi: h.ü.f. d. G.Rzayeva**

Göndərilib: 22.12.2020 Qəbul edilib: 23.12.2020

DOI: 10.36719/2663-4619/61/133-135

**Aytaj Ali Suleymanova**
Baku State University
aytajsuleymanova@gmail.com

# ASSESSMENT OF THE DIFFERENCES BETWEEN THE INTERNATIONAL CONVENTION FOR THE SUPPRESSION OF THE FINANCING OF TERRORISM AND THE UNITED NATIONS SECURITY COUNCIL RESOLUTION 1373

**Summary**

Terrorism financing is a global phenomenon that not only threatens States' security, but can also undermine economic development and financial market stability. Terrorists require financing to recruit and support members and conduct operations. Thus, preventing terrorists from accessing financial resources is crucial to successfully counter the threat of terrorism. It is therefore of highest importance to stop the flow of funds to terrorists. The article describes the core elements of the main international instruments on the field of the fight against terrorist financing, similarities and differences between these norms.
***Key words:*** *financing terrorism, terrorist financing convention, terrorist acts, criminalization of financing terrorism, Resolution 1373*

## Introduction

The terrorist attacks on the United States on September 11, 2001, increased the importance of preventing, detecting and suppressing the financing of terrorism and terrorist acts on the part of the international community. The General Assembly of the United Nations called for international cooperation to prevent and suppress acts of terrorism and to hold accountable the perpetrators and those who shelter or support them. The United Nations Security Council unanimously determined, for the first time ever, any act of international terrorism to be a threat to international peace and security. This determination laid the foundation for Security Council action to bring together the international community under a common set of obligations in the fight to international terrorism.

On September 28, 2001, the Security Council unanimously adopted Resolution 1373 under Chapter VII of the Charter of the United Nations. This historic resolution established a body of legally binding obligations on all UN member states. It defined the common core of the new international campaign to deal with international terrorists, their organizations, and those who support them. [1]

On October 30, 2001 the Financial Action Task Force (FATF) agreed to a set of Special Recommendations at an extraordinary Plenary. At this Plenary it extended its mission on terrorist financing beyond money laundering. The first Special Recommendation consists of two parts. The first part provides that "each country is to take immediate steps to ratify and to implement fully the United Nations Convention for the Suppression of the Financing of Terrorism (1999). The second part of the first Special Recommendation requires each country to implement fully United Nations (UN) Security Council Resolutions dealing with terrorist financing, particularly Security Council Resolution 1373. [2, p IX-1, IX-2]

The Convention for Suppression of Financing of Terrorism is part of a global condemnation of terrorism. The principal aim of the Convention is to define the offence of financing of terrorism. It puts in place a comprehensive set of coherent provisions for matters relating to both suppression and prevention. It does not only allow the punishment of the financing of terrorism but also authorizes the prosecution of any terrorist act and of its financial sponsors.

The 1999 Convention requires parties to penalize conduct by any person who (art. 2, para. 1): "... by any means, directly or indirectly, unlawfully and willfully, provides or collects funds with the intention that they should be used or in the knowledge that they are to be used, in full or in part, in order to carry out:

"(a) An act which constitutes an offence within the scope of and as defined in one of the treaties listed in the annex [meaning the nine treaties predating the Financing of Terrorism Convention which defined terrorist offences]; or

"(b) Any other act intended to cause death or serious bodily injury to a civilian, or to any other person not taking an active part in the hostilities in a situation of armed conflict, when the purpose of such act, by its nature or context, is to intimidate a population, or to compel a Government or an international organization to do or to abstain from doing any act." [3]

The Convention is concerned with criminalization in which the definition of a terrorist act goes beyond all former conventions. It defines terrorist acts as "treaty offences" – set out in the nine international treaties

listed in the Annex to the Convention and "generic offences" – defined in the generic definition set out at subparagraph (b).

Subparagraph (a) refers to nine treaties, contained in the Annex to the Convention, and makes it an offense to provide or collect funds with the intention or in the knowledge that these funds will be used to carry out an offense defined in one of the listed treaties. The drafters of the Convention recognized that a country may not have become party to all nine treaties listed in the Annex to the Convention at the time it became a party to the Convention. The Convention authorizes states parties to declare, at the time of becoming a party to the Convention, that a treaty to which the country is not a party will be deemed not to be included in the Annex to the Convention, such declaration ceasing to have effect at the time the country becomes a party to the treaty. Conversely, if a state party to the Convention ceases to be a party to one of the treaties, it may by declaration state that the treaty will be deemed not included in the Annex. Countries may include the nine treaties in their definition of "treaty offences" even if they are not parties to all of them. [4, p 21]

Subparagraph (b) sets out a self-contained definition of a terrorist act. The generic offence of financing terrorist acts relies not only on conduct, but also on intent and purpose to define terrorist acts. Under the generic definition set out in the Convention, any act can be a terrorist act, provided its intent to cause death or serious bodily injury to certain persons, and provided its purpose is to intimidate a population, or to compel a government or an international organization to do or to abstain from doing something. A number of countries have added elements to the definition that have the effect of limiting its scope, or expanding it. The limiting language appears to have been motivated by a concern that the generic definition could be used in circumstances where it was not intended. Noteworthy in this respect is the qualification found in the U.K., Canadian, and Australian laws to the effect that the offense only exists "if the action is done or the threat is made with the intention of advancing a political, religious or ideological cause." [5, p 46-47]

Adopted on September 28, 2001, Resolution 1373 is the cornerstone of the United Nations' counterterrorism effort. It declares international terrorism a threat to international peace and security and imposes binding obligations on all UN member states. It urges nations to upgrade the capacity of legislation and executive machinery to fight against terrorism. [6]

Resolution 1373, Article 1 decides that all States shall:

(a) Prevent and suppress the financing of terrorist acts;

(b) Criminalize the willful provision or collection, by any means, directly or indirectly, of funds by their nationals or in their territories with the intention that the funds should be used, or in the knowledge that they are to be used, in order to carry out terrorist acts;

(c) Freeze without delay funds and other financial assets or economic resources of persons who commit, or attempt to commit, terrorist acts or participate in or facilitate the commission of terrorist acts; of entities owned or controlled directly or indirectly by such persons; and of persons and entities acting on behalf of, or at the direction of such persons and entities, including funds derived or generated from property owned or controlled directly or indirectly by such persons and associated persons and entities;

(d) Prohibit their nationals or any persons and entities within their territories from making any funds, financial assets or economic resources or financial or other related services available, directly or indirectly, for the benefit of persons who commit or attempt to commit or facilitate or participate in the commission of terrorist acts, of entities owned or controlled, directly or indirectly, by such persons and of persons and entities acting on behalf of or at the direction of such persons. [7]

Paragraph 1(b) of the Resolution requires the criminalization of the financing of terrorist acts, using language that is very close to that of the Convention. However, paragraph 1(d) requires something additional to the criminalization of terrorist acts. While both the Convention and paragraph 1(d) of the Resolution deal with the provision of financial assistance directed towards terrorism, there are notable differences between the two. First, while the Convention clearly requires the criminalization of the financing of terrorist acts, paragraph 1(d) of the Resolution rather than requiring that countries criminalize the provision of funds and services to terrorists, it requires them to "prohibit their nationals and entities within their territories" from making financial assistance available to terrorists and terrorist organizations. This language appears deliberate, as it stands in contrast to the language used in paragraph 1 (b) of the Resolution, which requires the criminalization of the financing of terrorist acts. The thrust of paragraph 1 (d) is to stop the flow of funds and financial services to terrorists and terrorist organizations, whether this is accomplished through criminalization or other means. [5, p 43]

The obligation established in paragraph 1 (c) of Resolution 1373 is broader than that in the 1999 Convention. The range of persons and entities that must be prevented from receiving funds or services is defined in the Resolution, but not in the Convention. In the Resolution, the list of such persons includes not only the persons who commit or attempt to commit, or facilitate or participate in acts of terrorism, but also entities owned or controlled, directly or indirectly, by such persons, and entities acting on behalf or at the direction of such persons. The Security Council imposes upon States the duty to freeze the funds not only of

any person who participates in terrorist acts, but also of entities under his direct or indirect control, and even of "associated persons and entities". The Convention defines only terrorist acts, not terrorists or terrorism, and, by implication, any person who commits, or may commit an act of terrorism, would be included. Article 8 of the 1999 Convention just envisages the freezing or seizure of funds "used or allocated for the purpose" of committing terrorist crimes. As regards legal persons, Article 5 of the same Convention only requires their liability to be established "when a person responsible for the management or control of that legal entity has, in that capacity, committed" an act of terrorism financing. [8, p 2]

Paragraph 1 (d) of Res 1373 requires that States prohibit any person or entity in their territory to provide "any funds or financial assets or economic resources or financial or other related services" to any person or entity related to terrorism. The Convention criminalizes the provision of "funds". Taking into account the broad definition of the term "funds" the difference between these two instruments that is covered not by the Convention but by the Resolution is the provision of "financial or related services".

It should be noted that there is a difference according to the jurisdiction. Article 3 of the Convention declares that: This Convention shall not apply where the offence is committed within a single State, the alleged offender is a national of that State and is present in the territory of that State and no other State has a basis under article 7, paragraph 1, or article 7, paragraph 2, to exercise jurisdiction, except that the provisions of articles 12 to 18 shall, as appropriate, apply in those cases. Article 7 refers to those cases in which a State shall (paragraph 1) or may (paragraph 2) establish its jurisdiction over the offences set forth in Article 2. Article 12 and 18 are concerned with mutual legal assistance, extradition, the rights of the accused as well as preventive measures. However, paragraph 1 (a) of the Resolution is not limited to punishing the financing of international terrorism. It extends its power to all terrorist acts, irrespective of any transnational element. [9, p 18]

With regards to the element of punishment both the Convention and the Resolution require to set up an effective system for the punishment of offences. Article 4 of the Convention envisages the criminalizing of offences set forth in Article 2 and punishing them with appropriate penalties. Article 5 requires States to provide the criminal, civil or administrative liability of legal entities. Paragraph 2 (e) requires States to ensure that any person who participates in the financing, planning, preparation or perpetration of terrorist acts or in supporting terrorist acts is brought to justice and ensure that, in addition to any other measures against them, such terrorist acts are established as serious criminal offences in domestic laws and regulations and that the punishment duly reflects the seriousness of such terrorist acts.

## Conclusion

The comparison between the International Convention for the Suppression of the Financing of Terrorism and the UN Security Council Resolution 1373 shows the comprehensive and stringent drafting of Resolution 1373 enables States to enjoy a certain margin of maneuver. The wide scope of the norms in Resolution 1373 exceeds what is required in Convention. Consequently Resolution 1373 shows itself more rigorous than the Convention and fills a vacuum left in the Convention.

## References

1. 'USA Report to the Counterterrorism Committee pursuant to paragraph 6 of Security Council Resolution 1373', 2001
2. The World Bank. 'Reference Guide to Anti-Money Laundering and Combating the Financing of Terrorism', 2006
3. 'International Convention for the Suppression of the Financing of Terrorism', 1999
4. UN Office on Drugs and Crime. 'Legislative Guide to the Universal Anti-Terrorism Conventions and Protocols', 2004
5. International Monetary Fund. 'Suppressing the Financing of Terrorism: A Handbook for Legislative Drafting', 2003
6. Eric Rosand. 'Security Council 1373, the Counter-Terrorism Committee, and the Fight against Terrorism', 2003
7. 'United Nations Security Council Resolution 1373', 2001
8. Luis M. Hinojosa-Martinez. 'A critical assessment of the implementation of Security Council Resolution 1373', 2014
9. UN Office on Drugs and Crime. 'Guide for the legislative incorporation and implementation of the universal anti-terrorism instruments', 2006

**Rəyçilər: prof. Ş.Səmədova**
**h.f.d. E.Balacanov**

Göndərilib: 22.12.2020 Qəbul edilib: 24.12.2020

DOI: 10.36719/2663-4619/61/136-138

**Bahar Əliösət qızı Mustafayeva**
Azərbaycan Dövlət Pedaqoji Universiteti

# EŞİTMƏ QÜSURLU UŞAQLARDA SƏS TƏLƏFFÜZÜ POZULMALARINI ARADAN QALDIRMAQ ÜÇÜN MUSİQİLİ RİTMİK VASİTƏLƏRDƏN İSTİFADƏ

***Açar sözlər:*** *eşitmə, nitq, oyun, musiqi, ritm, məşğələ, uşaq*

**Summary**

One of the most relevant methods used in the rehabilitation of hearing-impaired children and for the development of speech is music-rhythm. In any games based on music-rhythm, it is possible to stimulate several areas, such as speech, motor, cognitive processes. Composing tasks in the form of role-playing games appropriate to the age characteristics of children increases its effectiveness. Music primarily affects the auditory analyzer in children, helps to increase auditory attention in children with dementia. Thus, the child perceives sounds better over time and develops the ability to differentiate them. Improved hearing allows children to understand the speech of adults better. Over time, it accelerates the process of sound imitation, allows the child to pronounce the initial sounds and syllables.

Musical-rhythmic is based on the combination of sounds with movements, which leads to the improvement of children's motor skills. It helps to develop small and large motor skills, rhythm and coordination abilities during tasks.
***Key words:*** *hearing, speech, game, music, exercise, child*

Musiqi hərtərəfli fərdi inkişafın ayrılmaz hissəsidir. Eşitmə analizatorunun zədələndiyi, zəifeşitmədən əziyyət çəkən uşaqların nitq inkişafı zamanı ən effektiv üsullardan biri musiqi reabilitasiyasıdır. Eşitmə zəifliyi olan uşaqlar səsləri tam olaraq qavraya bilməsələr belə səs dalğalarını hiss etmək imkanına sahibdirlər. Bu imkandan maksimum istifadə edərək musiqili-ritmika vasitəsilə eşitmə qüsurlu uşaqlarda hərtərəfli inkişafı təmin etmək mümkündür.

Musiqili məşğələlər beyin qabığının inkişafını əhəmiyyətli dərəcədə aktivləşdirir, nəticədə beynin müxtəlif sahələri arasında yeni əlaqələr yaranır, uşağın zehni və motor fəaliyyətini stimullaşdırır, sinir hüceyrələrinin sayı artır. Beləliklə, bir çox sahələrin (eşitmə, nitq, idrak prosesləri və s.) inkişafı üçün fizioloji əsas yaranır. Musiqili – ritmik məşğələlərin tərtib olunma şəkli bu sahələrin inkişafı üçün vasitəçi rolunu oynayır.

Musiqili – ritmik məşğələlərin tətbiq olunması zamanı bir sıra məqamlara diqqət yetirilməlidir. Bu zaman mütləq şəkildə uşaqların ağır eşitmə dərəcsi təyin olunmalıdır. Bu uşaqlarda eşitmə imkanlarının nə qədər olduğunu bilməyə və musiqili – ritmik məşğələlərin proqramının düzgün şəkildə hazırlanmasına imkan verir.

Musiqili – ritmik məşğələlər həftədə 3 ya 4 dəfə olmaqla bir saat və ya bir – neçə saat təkrarlanır. Dərsləri həys yrçim. Məşğələlər zamanı istifadə olunacaq musiqilər uşaqların yaş xüsusiyyətlərini nəzərə alaraq seçilməlidir. Məktəbəqədər yaşlı uşaqların əsas fəaliyyət sahəsi rollu oyunlar olduğu üçün məşğələlərin də bu şəkildə tərtib edilməsi arzu olunandır. Bu həm də tapşırıqların uşaqlar üçün daha yadda qalan edir.

Musiqili-ritmik məşğələlər zamanı seçilən mövzular uşaqların intellektual inkişafına, söz ehtiyyatlarının artmasına kömək etməlidir. Oyunun gedişatı, istifadə edilən mahnıların sözləri həm onların anlaya biləcəyi məzmunda olmalı həm də biliklərini artırmalıdır.

Kiçik yaşlı uşaqların təlimində daha çox melodiyalardan istifadə edilir. Melodiyalar uşaqların nitq tənəffüsünün inkişafına, eşitmə diqqətinin artmasına təsir göstərir. Musiqi duyumunun artması eşitmə qavramasının inkişafına təkan verir.

İlkin mərhələdə uşaqlar sadəcə melodiyaları dinləməlidir. Bunun üçün adətən fortepianoda ifa olunan müxtəlif vokalsız melodiyalar məsləhət görülür. Zəifeşidən uşaq üçün melodiyalar ilk olaraq fon musiqisinə çevrilməlidir. Zamanla uşağın hərəkətlərindən, müxtəlif melodiyalara verdiyi reaksiyalardan musiqi duyumunun formalaşmağa başladığını hiss etmək mümkündür. Onlar sevdikləri melodiyaları diqqətlə dinləyir. Bu eşitmə diqqətinin və səslərin differensasiyasının başlanğıcıdır.

Musiqiyə qarşı ilk reaksiyalar başladıqdan sonra müxtəlif uşaq mahnıları, böyüklərin nəğmələri ilə bu proses bir qədər mürəkkəbləşdirilir. Başlangıcda uşaqlar sözləri çətin və yadda qalmayan mahnılar dinləməməlidir. Mümkün qədər sadə, anlaşılan uşaq mahnıları arzu olunandır. Bu zaman valideynlər mahnıları yüksək səslə oxumamalıdır. Bu uşaqların normal səs tonunu rahat mənimsəyə bilmələri üçün

vacibdir. Bu məqama diqqət yetrilmədikdə eşitmə cihazlarından istifadə edən və ya etməyən zəifeşidən uşaqlar sonralar normal səs tonu ilə ifadə olunan sözlü nitqi mənimsəməkdə çətinlik çəkirlər.

Musiqinin təsiri ilə eşitmə bacarığının inkişaf etdirilməsi uşaqlarda verbal nitqin formalaşmasına təkan verir. Böyüklərin oxuduğu mahnılarla, dedikləri sözlərlə artıq artikulyasiya aparatını yamsılayan uşaqlar ilk səslərini tələffüz etməyə başlayırlar. Bu mərhələdə uşaqlarla ünsiyyət zamanı üzbəüz dayanmaq onlara böyüklərin dodaq hərəkətlərini rahatlıqla müşahidə edə bilmək imkanı yaratmaq vacibdir. İlkin olaraq səslərin tələffüzü üzərində çalışılır. Sonradan hecaların təqlidinə başlanılır.

Zamanla musiqi eşitməyə, nitqə sonra isə motorikaya təsir edir. Uşaq melodiyaların müşayiəti ilə ritmə müvafiq hərəkətlər etməyə başlayır. Səslər bədən hərəkətlərini nizamlayır. Musiqiyə müvafiq əl və ayaqların hərəkəti, ritm anlayışının formalaşması, səs və hərəkətlərin ahəngdarlığı motor bacarıqların formalaşmasına kömək edir.

Musiqi eşitmə zəifliyi olan uşağın beyninin eşitmə, səs, motor, görmə sahələrinin inkişafına təsir edir və bir reabilitasiya işini icra edir. Musiqi uşağın eşitmə diqqətinin, səsləri ayırd edə bilmə (differensasiya) bacarığının inkişafına, ətrafdakıların nitqini anlamağa kömək edir.

Mahnılarla uşaq ilkin səslərini tələffüz edir, səsləri yamsılayır, yeni sözlər öyrənir. Verbal (sözlü) nitqin inkişafı üçün zəmin yaranır. Mahnılar uşaqların səs və söz ehtiyyatına müvafiq seçilməsi məsləhətdir. Mahnıların sözlərinin öyrədilməsi zamanı təhrif olunan səslərə diqqət yetirmək lazımdır. Musiqi ilə birgə mətnin davamlı təkrarı səsin avtomatlaşma prosesini sürətləndirir. Mahnının melodik və ahəngdar ifası yeni tələffüz edilən səsin nitqdə daha rəvan tələffüz edilməsinə səbəb olur.

Artikulyator aparatın, hərəkətlərin izlənməsi, uşağın onları yamsılamağa cəhd etməsi görmə diqqətinin inkişafına əsaslanır. Eşitməsi zəif olan uşaqlar böyüklərin tələffüz etdiyi səsləri dodaq oxuma ilə təqlid edib tələffüz etməyə başlayırlar.

Musiqili – ritmika nitqin prosadik tərəfində olan problemlərin həllinə kömək edir. Musiqili tapşırıqlar eşitmə qüsurlu uşaqların nitq inkişafına yalnız səslərin tələffüzü ilə deyil, nitqin intonasiyasının, rəvanlığının formalaşmasında da mühim rol oynayır Zəifeşidən uşaqlarda tez-tez monoton nitq müşahidə edilir. Vurğu düzgün şəkildə ifadə olunmur. Mahnıların düzgün, melodik ifası uşaqlara öz nitqlərini də intonasiyalı etməyə imkan verir. Mahnıların ifası zamanı vurğunun olduğu heca və sözlərdə musiqinin ritminin dəyişilməsi onlara heca və məntiqi vurğunu mənimsəmə imkanı verir.

Beləliklə, musiqi eşitmə problemli uşağın ümumi inkişafına əhəmiyyətli dərəcədə kömək edir. Bu məşğələlər mərhələli və fərqləndirilmiş şəkildə təşkil edilir. Musiqili-ritmik məşğələlərin təşkilinə aid nümunələrlə musiqinin eşitmə qüsurlu uşaqların nitq və ümumi inkişafında rolunu daha aydın görmək olar.

Hazırlıq mərhələsində eşitmə diqqətinin, nitqi eşitmə, fonematik qavrama, artikulyasiya aparatı, tənəffüs, nitq zamanı nəfəs aktının tənzimlənməsi, səsin inkişafı üçün müxtəlif məşğələ və oyunlar təşkil olunur.

Eşitmə diqqətinin formalaşması üçün oyunlar keçirilən zaman aşağıda qeyd edilən musiqili oyunlardan istifadə edilir.

“Yağış” mahnısı. *Musiqisi: Səadət Fərziyeva, sözləri: Elmira Yusif qızı*

Məqsəd: Hərəkətləri musiqi ilə uzalaşdırmaq və onun gedişatından asılı olaraq hərəkətləri dəyişdirmək.

Oyun başlamamışdan əvvəl uşaqlar surdopedaqoqlar və ya müəllimlər tərəfindən təlimatlandırılır və ardıcıllıq izah edilir.

Uşaqlar müəllimin onlara göstərdiyi yerdə dayanır və Yağış mahnısının “Gəzinti” olaraq adlandırılan şərti hissəsi zalda səsləndirilməyə başlayır. Uşaqlar gəzməyə başlayırlar. Sonra “Rəqs” melodiyası səslənir və uşaqlar bacardıqları kimi rəqs edirlər. Sonda “Yağış” melodiyası səslənir. Uşaqlar ilk olaraq yuxarıya baxır və sonra yağış damlalarını sanki, tutmaq istəyirlərmiş kimi əllərini yuxarı qaldırıb ovuclarını açırlar. Bir – neçə saniyə sonra isə onlar qaçışır və öz yerlərinə qayıdırlar.

Bu oyunu bir-neçə dəfə təkrarlayaraq pedaqoq uşaqlara musiqinin gedişatına diqqət yetirməyi dəfələrlə vurğulayır.

*“Yol” mahnısı. Musiqisi: Vasif Adıgözəlov, sözləri: Ramiz Rövşən.*

*Marş. “Azərbaycan Ordusu” mus: Eldar Mansurov*

*“Oyun havası” xalq musiqisi*

Tapşırıq: Musiqini dinləmək və tanış musiqiləri tapmaq və onun xarakterinə uyğun hərəkətlər etmək; bayraqlarla şən və aktiv şəkildə rəqs hərəkətləri etmək; addımları sərbəst və əmin şəkildə atmaq.

Oyunun gedişatı aşağıdakı kimi təşkil edilir.

Otağın bir küncündə uşaqların sayı qədər oyuncaq sükan, ikinci küncündə bayraqlar, üçüncü küncündə yenə onların sayı qədər rəngli əl dəsmalları qoyulur. Uşaqlar otağın dördüncü küncündə stullarda oturaraq musiqinin səslənməsini gözləyir. Səslənən musiqinin növündən asılı olaraq tapşırıqları icra edirlər. Beləki, əgər onlar oyun havasını eşitsələr gedib əl dəsmallarını alır və bacardıqları şəkildə rəqs etməyə başlayırlar.

Marş səsləndikdə bayraqları alır və bir-birinin ardıyca əsgər kimi özlərindən əmin bir şəkildə addımlamağa başlayırlar. Əgər eşidilən "Yol" mahnısıdısa, onda sükanları alır və otaqda gəzməyə başlayırlar.

Eşitmə problemli xüsusilə, kar uşaqlarda nitqi eşitmənin formlaşması üçün təşkil edilən oyunlarda əsasən musiqini dinləmək, onu eşitmək vərdişlərinin formalaşmsına xidmət edir. Belə oyunlardan biri iki musiqi parçasından ibarət olan "Gəlincik" oyunudur.

*"Qonaqlıq" mahnısı. Musiqisi: Oqtay Zülfüqarov, sözləri: Xanımana Elibeyli.*

*"Lay-lay". Azərbaycan xalq mahnısı.*

Qızlara gəlinciklər, oğlanlara oyuncaq musiqi alətləri (qaval, zınqırov, tütək və s.) verilir. "Qonaqlıq" adlı mahnı səslənir və qızlar musiqinin sədaları altında qucaqlarında gəlinciklərlə asta templə gəzişirlər. Sonra əvvəlcədən otağın yan divarına düzülmüş stullarda əyləşir və gözləyirlər. Növbəti mahnı – "Lay-lay" səslənir. Qızlar gəlincikləri qucaqlarında yelləyirlər.

Oyunun ikinci mərhələsində yenə "Qonaqlıq" mahnısı səslənir. Oğlanlar öz oyuncaqları ilə çalır və möhkəm addımlarla gəzirlər. Mahnı tamamlandıqda uşaqlar öz yerlərinə oturur. Qızlardan biri oğlanlara yaxınlaşır və bir musiqi ifa etmələrini istəyir. Oğlanlar bir oyun havası çalır və qızlar öz gəlincikləri ilə rəqs etməyə başlayırlar. Onlar gəlinciyin ayaqlarını yerə vurur və bir ağızdan deyirlər "top – top, top – top, top – top". Sonra onları yuxarı qaldırır və fırlanırlar. Bununla da rəqs başa çatır. Oyunun davam etməsi üçün qızlardan biri oğlanlara yaxınlaşaraq yeni bir mahnı istəyə bilərlər.

Fonematik qavramanın inkişafı eşitmə problemli uşaqların səsləri doğru şəkildə qavraya bilməsi və onları differensasiyası üçün olduqca vacibdir. Bu istiqamətdə olan çalışmaları uşaqlar üçün daha maraqlı hala gətirmək üçün musiqili ritmik tapşırıqlardan istifadə etmək olar. Aşağıda istifadə olunan oyun bunun üçün nümunədir.

*"Cip – cip cücələrim". Musiqisi: Qənbər Hüseynli, sözləri: Tofiq Mütəllibov.*

Uşaqlar oturur və "Cücələrim" mahnısını dinləyirlər. Bir uşaq ortada əlində çömçə ilə dayanır və müəllimənin işarəsini gözləyir. Müəllimənin "kış" deməsindən sonra hamı qaçır və ortada olan uşaq onları tutmağa çalışır.

Artikulyasiya aparatının hərəkətliliyinin artması, inkişafı uşaqlarda səs tələffüzünün yaxşılaşmasına, təhrif olunan səslərin bərpasının asanlaşmasına kömək edir. Artikulyasiya gimnastikalarından biri olan "at" gimnastikasının musiqili bir oyunla vəhdəti dərsi uşaq üçün daha maraqlı edir.

**"***Atlar"* mahnısı. Musiqisi: E.Dadaşova, sözləri: S.Tağıyeva

Uşaqlar qrup şəklində dayanır və musiqinin eşidilməsi ilə dillərinin sərt bir şəkildə şappıldatmağa başlayırlar. Birdən musiqinin səsi kəsilir və "atlar" dayanır. Pedaqoq uşaqlardan soruşur "Kimin atı əsgərin əmrinə daha yaxşı qulaq asırdı?". Bu zaman uşaqlardan ikisi irəli gəlir, yanaşı dayanır və tapşırığı təkrar edirlər.

Musiqinin müşayiətiylə müxtəlif idman hərəkətlərinin edilməsi ümumi motorikanın inkişafı üçün çox effektivdir.

*"Kim sevirsə idmanı" uşaq mahnısı. Sözləri: Teymur Elçin, musiqisi: Oqtay Zülfüqarov.*

*Bir – birindən aralı olamaqla* yerdən 40 sm., 60 sm. və 1 m. məsafədə maneələr hazırlanır. Uşaqlar səslənən mahnının (mahnılar müxtəlif heyvalar haqqında olur) sədalarıyla maneələrin altından ya ayı kimi - ayaqlar və əllər aralı, sağa və sola yellənərək, ya qurbağa kimi - çöməlib, ya da ilan kimi sürünərək keçməlidirlər. Maneələri keçən zaman uşaqlar hərəkətlərini təqlid etdikləri Heyvanların səslərini çıxartmalıdırlar .

Bu əyləncəli oyun uşaqların çətin hərəkətlər zamanı öz səslərinin temp və ucalığına, tələffüzünə nəzarət etmələrini təmin edəcək. Bütün maneələri keçərək otağın digər tərəfinə gələ bilən uşaqlara müəllimə top verir və sonda uşaqlar oynayır.

**Rəyçi: dos. T.Ağayeva**

Göndərilib: 14.12.2020 Qəbul edilib: 15.12.2020

DOI: 10.36719/2663-4619/61/139-142

**Jalə Şahin qızı Əlizadə**
Azərbaycan Dövlət İqtisad Universiteti
narmin1993@hotmail.com

# AZƏRBAYCAN RESPUBLİKASINDA VALYUTA MƏZƏNNƏLƏRİNİN TƏKMİLLƏŞDİRİLMƏSİ İSTİQAMƏTLƏRİ

***Açar sözlər:*** *makroiqtisadiyyat, valyuta intervensiyası, Mərkəzi Bank, valyuta məzənnəsi*

**Directions for improving foreign exchange rates in the Republic of Azerbaijan**

**Summary**

The main purpose of the study is to study the trends in the improvement of exchange rates in the country. The research will be carried out by several methods, the first of which is the method of analysis. The second method is a comparative method. The methodological basis of the research is the systematic and historical approaches of local and foreign authors mentioned in the scientific literature, as well as in legislative documents. The limitation of the study is that the national literature on the subject is relatively small. The practical significance of the study is the study of the mechanism for selecting monetary policy in the Republic of Azerbaijan and assessing its impact on the exchange rate regime.
***Key words:*** *macroeconomics, currency intervention, Central Bank, exchange rate*

## Giriş

İqtisadi proseslərdəki mühüm təsir roluna görə məzənnə ən çox təhlil edilən və pul siyasətində xüsusi yeri olan göstəricidir. Bu səbəbdən uyğun məzənnə rejiminin seçilməsi ən çox müzakirə edilən və haqqında dərin tədqiqatlar aparılan məsələlərdəndir. Valyuta məzənnəsi xarici valyutada ifadə olunan milli valyutanın qiymətidir. Valyuta məzənnəsi pul siyasətinin mərkəzidir: hədəf, siyasət vasitəsi və ya sadəcə iqtisadi göstərici kimi istifadə edilə bilər. Valyuta məzənnəsinin rolu əsasən seçilmiş pul siyasətinin növü ilə müəyyənləşdirilir.

Məzənnə rejimlərini 3 əsas qrupa bölmək olar: təsbit olunmuş məzənnə rejimləri, aralıq rejimlər və üzən məzənnə rejimləri. Bunların hər biri bir sıra alt qruplara bölünürlər. Valyuta məzənnəsi bir ölkənin pul vahidinin digər ölkələrin pul vahidlərində ifadə olunmuş qiymətinə deyilir.

Valyuta məzənnəsi tələb və təklif əsasında, ya da dövlət tərəfindən təyin edilə bilər. Çox vaxt valyuta məzənnəsi tələb və təklif əsasında formalaşır. Ona görə də, sabit rəqəm deyildir, çünki valyuta bazarında tələb və təklif tez-tez dəyişir. Tələb çox olduqda valyuta məzənnəsi artır, əksinə isə azalır. Valyuta məzənnəsi spesifik xarakterə malik pul kateqoriyasıdir və milli iqtisadiyyatla dünya iqtisadiyyatı arasındakı qarşılıqlı əlaqəni ifadə edir.

Valyuta məzənnəsi özünün belə bir rolu ilə istehsal sferasına güclü əks təsir göstərir. Valyuta məzənnəsinin bir iqtisadi göstərici kimi beynəlxalq iqtisadi əlaqələr sistemində əhəmiyyətli rolu var. Belə ki, valyuta məzənnəsinin dəyişməsi ixrac və idxal edilən malların qiymətinə, milli istehsalın dünya bazarında rəqabət qabiliyyətinə əhəmiyyətli dərəcədə təsir göstərir.

## Əsas hissə

Valyuta məzənnəsi bir ölkənin pul vahidinin digər ölkələrin pul vahidlərində ifadə olunmuş qiymətinə deyilir. Valyuta məzənnəsi tələb və təklif əsasında və ya da dövlət tərəfindən təyin edilə bilər. Valyuta məzənnəsi spesifik xarakterə malik pul kateqoriyasıdır və milli iqtisadiyyatla dünya iqtisadiyyatı arasındakı qarşılıqlı əlaqəni ifadə edir.

Müasir dövrdə ayrı-ayrılıqda milli iqtisadiyyatlar arasında qarşılıqlı şəkildə asılılığın artması və beynəlxalq dövriyyəsində qızıla dəyişdirilməyən kredit pullarının tətbiqi nəticəsində valyuta məzənnəsi ayrı-ayrılıqda milli iqtisadiyyatın inkişafının zahiri təzahürünə çevrilir və onun yeni əmək məhsuldarlığı çərçivəsində iqtisadi potensialını müəyyən dərəcədə nümayiş etdirir. Valyuta məzənnəsi özünün bu formada rolu ilə istehsalın sferasına güclü əks təsirini göstərir [7, s. 159].

Hər bir ölkə iqtisadiyyatının analizində əsas ölçü vahidi kimi ələ alınan makroiqtisadi göstəricilərdən biri də valyuta məzənnələri və onların dəyişmə tendensiyasıdır. Valyuta məzənnələri bir ölkənin sahib olduğu iqtisadi dəyərlərin başqa bir ölkənin iqtisadi dəyərlərinə görə fərqlilik dərəcəsini göstərməklə, ölkələr arasında iqtisadi tarazlığı ortaya çıxaran bir göstəricidir. Ümumiyyətlə, valyuta, valyuta siyasəti, valyuta

məzənnələri kimi anlayışlar Azərbaycanda müstəqilliyin əldə edilərək, mərkəzi planlı iqtisadiyyatdan bazar iqtisadiyyatına keçid ərəfəsində ortaya çıxmışdır [5. s, 31]

Müstəqillik qazandıqdan sonra Azərbaycan Respublikasında məzənnə rejiminin azad seçim imkanı əldə olundu. 1995-ci ilə qədər tətbiq olunan məzənnə rejimin sərbəst üzə bilən məzənnə rejimi olaraq qiymətləndirmək olar. Odur ki, 1992-94-cü illər Mərkəzi Bankın lazımi qədər xarici valyuta resursları olmadığı üçün və valyuta əməliyyatı qeyri-rəsmi valyuta bazarı daxilində aparılırdı. Bu cür şəraitdə Mərkəzi Bank valyuta məzənnəsi üzrə az təsir imkanı var idi və məzənnə valyuta bazarı üzrə tələb və təklifdən asılı şəkildə formalaşırdı.1995-ci il Azərbaycanın Mərkəzi Bankının valyuta resurlarının formalaşması nəticəsində xarici valyuta əməliyyatlarının hamısı rəsmi valyuta bazarında həyata keçirilməyə başlandı. Azərbaycanda tətbiq olunan məzənnə siyasətini aşağıda göstərilən mərhələlərə bölmək mümkündür.

Ümumilikdə, tarixən ölkəmizdə tətbiq edilən məzənnə rejimləri makroiqtisadi sabitliyin olmasını təmin etmiş, inflyasiyada hədəfə nail olmaq üçün müsbət təsir etmişdir. Müstəqillik dövründən etibarən AMB öz pul siyasətini məzənnə rejimi çərçivəsində həyata keçirir; Məzənnənin tənzimlənməsi inflyasiya hədəfləməsi üçün alət olsa da, onun digər makroiqtisadi təsirləri də diqqət mərkəzində saxlanılır; Təcrübə göstərdi ki, məzənnənin yalnız inflyasiya hədəflənməsi rejiminə xidmət etməsi məqsədəuyğun deyildir və ona daha geniş prizmadan yanaşılmalıdır; Bu baxımdan Azərbaycanda məzənnə alətindən qeyri-neft sektorunun rəqabət qabiliyyətinin tənzimlənməsi aləti kimi istifadə edilir

Məzənnənin hədəflənməsi rejimi, iqtisadiyyatı kiçik və açıq olan, maliyyə bazarları zəif inkişaf etmiş, ixracda xammal üstünlük təşkil etdiyi ölkələrdə özünü doğruldur; Məzənnənin hədəflənməsi rejimində valyuta məzənnəsi əvvəlcədən elan edilən həddə saxlanılır; Bu rejimdə pul siyasəti əsasən məzənnə rejimlərinin müxtəlif formalarına söykənir; Dünyanın 45-dən çox ölkəsində pul siyasəti məzənnənin hədəflənməsi rejimi üzərində qurulmuşdur. Üzən məzənnə rejimi - İdarə olunan üzən məzənnə rejimi; Sərbəst üzən məzənnə rejimi. Təsbit məzənnə rejimi - Tam təsbit məzənnə rejimi; Sürüşən təsbit məzənnə rejimi; Valyuta səbəti rejimi (https://unec.edu.az/application/uploads/2015/07/Pul-Siyaseti-ShAdigozalov.pdf). Məzənnə rejiminin seçim meyarlarına görə Azərbaycan Respublikasında məzənnə rejimlərini dəyərləndirərkən həmin meyarların bir qismi üzrə təsbit rejimi seçilməsi, digərlərinə əsasən də üzən məzənnə rejiminin seçilməsi məqsədəuyğundur.

Aydın olduğu kimi, iqtisadiyyat sektorunun şaxələnmə səviyyəsinin yüksəkliyi üzən məzənnə rejiminin tətbiq edilməsinə imkan yaradır. Son illərdə Azərbaycanda həmin sahədə müsbət meyillər sürətlənməkdədir. Şaxələnmə yüksək səviyyəyə çatdığı zaman üzən məzənnə rejiminin tətbiq edilməsi xeyli məqsədəuyğun olacaqdır [2].

Mərkəzi Bank templi iqtisadi artım, dünya iqtisadiyyatı üzrə inteqrasiyanın dərinləşməsi, həmçinin qlobal proseslərin dövlət iqtisadiyyatına təsirinin çoxalması şəraitində öz səlahiyyətlərinin daxilində məzənnə dəyişməzliyi, inflyasiya səviyyəsinin azaldılması, o cümlədən maliyyə sabitliyinin mühafizəsinə istiqamətlənmiş pul-məzənnə siyasətini yeridir. Qeyri-neft sektorunun da əvvəlki illərdə formalaşan dayanıqlı dianamika ilə artması gözlənilir.

Qəbul olunmuş makroiqtisadi çərçivə və dövlətin xarici investisiyalar üzrə cəlbediciliyinin çoxalması manat məzənnəsinin möhkəmlənməsi ilə əlaqəli təzyiqlərin qalmada davam edəcəyini gözləmək üçün əsas verir. Bu cür mühitdə Mərkəzi Bank üzən tənzimlənə bilən məzənnə rejimini sabit saxlamaqla həmin çərçivədə manat məzənnəsinin ciddi tərəddüdlərinin qabağını almaq məqsədilə aktiv steriliizasiya əməliyyatlarını gerçəkləşdirməlidir.

Məzənnə siyasətin tətbiq edilmə mexanizminin inkişaf etdirilməsi dairəsində manatın ABŞ dollarına nisbətən məzənnə dəyişməsinin hədəflənməsindən valyuta səbətinin dəyərinin hədəflənməsi üzrə keçirilməsi nəzərdə tutulmaqdadır. Məzənnə siyasətindəki həmin dəyişiklik Mərkəzi Bankda manatın ticarət tərəfdaşı sayılan dövlətlərin valyutalarına nisbətən orta dəyişimini xarakterizə etmiş nominal effektiv məzənnə üzrə təsir etmək imkanlarını artıracaqdır. Nominal effektiv məzənnə üzrə təsir vasitəsilə Mərkəzi Bankın özü qeyri-neft sahəsinin rəqabət qabiliyyətinin qorunması üçün dəstək verəcəkdir [6, s. 129].

Son illərin təcrübəsindən məlum olur ki, keçid mühitində valyuta tənzimlənməsinin böyük miqyasda gerçəkləşdirilməsi pozitiv xarakter daşıyır, o cümlədən ümumilikdə makroiqtisadi tarazlığın təmin edilməsində müstəsna önəm daşıyır. Valyuta tənzimlənməsinin başlıca aləti sayılan Mərkəzi Bankda valyuta müdaxiləsi həm manatın dollara nisbətən məzənnəsinin dəyişməzliyin təmin edilməsi, həm də pul kütləsinin həcminə nəzarət edilməsinə imkan vermişdir. Yaxın aspektdə neft dollarlarının böyük həcmli axınını nəzərə alaraq valyuta müdaxilələrinin önəmi daha da artacaqdır. Ona görə ki, Azərbaycan Respublikasının pul sektoruna sözü gedən miqyasda maliyyə axınları mühitində manatın yüksək dinamika ilə revalvasiyasına yol verilməməsi məqsədilə Mərkəzi Bankın fəal valyuta müdaxiləsi həlledici faktor olacaq.

Pul kütləsinin hədəflənməsi rejimi-Məzənnə hədəflənməsi mümkün olmadığı ölkələrdə pul kütləsinin hədəflənməsi rejiminə üstünlük verilir; PH-də əsas diqqət daxili tələb göstəricilərinə, məs. pul aqreqatları və daxili istehlak xərcləri və s. yönəldilir; Dünyanın 30-dan çox ölkəsində pul siyasəti PH rejiminə əsaslanmışdır. Rejimi həyata keçirmək üçün ilkin şərtlər: Səlahiyyət ancaq Mərkəzi Banka həvalə edilməlidir, Pul kütləsi ilə inflyasiya arasında birbaşa əlaqə mövcud olmalıdır.

2020-ci ilin birinci rübündə pandemiya sayəsində qlobal iqtisadiyyatda fəallıq kəskin azalmışdır. Bunları İqtisadi Əməkdaşlıq və İnkişaf Təşkilat (İƏİT) dövlətləri üzrə istehlakçı, həmçinin biznes inam indekslərinin dinamikası belə təsdiq edir.

2020-ci ilin I rübü Çində meydana gələn və dünyaya yayılaraq qlobal pandemiya elan edilən COVİD-19 virusu ilə mübarizə şəraitində keçmişdir. Epidemioloji vəziyyətlə əlaqədar qlobal ticarətin kəskin azalması, təchizat zəncirində pozulmalar, iş yerlərinin bağlanması və artan qeyri-müəyyənliklər qlobal iqtisadi aktivliyə mənfi təsir göstərmiş, azalan qlobal tələb əmtəə qiymətlərinin kəskin enişi ilə müşayiət olunmuşdur. Nəticədə qlobal iqtisadiyyatda 2020-ci ildə resessiya proqnozlaşdırılır ki, bu da iqtisadi vəziyyətin 2008-2009-cu illərin maliyyə böhranından daha ağır olacağını deməyə əsas verir.

2020-ci ilin ilk 6 ayında manatın xarici valyutalar üzrə məzənnəsi valyuta bazarı daxilində tələb-təklif nisbətinə müvafiq şəkildə formalaşmışdır. Xarici mühitdə baş vermiş proseslərin dolayı təsirləriylə əlaqəli valyuta bazarında mart ayı tələb çoxalsa da sonrakı aylar stabilləşmə baş veribdir [1, s. 37].

Valyuta məzənnəsinin bir iqtisadi göstarici kimi beynəlxalq iqtisadi əlaqələr sistemində əhamiyyətli rolu var. Belə ki, valyuta məzənnəsinin dəyişməsi ixrac və idxal edilən malların qiymətinə, milli istehsalın dünya bazarında rəqabət qabiliyyətinə əhəmiyyatli dərəcədə təsir göstərir.

Valyuta məzənnəsinin xarakteri aşağıdakı kimidir:

1. Əməliyyatların iştirakçılarına görə: alıcı qiyməti; satıcı qiyməti.
2. İstifadə olunan rejimə görə: təsbit edilmiş va ya sabit; üzən; qarışıq.
3. İnflyasiyaya görə: nominal: real.
4. Təyin edilməsinə görə: rəsmi: bazar.
5. Valyuta əməliyyatlarının növlərinə görə: cari valyuta əməliyyatlarının məzənnəsi: müddətli valyuta əməliyyatlarının məzənnəsi [7, s.160].

## Nəticə

Müasir şəraitdə məzənnə bütövlükdə dövlətin, iqtisadiyyatın sektorları, beynəlxalq əmək bölgüsündə iştirak edən müəssisə və təşkilatların maliyyə vəziyyətinin bir çox aspektlərinimüəyyən edən vacib bir göstəricidir. Bu baxımdan məzənnənin formalaşması və idarə edilməsiməsələləri daim milli diqqət mərkəzindədir.

Məzənnə siyasətinin seçimi ölkə iqtisadiyyatının diversifikasiyasının nisbətən aşağı səviyyədə olmasının və dünya neft bazarından asılılığınınnəticəsidir. Neft qiymətləri ilə valyuta məzənnələri arasında qarşılıqlı əlaqənin statistik təhliligöstərir ki, manatın real məzənnəsinin dinamikası neft qiymətlərinin hərəkətinə kifayət qədəruyğunlaşdırılıb. Tədqiqatlar göstərir ki, manatın real məzənnəsinin neftdən asılılığı assimetrik xaraker daşıyır.

Dünyanın mövcud inkişaf mərhələsində kapitalın axını milli və beynəlxalq iqtisadi həyatda bazis rolunu oynayır. Dünyanın inkişaf etmiş maliyyə və kapital bazarları ilə əlaqədar manevr etməsi məqsədilə üzən valyuta məzənnəsi siyasətindən yaxa qurtarmasına baxmayaraq, məzənnə siyasəti qeyd edilən bazarla olan əlaqəni saxlamaqdadır.

Məqalə milli valyuta siyasətinin təkmilləşdirilməsi ilə bağlı qanun, proqram, layihə və təkliflərin hazırlanması prosesində, elmi-tədqiqat işlərində, həmçinin ali məktəblərdə müvafiq ixtisas kurslarının tədrisində istifadə oluna bilər. Bununla birlikdə, işin nəticəsində irəliyə sürülən tövsiyələrin reallaşdırılması dayanıqlı iqtisadi inkişafın sürətlənməsi və səmərəliliyinin yüksəldilməsini təmin edə bilər.

## Ədəbiyyat

1. Azərbaycan Respublikasının Mərkəzi Bankı. Pul siyasətinin icmalı. Yanvar-iyun 2020. 41 s
2. E.Z.Hüseynov. Manatın məzənnəsinin inflyasiya ötürücülük qabiliyyətinin qiymətləndirilməsi // AMEA-nın Xəbərləri, İqtisadiyyat seriyası, N 3, 2011.
3. Ələsgərov A., Əlirzayeva T.“Məzənnə rejimləri və onların seçim meyarları”, İqtisadiyyat və Audit jurnalı N 11(65), 2015.
4. Huseynov, E. & Jamilov, R. 2013. “Channels of Monetary Transmission in the CIS: a Review”. Journal of Economic and Social Studies 3 (1): 5-60

5. Kamalov N., Bulut C. İnflyasiya, faiz, valyuta məzənnəsi arasındakı münasibət və Azərbaycan. (Nəzəri və praktiki analiz). Bakı, 2003. 244 səh
6. Quliyeva Ş.T. Valyuta məzənnələri və risklərinin təsərrüfat fəaliyyətinin nəticələrinə təsiri. «Maliyyə və uçot», 2010-cu il.
7. Məmmədov Z.F., Zeynalov Z.H. "Pul, kredit, banklar, qiymətli kağızlar və valyuta". «Nasir» nəşriyyatı, 2005, 198 səh
8. Nagayasu, J. 2016. "Empirical Analysis of The Exchange Rate Channel in Japan". Journal of International Money and Finance 26(6): 887-904.
9. https://unec.edu.az/application/uploads/2015/07/Pul-Siyaseti-ShAdigozalov.pdf

**Rəyçi: i.f.d. A.Paşacanov**

Göndərilib: 15.12.2020 Qəbul edilib: 16.12.2020

DOI: 10.36719/2663-4619/61/143-147

**Aytac Arif qızı Cəfərova**
Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universiti
aytacceferova98@mail.ru

# SƏSLİ MƏDƏNİ İRSİMİZ

***Açar sözlər:*** *arxiv, video, səs, mədəni irs, val, qrammafon, fono, sənəd*

## Our vocal cultural heritage

**Summary**

All archives have always served the same purpose. The archives preserve the most beautiful examples of cultural heritage. Efforts have been made to transmit historical documents, transcripts, rock inscriptions, manuscripts, manuscripts to future generations, protecting the collections of certain items. One of such archives is the Azerbaijan State Archive of Sound Recordings. Along with other historical monuments, audio and video recordings need to be protected as valuable archival documents. Because they are considered to be one of the spiritual treasures of the people.

***Key words:*** *archive, video, sound, cultural heritage, shaft, gramophone, background, document*

## Giriş

Hər bir xalqın və dövlətin tarixində elə maddi-mədəniyyət nümunələri olur ki, zaman keçdikcə onların mahiyyəti, dəyəri üzə çıxır. Belə milli sərvətlərdən biridə səsdir. Digər tarixi abidələrlə yanaşı, səs və video yazılarının da qiymətli arxiv sənədləri kimi mühafizəsinə ehtiyac var. Çünki onlarda xalqın mənəvi sərvətlərindən sayılır. Bunun nəticəsidir ki, ölkəmizdə səs və video yazılarının qorunub saxlanılması, məqsədilə 5 aprel 1968-ci ildə SSR Nazirlər Sovetinin qərarına əsasən Dövlət Səs Yazıları Arxivi yaradıldı.

İk olaraq “irs” və “mədəni irs” fenomenlərinə nəzər salaq: tarixdə hər bir yeni nəsil öz inkişafını sıfırdan, yəni boş yerdən deyil, əksinə özündən əvvəl varislərinin qoyub-getdiyi irsi mənimsəməsindən başlayır. İnsanlar öz tarixlərini istədikləri kimi yox, keçmişdən onlara gəlib-çatmışlara uyğun qurub yaradırlar. Bundan çıxış edərək müxtəlif nəsillər, xalqlar arasında tarixi əlaqə, varisilik yaranmış olur. (Eyvazova, 2017; 23)

Hər bir xalqın mədəni irsi özündə maddi və mənəvi mədəni irsi əks etdirir.Mədəni irsə malik olmaq hər bir xalqın toxunulmaz hüququdur. Mədəni irs tariximizi və kimliyimizi; keçmişlə, bugünümüzlə və gələcəklə olan əlaqəmizi təmsil edir. Xalqları mədəni irs qədər, milli-mənəvi ənənələr qədər, dəyərlər qədər birləşdirən başqa bir vasitə yoxdur. Elə bu səbəbdəndir ki, mədəni irsimizin qorunmasında muzeylərin kitabxanaların arxivlərin rolu böyükdür. İstər muzeylər olsun, istərsə də arxivlər keçmişlə gələcəy arasında körpü rolunu oynamışdır. (Ömərova, 2012)

Həqiqətən də, xalq öz keçmişini bilməyəndə, gələcəyini də qura bilmir. Keçmişin isə, ilk növbədə, yaddaşlarda yaşayır. Yazılı (kağız əsaslı və rəqamsal), görüntülü (kino-foto) və səsli (fono) arxiv sənədləri isə xalqın milli-faktoloji yaddaşı, maddi-mənəvi sərvətidir. Mükəmməl arxivi olan xalqın etibarlı qorunan tarixi mirası var deməkdir. Arxiv sənədləri bu baxımdan xalqın öz tarixini öyrənmək, dərk etmək, ondan faydalanmaq və ibrət dərsi götürmək üçün əvəzsiz mənbələrdir. Ümummilli lider Heydər Əliyevin arxiv xidmətini, arxiv sənədinin dəyərini, arxiv işinin siyasi və elmi-tarixi əhəmiyyətini dəqiq və sərrast idafə edir: "Arxiv işlərinə gərək çox ciddi fikir verək. Bir tərəfdən ona görə ki, bu, xalqımızın tarixini əks etdirən yeganə mənbədir. İkinci də ona görə ki, tariximizi təhrif edənlərin qarşısını almaq üçün çox mühüm amildir". (Rəsulov, 2018)

Arxivlərin hamısı hər zaman eyni məqsədə xidmət edib. Arxivlər mədəni irsin ən gözəl nümunələrini mühafizə etmişdir. Tarixi sənədlərin stenoqramların, daş kitabələrin, qayaüstü təsvirlərin, əlyazmaların, mətbuat orqanlarının, müəyyən əşyaların kolleksiyalarının qorunmasına mühafizə edilərək gələcək nəsillərə çatdırılmasına çalışılıb.Belə arxivlərdən biri də Azərbaycan Dövlət Səs Yazıları arxividir. Digər tarixi abidələrlə yanaşı, səs və video yazılarının da qiymətli arxiv sənədləri kimi mühafizəsinə ehtiyac var. Çünki onlar xa xalqın mənəvi sərvətlərindən sayılır. Axı, onların arasında yalnız mədəniyyət və incəsənətimizin fədailərinin deyil, eyni zamanda ictimai-siyasi və dövlət xadimlərinin də səsləri var. Məhz bu kimi amillər nəzərə alınaraq, Azərbaycan SSR Nazirlər Sovetinin 5 aprel 1968-ci il 154 saylı qərarı ilə Azərbaycan Respublikası Dövlət Səs Yazıları Arxivi yaradıldı. Səs Yazıları Arxivinin qarşısında duran əsas məqsəd isə vətənimizin ictimai-siyasi, tarixi, elm və mədəniyyətini özündə əks etdirən bədii və sənədli audio-video sənədləri, habelə, dövlət, siyasi və ictimai xadimlərin çıxışlarının müxtəlif səs və video daşıyıcılarında olan

yazıları, müharibə və əmək veteranlarının, elm və incəsənət xadimlərinin, ölkəmizə gələn xarici qonaqların səs və video yazılarını toplayıb, onların dövlət mühafizəsini təmin etmək kimi vacib vəzifə qoyulub.

Arxivin ən qədim sənədləri XlX əsrin ikinci yarısına aid olan səs yazısıdır. Bu səs yazısı sıxılmış deşikli kartondan ibarət valdır. Bu valı "Herafon" adlı cihazda səsləndirilir. Valın kənarında rus dilində mürəkkəblə Ştrausun "Qaraçı Baronu" və "Mazurka-polka" sözləri qeyd edilib. Bu sənədin qiyməti təkcə onun yaşında deyil. Həmin yazı dahi mütəfəkkir, Azərbaycan dramaturgiyasının banisi Mirzə Fətəli Axundzadənin əl yazısıdır. Bu, böyük ədibin dünya mədəniyyəti ilə yaxından maraqlanmasına canlı sübutudur. Bu val ədibin Şəkidə yerləşən ev muzeyindən gətirilmişdir. Arxivdə Azərbaycanın musiqi inciləri sayılan çox sayda qrammafon valları saxlanır. Bu vallar ötən əsrin əvvəllərində dünyanın müxtəlif səs yazma şirkətləri olan İngiltərənim "Qrammafon", Parisin "Pete" qardaşları, Varşavanın "Sport-Rekord", Kiyevin "Ekstrafon" Tiflisin "Konsert-Rekord" və Bakının "Qrammafon-Rekord" şirkətlərində yazılıb yayılmışdır. Bu qrammafon vallarda Azərbaycan musiqisinin korifeyləri olan Cabbar Qaryağdıoğlu, Məşədi Məhəmməd Fərzəliyev, Keçəçioğlu Məhəmməd, Ələsgər Abdullayev, Məcid Behbudov, Seyid Şuşinski, Musa Şuşunski, Mirzə Güllər xanım, İslam Abdullayev, Seyid Mirbabayev, Zabul Qasım, Məşədi Hilal Zeynalov, Zülfi Adıgözəlov, Xan Şuşinski, Həmid və Əsgər Malıbəyli qardaşları, məşhur tarzənlərdən Şirin Axundov, Mirzə Fərəc, Qurban Pirimov, Mənsur Mənsurov, Cəmil Əmirov və bir çox başqalarının ifasında muğam, mahnı və el havaları əbədiləşib. ( Mədətov, 2018; 243, 244 )

Məhşur xanəndə Mirzə Güllər xanım, xanəndə Aslan, Musa Səfərov, Qasım Abdullayev, Məşədi Qafar, səsi ilk vala yazılanlardan biri Əbdülqadir Cabbarov, o zamanlar üçün nadir peşə sayılan qarmonçalan Məmmədtağı və başqaları belə sənətkarlardandır. Həmin tapıntılar arxivin fondlarını zənginləşdirdiyi kimi, mədəniyyət tariximizin araşdırılmasında da xüsusi əhəmiyyət kəsb edir. Maraqlıdır ki, islam dinin qatı tədbirlərinin hökm sürdüyü bir zamanda böyük cəsarət nümunəsi göstərən qadın xanəndə Mirzə Güllər xanımın taleyinə qısaca diqqət yetirək. Zəmanəsinin haqsızlıqları gənc qızı doğma Cavad kəndindən, ata evindən qaçmağa məcbur edir. Əyninə kişi paltarı geyərək, el şənliklərində, Mirzə Güllər adı ilə, sönməz bir eşqlə oxuyan bu sənət fədaisinin səsi sonralar Şirvan, Gəncə, İrəvan, və başqa iri şəhərlərdən gəlir. Bir az sonra məşhur olan Mirzə Güllər xanım Kiyevə dəvət edilərək, "Monark-Rekord" səhmdar səsyazma cəmiyyəti 1914-cü ildə onun ifasında "Mirzə Hüseyn" segahı, "Bayatı-kürd", "Bayatı şiraz" muğamlarını, "Yerri, dam üstə yeri" və başqa el havalarını qrammafon valına yazdırmışdır. Ancaq axtarışlar zamanı bir valı tapılmışdır.

Azərbaycan teatr tarixi və onun ilk yaradıcılarına dair səs və video yazıları arxiv fondlarınxa xüsusi yer tutur. Burada Hüseynqulu Sarabski, Dadaş Şaraplı, Abbas Mirzə Şərifzadə, Ələsgər Ələkbərov, Şövkət Məmmədova, Sidqi Ruhulla, Ağadadaş Qurbanov, Hökümə Qurbanova, Fatma Qədri, Ülvi Rəcəb, Kazım Ziya, Hacıağa Abbasov, Ağasadıq Gəraybəyli və daha neçə neçə ölməz sənətkarlarımızın səs yazıları, səhnə fəaliyyətləri arxivin fondlarında mühafizə edilən sənəd əsərləridir. (Səfərova, 2015; 150, 151)

Arxivdə çox sayda səs və video yazıları qorunub saxlanmaqdadır. Bu səs yazıları arasında Azərbaycanın dahi bəstəkarları Üzeyir bəy Hacıbəylinin, Fikrət Əmirovun, Qara Qarayevin, Cahangir Cahangirovun, Süleyman Ələsgərovun, Əfrasiyab Bədəlbəylinin, Ağabacı Rzayevanın, Şəfiqə Axundovanın, ifaçılardan Rəşid Behbudovun, Müslüm Maqomayevin, Bülbülün, Rübabe Muradovanın, Yaqub Məmmədovun, Şövkət Ələkbərovanın, Lütfiyar İmanovun, Yavər Kələntərlinin, Zeynəb Xanlarovanın, Sara Qədimovanın, mahir muğam ustalarının Hacıbaba Hüseynovun, Arif Babayevin, Alim Qasımovun, Əbülfət Əliyevin, Canəli Ələkbərovun, Qulu Ələsgərovun, məhşur tarzən Bəhram Mənsurovun, xalq artisti Habil Əliyevin, qaboyçalan Kamil Cəlilovun, mahir qarmon ifaçısı Zakir Mirzəyevin, görkəmli cazmen Vaqif Mustafəzadənin, bir sözlə, Azərbaycanın tanınmış musiqi və ifaçıların, bəstəkarların səsləri, həyat və yaradıcılıqlarından ibarət olan zəngin fono və səs yazıları xüsusi dəyərə malikdir. Arxivin ən zəngin fondlarından biri ədəbiyyat bölməsidir. Fono-video yazılarında Məmməd Rahimin, İsmayıl Şıxlının, Süleyman Rüstəmin, Mirzə İbrahimovun, Nəbi Xəzrinin, Mehdi Hüseynin, Əliağa Vahidin, Bəxtiyar Vahabzadənin, Hafiz Baxışın, Mirvarid Dilbazinin, Rəsul Rza ilə Nigar Rəfibəylinin, M.Şəhriyarın və bir çox başqa yazıçıların, şairlərin həyat və yaradıcılıqlarının saxlandığı fono-videoya yazıları nadir sənət incilərindəndir.( Mədətov, 2018; 246, 247 )

Azərbaycanın dahi bestekarı Üzeyir bəy Hacıbəylinin dili ilə desək "Xalq musiqisinin ən yaxşı ifaçıları aşıqlardır". Onları əsl musiqi sənətkarları adlandırmaq olar. Musiqi sənətimizin özəyi, mədəniyyətimizin kökü ulu ozanların sinəsində dillənən telli sazdan başlayır. Buna ən gözəl nümunə olaraq, "Kitabi Dədə Qorqud" dastanın adını çəkmək olar. Arxivdə aşıq yaradıcılığı fondu digər fondlar kimi zəngindir. 200 mindən çox olan aşıq yaradıcılığı fondunda aşıqlarımız Azərbaycanın onun dilbər guşələrinin tərənnümü, gözəllikdən, məhəbbətdən, el qəhrəmanlarından söz açan dastanları və ifaları arxivin fondları arasında layiqli yer tutur. Ötən əsrin otuzuncu illərin məşhur aşıqları Qurbanəlinin, aşıq Mirzə Bayramovun, Əsəd Rzayevin,

aşıq Fətullanın, aşıq Şəmşirin, onlardan sonra gələn davamçılarının aşıq Kamandarın, Əkbər Cəfərovun, Mikayıl Azaflının, Hüseyn Saraclının, Əhməd Sadıxlının, Məhəmməd Sadıxlının, Mahmud Məmmədovun, Pənah Pənahovun, aşıq Əmrah Gülməmmədovun və bir çox başqa el sənətkarlarının ifa etdikləri aşıq mahnıları, saz havalarının lent yazıları, qrammafon valları və video yazıları qiymətli sənət incilərindəndir. Burada xalqımızın ən gözəl qəhrəmanlıq səlnaməsi olan "Koroğlu" dastanın bütün qolları aşıqlarımızın ifasında bir neçə qrammafon vallarında əbədiləşib.

Arxivdə keçən əsrin otuzuncu illərinə aid fono sənədləri xüsusi yer tutur. Bunların içərisində 1938-ci ildə Moskva şəhərində keçirilmiş Azərbaycan Ədəbiyyatı və İncəsənəti Ongünlüyünün" sənədləri xüsusilə dəyərlidir. Burada keçirilən tədbirlər böyük maraq doğurmuş "Ümumittifaq Melodiya" səsyazma şirkəti Azərbaycanın incəsənət ustalarının çoxunun ifalarını qrammafona yazmışlar. İkinci dünya müharibəsinim başlanması və bu kimi səbəblərin baş verməsi nəticəsində həmin valların "sınaq" nüsxəsi halında şirkətin anbarında qalmış və sonradan unudulmuşdur. Keçən əsrin 70-ci illərin də həmin qrammafon valları aşkar edilərək arxivə gətirilmişdir. Zədələnməmiş həmin valların sayı 800-ə qədərdir və dəyərinə görə arxivin nadir sənədləri sırasındadır. (Səfərova, 2015; 151)

Arxivin fondlarında İkinci Dünya müharibəsi zamanı xalqımızın oğul və qızlarının ön və arxa cəbhədə göstərdikləri şücaətləri fono sənədlərində toplanaraq qorunub saxlanır. Burada azərbaycanlı Sovet İttifaqı qəhrəmanlarının, müharibə veteranlarının, partizanların, arxa cəbhədə çalışan əmək veteranlarının çıxışları, xatirələri, habelə tarixi qələbəyə həsr olunmuş müxtəlif tədbirlərin audio-video yazıları cəmlənib. Bu sənədlər arasında Azərbaycan bəstəkarlarının və incəsənət ustalarının müharibə dövrünə dair fono və video yazıları daha çoxluq təşkil edir.

Son illərin məlum hadisələri ilə əlaqədar olaraq, "Qanlı Yanvar", "Köçkünlər", "Qarabağ hadisələri" kimi fondlarda yaradılıb. Artıq tarixə çevrilmiş qondarma "dağlıq Qarabağ" problemlərinin ciddiliyini nəzərə salan arxivin əməkdaşları, havadarlarının köməyilə erməni daşnaqları tərəfindən öz ata-baba torpaqlarından vəhşicəsinə qovulan azərbaycanlıların ah-naləsi, onların ittihamları, həttda, uşaq hıçqırtılarını belə lentə alıblar. 1973-cü ildə DQMV-nın 50-illiyinə həsr olunmuş təntənəli yığıncağın lent yazısına qulaq assaq, Dağlıq Qarabağın qədim Azərbaycan torpağı olduğunu və ermənilər buraya köçüb gələndən sonra xoşbəxt yaşadıqlarını onların öz dilindən eşidirik.

Arxivin fono sənədləri arasında Cənubi Azərbaycan və Türkiyə Cümhuriyyətinin mədəni və ədəbi mühitinə aid xeyli sayda qiymətli səs yazıları qorunub saxlanır. Bu səs yazıları arasında diqqət çəkən bir məqam var ki, o da şərqin görkəmli şairi Məhəmmədhüseyn Şəhriyarın səsi yazılmış lentlərdir. Səs yazıları arasında xalq şairi Məmməd Rahimin şeir dili ilə ona yazdığı açıq məktubu və şairin ona cavabı yazılmışdır. Ömrü boyu Bakını görmək və dostları ilə görüşmək həsrəti ilə yaşayan ölməz şairimiz göz yaşlarını həmin məktublara qataraq hıçqırtı ilə oxuyaraq lentə yazdırmış və bizlərə xatirə qoymuşdur. Bu çox dəyərli və çox da kədərli bir canlı sənəddir. Şairin şəxsi fondunda belə nümunələr çox saydadır. Arxivin fondlarında eyni zamanda Cənubi Azərbaycanın xanəndə və musiqiçilərinin keçən əsrin əvvəllərində buraxılmış qrammafon valları o dövrün zəngin musiqi həyatından xəbər verir. Onlardan Tahirxan, Rzaquluxan, Bağırxan və başqalarının qrammafon valları fondun dəyərli fono sənədlərindəndir. Arxivdə digər fono sənədlərlə yanaşı Güney Azərbaycanın və Türkiyə aşıqlarının da xeyli audio-video yazıları mühafizə edilir. Aşıq Qəşəm, aşıq Dehqan, aşıq Rəhim, aşıq Həsən Qəəffari, aşıq Mahmud Cahangiri, aşıq Məmmədlinin və başqa söz ustadlarının könül oxşayan fono sənədləri böyük məhəbbətlə qorunub saxlanır.

Arxivə qəbul edilən qiymətli sənədlər arasında Azərbaycanın görkəmli dirijoru Niyazinin fonotekası xüsusi diqqət çəkir. Görkəmli dirijor, bəstəkarın şəxsi fondunda 140- dan artıq fonosənədlər muhafizə edilir. Burada maestronun başqa-başqa ölkələrdəki konsertlərinin, onunla aparılan müsahibələrin, söbbətlərinin, radio və televiziya verlişlərinin, əsərlərinin lent yazıları, bir sıra görkəmli xarici ölkə musiqiçilərinin Niyaziyə avtoqrafa bağışladığı vallar və bundan başqa keçən əsrin əvəllərində buraxılmış 10 dan çox nadir qrammafon valları arxivin nadir sənədlərindəndir

Arxivdə qardaş ölkənin tərəqqipərvər şairi Nazim Hikmətin səs yazıları mühafizə edilir. Nazim Hikmət 1960-cı ildə Cəfər Cabbarlının evində təşkil olunmuş xatirə gecəsində çıxış etmiş və ədəbi Azərbaycan yazarlarının peyğəmbəri adlandırılmışdır. Onunla yanaşı Süleyman Rüstəm, Rəsul Rza, Sabit Rəhman, Cəfər Cəfərov və başqaları bu məclisdə iştirak etmiş, qısa ömrün dolğun yaradıcılığından geniş söhbət açmışdır. Daha sonra Nazim Hikmət "Ceviz ağacı", "Kərəm kimi" şeirlərini söyləmişdir. Belə bir lent yazısı böyük şəxsiyyətlərdən yadigar qalan qiymətli sənədlərdəndir.

Görkəmli xalq şairimiz Səməd Vurğun, onun həyat və yaradıcılğı ilə bağlı 200- dən artıq fono sənədi xüsusilə diqqətə layiqdir. Şairin ifasında özünün yazdığı şeir və poemalardan parçalar, müxtəlif tədbirlərdəki çıxışlarının lent yazıları xüsusilə mühafizə edilir. 1954-cü ildə Moskvada yazıçıların II Ümumittifaq qurultayında "Sovet poeziyası" haqqında hamını heyran qoyan, 20 ili əhatə edən geniş və parlaq məruzəsinin

lent yazısı arxivdə mühafizə edilir. Lent yazısı çox uzun axtarışdan sonra 1976-ci ildə Moskva şəhərindən tapılaraq arxivə gətirilmişdir.

1910-cu ildə sazəndə dəstələrinin vala yazdırdığı "Mirzəyi", "Vağzalı", "Tərəkəmə", "Əskərani", "Uzundərə" kimi oyun havaları, xanəndələrdən Cabbar Qaryağdıoğlu, Keçəçioğlu Məhəmməd və Məşədi Məhəmməd Fərzəliyevin "Gülə-gülə","Eşq atəşi", "Vətən şərqisi", "Mən bir Türkəm", "Tello" və başqa mahnılarını xorla birlikdə oxuyub vala yazdırmışlar. Maraqlıdır ki, həmin səsyazma şirkətləri vallarla bərabər onların katoloqlarını da kitabça şəklində çap edib yayırdılar. Əldə edilmiş bu katoloqlar istifadə üçün sanballı məlumat mənbəgi olduğu kimi, həmin valların axtarıb tapılmasında da xüsusi əhəmiyyət kəsb edir. Arxivin fondlarında çox maraqlı bir val da mühafizə edilir. Həmin vallara "Mirzəyi", "Vağzalı" rəqs havaları yazılıb. Həmin rəqs havalarını Varşavanın "Sport-Rekord" səsyazma şirkətinin avropalı əməkdaşları ifa edərək vala yazdırmışlar. 1910-cu ildə buraxılan bu val musiqimizin Avropada da xüsusi maraq doğurduğunu bir daha sübut edir. (Mədətov, 2018; 226)

Ölkəmizin ictimai-siyasi və iqtisadi həyatını əks etdirən fondda minlərlə xüsusi qiymətli fono və video yazıları arasında görkəmli siyasətçi və dövlət xadimi Heydər Əlirzaoğlu Əliyevin həyatını və coşğun fəliyyətini əks etdirən fono-video sənədlər tam toplanılaraq arxivin xüsusilə qiymətli fondunda mühafizə edilir. İnamla deyə bilərik ki, arxiv sənədləri arasında H.Əliyevin fəaliyyətinə dair fono-video sənədlər arxivin ən iri fondudur. Onların ümumi səslənmə müddəti.

O dövrün mühüm hadisələrindən biri də səhnə əsərlərinin qrammafon valına yazılması olub. Belə ki, 1914-cü ildə Varşavanın "Sport-Rekord" şirkəti Zülfüqar Hacıbəylinin "Əlli yaşında cavan" və "Evliykən subay" əsəri isə iki valdan ibarətdir və arxivin nadir-fono sənədləri kimi qorunub saxlanılır. Maraqlıdır ki, burada xalq artisti Hacıağa Abbasovla bərabər əsərin müəllfi Zülfüqar Hacıbəyli də iştirak edib. (Səfərova, 2015; 150)

XX əsrin əvvəllərində istehsal olunmuş qrammafon vallarının bir çoxu zaman keçdikcə tədrocən yarasız hala düşür, öz ilkin keyfiyyətinin itirirdi. Bunların arasında Cabbar Qaryağdıoğlu (1861-1944), Ələsgər Abdullayev (1866-1929), İslam Abdullayev (1876-1964), Məşədi Məhəmməd Fərzəliyev (1872-1952), Keçəçioğlu Məhəmməd (1864-1940), Məcid Behbudov (1873-1945), Şirzad Hüseynov (1906-1971) və başqa məşhur ifaçıların da qrammafon valları vardır. Yaxın keçmişdə YUNESKO-nun şifahi və qeyri maddi irsin qorunması üzrə konvensiyanının qarşıya qoyduğu tələblərin yerinə yetirilməsi məqsədi ilə Azərbaycanda XX əsrin əvvəllərinə aid edilən valların bərpasına başlanıldı. Bu işdə bir sıra uğurlu nəticələr əldə edildi. Daha dəqiqi, ölkəmizdə korifey sənətkarların ifaları müasir elmi-texniki tərəqqinin naliyyətlərindən bəhrələnməklə keyfiyyətli hala salındı. Sonrakı mərhələdə isə müxtəlif muğam layihələrini həyata keçirməklə bu ifalar çağdaş dinləyicilərin ixtiyarına verildi. (Mədətov, 2018; 236)

Ötən əsrin 90-cı illərin əvvəllərindən başlayaraq Heydər Əliyev Fondunun təşəbbüsünə əsasən Azərbaycanda Muğam sənətinin inkişaf etdirilməsi geniş vüsət alır. Bu layihəyə imza atan Fondun prezidenti, Azərbaycan Respublikasının birinci vitse-prezidenti Mehriban Əliyeva olmuşdur. Onun əzmkar fəaliyyəti nəticəsində ustadlarımızdan bizə yadigar qalan xalq sənətimiz indi əlçatmaz bir zirvəyə yüksəlib. Mehriban xanımın rəhbərliyi və böyük dəstəyi nəticəsində 1995-ci ildən başlayaraq gənc muğam ifaçılarını üzə çıxarmaq üçün tədbirlər görmüşdür. Həmin muğam ifaçıları tələbkar muğam biliciləri və geniş tamaşaçılar qarşısında sınaqdan məharətlə çıxmış və bu gün də bu sənəti yaşadırlar. Bütün bu layihələri yerinə yetirərkən Səs Yazıları arxivinin zəngin fondundan geniş istifadə olunub. SSRİ xalq artisti Fikrət Əmirovun, xalq artisti Tofiq Quliyevin 100 illik yubileyləri ərəfəsində onların bütün yaradıcılıqlarının toplanılıb külliyat halında buraxılmasında arxiv yaxından iştirak etmişdir.

Azərbaycan aşıq sənətinin "kölgədə" qalması da böyük narahatçılıq yaratmışdı. Bu sahədə də Mehriban Əliyeva böyük əzmkarlıq və cəsarət nümunəsi göstərərək Azərbaycanda aşıq sənətinin ənənələrini özünə qaytardı. Hər iki layihə "Azərbaycan muğam sənəti" və "Azərbaycan aşıq yaradıcılğı" YUNESKO-nun "Bəşəriyyətin qeyri-maddi" nemətlər" siyahısına daxil edilib. Bizim üçün bu böyük şərəfdir. Bu, Azərbaycanın birinci vitse prezidenti, H.Əliyev Fondunun prezidenti xanım Mehriban Əliyevanın Azərbaycan mədəniyyətinə verdiyi ən böyük töhfələrdəndir.

## Nəticə

Arxiv sənədlərinin mühafizəsini müvafiq qaydada təmin etməkdən ötrü müxtəlif müasir metodlarndan istifadə edilir. Hazırda beynəlxalq aləmdə istifadə edilən audio-video sənədlər yazılıb saxlanılan DVD və CD səs və video daşıyıcıları da arzu olunan dərəcədə etibarlı deyildir. Ona görə də kompüterin yaddaşına yazılan sənədlər rəqəmsallaşdırılaraq elekton formata saxlanılır, sərt disklərə köçürülür. Əl yetərliliyi təmin etmək üçün sənədlərin nüsxəsi, kartoteka kartoçkaları və digər elmi-məlumat sənədləri də Milli Arxiv İdarəsinin serverinə yerləşdirir.

**Ədəbiyyat**

1. Həsənxan Mədətov "Möcüzəli səslər xəzinəsi" Bakı-2018
2. İlhamə Səfərova "Arxivşünaslıq" dəslik. Bakı-2015
3. Yeganə Eyvazova "Abidəşünaslıq" monoqrafiya. Bakı-2017
4. Əsgər Rəsulov. Cümhuriyyət sənədlərinin etibarlı saxlancı. "525" qəzeti, Bakı, 2018 26 may. S.12
5. Vahid Ömərov. Azərbaycançılıq və milli-mədəni irs. "Səs" qəzeti Bakı, 2012. 5 aprel

**Rəyçi: dos. İ.Səfərova**

Göndərilib: 18.12.2020 Qəbul edilib: 20.12.2020

DOI: 10.36719/2663-4619/61/148-151

**Nərminə Ziyatxan qızı Abdullayeva**
Bakı Slavyan Univerisiteti
Narmina.abdullayeva.67@bk.ru

# NİTQ ETİKETİ-NİTQ MƏDƏNİYYƏTİNİN ƏSAS ŞƏRTİ KİMİ

***Açar sözlər:*** *etika, nitq, dil, nitq mədəniyyəti, ədəbi dil*

## Basic condition of speech etiquette

**Summary**

Speech etiquette defines human behavior in thefamily, in the collective, in the publik places. Speech etiquette helps to bild strong family and friendchip ties a person to grow as a person and a professional in society. Proper use to them depends on the cultural level of the person. Speech labels have their own national quality. They are a set rules how people relate to one another of morality regarding. Each nation systematically regulates its own rules of speech behavior. Every civilzed person follows them in the process of communication. The personal culture of the teacher`s behavior has always played on important role in relation to the teacher-student.

***Key words:*** *ethiks, speech, language, speech culture, literature language*

Həzrət Əli: İnsan dilinin altında gizlənir. Danışmayınca onun ağıllı və ağılsız olduğu bilinməyir. Dil mədəniyyətinin başlıca müddəalarından biri də danışığın etikasıdır. Mənşəcə latın sözü olan etika (ehtica) termini adı altında insanların bir-birinə, cəmiyyətə, cəmiyyətin insanlara münasibətini tənzimləyən mədəni, nəzakətli danışıq, əxlaq normaları nəzərdə tutulur. Bu normalar uzunmüddətli tarixi dövr ərzində formalaşmışdır. Etika termini ilk dəfə Aristotelin "Nikomaxın etikası", "Böyük etika", "Evlem etikası" əsərlərində işlənmiş, əməli nəsihət xarakterli fikirləri özündə ehtiva etmişdir. Aristotelin etikası ilk əxlaq nəzəriyyəsi olmuşdur. Bu dahi mütəfəkkirə görə, etikanın vəzifəsi insanı mənasız və qeyri-təbii ehtiraslardan uzaqlaşdırmaq, ona cəsurluq və ədalətlilik keyfiyyətləri aşılamaqdır. Əxlaq etikanın tədqiqat obyektidir. Lap qədim dövrlərdən başlayaraq etika "insan necə hərəkət etməlidir?" sualına cavab axtarır, əxlaqın mənşəyi və mahiyyəti məsələləri ilə məşğul olur. Etikaya görə, əxlaq cəmiyyətdə, insanlar arasında qarşılıqlı münasibətləri tənzim etmək tələbatından doğmuşdur. O özünün funksiyalarını yerinə yetirərkən ictimai rəyə, könüllülüyə əsaslanır. Etika dünyagörüşü elmidir, ictimai münasibətlərin tənzimlənməsi və təkmilləşdirilməsində bilavasitə iştirak edir. Etika mövcud adət və ənənələrə tənqidi yanaşmaqla şəxsiyyətə cəmiyyətdə fəal əxlaqi mövqe tutmaq keyfiyyəti aşılayır. Mənəvi aləmin nə dərəcədə fərdi, bənzərsiz və məhrəm olduğu bəllidir. Lakin bir insan mənəviyyatı fərdi olmaqla bərabər, həm də yurddaşları ilə nədəsə ortaqdır, yəni milli-etnik səciyyəlidir, toplum mənəviyyatı ilə ümumidir – xalqın tarixi inkişafı, özünüdərki boyu insan psixologiyasının milli çalarları, etnik-etiket və mənəvi dəyərlər formalaşır, bunlar milli xarakteri təşkil edir. Xalqın yaratdığı bu etik qaydaların insanların əlaqə və münasibətlərinin tənzim olunması, normal həyat tərzinin yaradılması sahəsində rolu böyükdür. Etik normalar xalqın lap 208 qədimdən yaratdığı və qoruyub saxladığı adət-ənənələrindən, müsbət əxlaqi keyfiyyətlərindən yaranmış, islami dəyərlərdən formalaşmışdır. Ta qədimdən yazıb-yaradan ədiblər, zəka sahibləri, dövrünün tanınmış ictimai xadimləri, maarifçilər və başqaları danışıq etikası, nəzakətli hərəkət və nitq barədə dəyərli fikirlər söyləmiş, bu normaları gözləməyin insanların mədəniyyətinin ümumi inkişaf səviyyəsinin yüksəldilməsinə, dil ünsiyyətinin keyfiyyətcə yaxşılaşmasına göstərdiyi müsbət təsiri dönə-dönə vurğulamışlar. Hələ erkən orta əsrlər dövründə Azərbaycanda məktəblərdə tarix, ədəbiyyat, məntiq, ritorika və s. kimi dünyəvi, "Quran", "Təfsir" (Quranın açıqlanması), "Hədis" (peyğəmbər (s) sözləri və onunla bağlı hekayə və rəvayətlər), "Təcvid" (Quranın düzgün oxunması), "Təftil" (Quranın mənasının başa düşülməsi) və ilahiyyat elmlərinin tədrisi prosesində şəxsiyyətin inkişafı, təhsili və təlimi, tərbiyəsi, o cümlədən də əxlaqimənəvi dəyərləri ilə bağlı bu gün belə aktual olan qiymətli fikirlər, məlumatlar verilmişdir. Həmin təhsil ocaqlarında Biruninin, Əbu Əli İbn Sinanın, Əbu Nəsr Farabinin, Sədi Şirazinin əsərləri, daha sonralar Ruminin "Məsnəvi"si, Füzulinin "Divan"ı, "Kəlilə və Dimnə", "Qabusnamə" kimi əxlaqi-mənəvi dəyərli əsərlərdə nəzakətli danışıq və hərəkətlərdən də bəhs olunmuşdur". Dədə Qorqud" dastanlarında digər dəyərlərlə yanaşı, insanların mənəvi-əxlaqi, etik-estetik keyfiyyətlərinin inkişafı ilə bağlı söylənilən fikirlər bu gün də böyük əhəmiyyət kəsb etməkdədir. Böyük mütəfəkkir N.Tusinin "Əxlaqi-Nasiri" əsərində bu baxımdam söylədiyi aşağıdakı fikirlər, mülahizələr xüsusilə dəyərlidir, ibrətamizdir: "Çox danışmamalı, başqasının sözünü yarımçıq kəsməməli, başqasının nağıl etdiyi hekayət və rəvayəti bilirsə, bunu üzə vurmamalı və onun danışıb qurtarmasına imkan yaratmalıdır. Başqasından soruşulana cavab verməməli, ümumidən edilən sualda

camaatı qabaqlayıb hövləki irəli düşməməlidir. Biri cavab verməklə məşğul isə, daha qabil cavab verməyə qadir olsa da, səbr etməli, o, sözünü qurtardıqdan sonra öz cavabını verməlidir, lakin əvvəlkinə tənə etməməlidir. Onun yanında iki adam söhbət edirsə qarışmamalı, ondan gizlidirsə gizlin qulaq asmamalıdır; özləri müraciət etməsələr söhbətə qoşulmamalıdır. Böyüklərlə danışarkən kinayə işlətməməli, nə bərkdən, nə yavaşdan, mülayim səslə sözünü deməlidir. Danışdığı məsələ qəlizdirsə, aydın misallarla izah etməyə çalışmalıdır, başqa hallarda qısa və yığcam danışmalıdır. Yabançı kəlmələr işlətməməli, qondarma ibarələr düzəltməməli, ona deyilənlərə axıra qədər qulaq asmamış cavab verməməli, deyəcəyi fikri beynində bişirməmiş dilinə gətirməməli, ehtiyac olmadan sözü təkrar etməməlidir; ehtiyac üzündən təkrar lazım olduqda tərəddüd göstərməməlidir. Nəlayiq sözlər işlətməməli, dilini söyüşə öyrətməməli, zərurət üzündən ayıb kəlməyə ehtiyac yarandıqda onu obrazlı, məcazi ibarələrlə anlatmalı, şux və zərif ifadələrdən qaçmamalı, hər məclisə münasib danışmağı bacarmalıdır. Söz vaxtı əl-qolunu işə salmamalı, qaş-gözünü oynatmamalıdır. Belə hərəkətləri yalnız danışılan əhvalat tələb etdikdə nəzakətli və gözəl bir tərzdə göstərmək olar. Yalan, doğru üstündə məclisdə höcət etməməli; yalvar-yaxar təsir etməyən adama yalvarmamalı, münaqişə və mübahisədə rəqibin haqlı olduğunu gördükdə üstünlüyü ona verməlidir. Avam, uşaq, arvad, divanə və sərxoş adamların söhbətindən bacardıqca uzaq gəzməlidir. Başa düşməyən adama incə və üstüörtülü söz deməməli, danəşıqda nəzakətli olmalı, heç kəsin işini, sözünü, hərəkətini pis şəkildə onabuna çatdırmamalı, qorxulu şayiələr yaymamalıdır”. Şifahi xalq ədəbiyyatı nümunələrində, klassik, eləcə də müasir yazıçıların əsərlərində, maarifçilərin tərtib etdikləri dərslik və vəsaitdə Xaqani, Nizami, Nəsimi, Xətai, Füzuli, Vaqif, M.F.Axundov, S.Ə.Şirvani, C.Məmmədquluzadə, M.Ə.Sabir, C.Cabbarlı, S.Vurğun və başqaların\ın əsərlərində N.Tusinin “ƏxlaqiNasiri”, A.Bakıxanovun “Nəsihətnamə”, Mir Mövsüm Nəvvabın “Nəsihətnamə”, M.T.Sidqinin “Həkimanə sözlər”, M.S.Yusifzadənin “Ata-baba nəsihətləri” kimi didaktik yazılarda danışıq etikasına dair xalqın təfəkkür tərzindən, etik görüşlərindən yaranan qiymətli fikirlər, mülahizələr, nümunələr olduqca çoxdur, onların əksəriyyəti təkrarolunmazdır, orijinaldır. Lakin çox təəssüf ki, onlar tədqiq olunub oxucuların, xüsusilə bu sahə ilə məşğul olanların istifadəsinə verilməmişdir. Həmin nümunələr əsasında tarixən işlənib hansı səbəbdənsə arxaikləşən ifadələrin, nitq etiketlərinin bugünkü baxımdan yararlı və uyarlı sayılanları ortaya çıxarılsa, danışıqda işlədilsə, bu, nitqin etik normalarının zənginləşməsinə səbəb olardı. Nəzakətli danışıq, eləcə də onu tamamlayan hərəkətlər də başqa normalar kimi müəyyən sistemə malikdir. Bura nitqin müraciət, dinləmə, sualvermə, söhbətəqoşulma, suala cavabvermə, şad və bəd xəbəri çatdırma və s. qaydaları kimi komponentlər daxildir. Nəzakətli nitq, hərəkət, davranış mədəniyyətimizin çox mühüm amillərindəndir. Bu hərəkətlər şəxsiyyətlərarası münasibətlərin tənzimlənməsi, nizamlanması və inkişafında həmişə mühüm əhəmiyyət kəsb etmiş, insanların mədəniyyətinin və mənəviyyatının ümumi səviyyəsi haqqında təsəvvür yaratmışdır. Müstəqillik qazandığımız, adamların öz ana dilində ünsiyyət saxladığı indiki dövrdə nəzakətli danışıq qaydalarına əməl etmək xüsusilə vacib sayılır. Vətənimizi, ölkəmizi, xalqımızı sivil, mədəni bir ölkə, xalq kimi dünyaya tanıtmaqda digər amillərlə yanaşı, mədəni danışığın, yüksək nitq mədəniyyətinin də rolu böyükdür. Bu baxımdan respublikamızın prezidenti İ.Əliyevin çıxışları, nitqləri hamıya nümunədir. İ.Əliyev cənabları Avropa Şurası Parlament Assambleyasının 2004-cü il yay sessiyasının iclasında çıxış etdikdən sonra Şuranın sədri Piter Şuder dinlədiyi nitqlə bağlı demişdi: “Cənab Prezident, olduqca gözəl çıxışınıza görə sağ olun. Assambleya və Avropa Şurasına ünvanladığınız nəzakətli sözlərə görə sağ olun”. Adamlar həmişə, hər yerdə mədəni ünsiyyətinə, nəzakətli danışığına görə təqdir olunmuş, müsahibinin (və ya müsahiblərinin) nəzakətli sözləri, ifadələri ilə “mükafatlandırılmışlar”. Nitqin etik qaydalarından danışılarkən bu məsələ ilə bağlı olan, onu tamamlayan nəzakətli hərəkətlər barəsində də bəhs açmağa ehtiyac duyulur. Nəzakətli hərəkət, rəftar, davranış mənəviyyatımızın çox mühüm komponentlərindən biridir. İctimai-mədəni irsimizin nəsildən-nəslə keçən, qorunub saxlanılan davranış normaları, ənənələri şəxsiyyətlərarası münasibətlərin tənzim olunmasında, nizamlanmasında və inkişafında həmişə mühüm əhəmiyyət kəsb etmiş, korrekt davranış xalqın mənəviyyatının ümumi səviyyəsi haqqında təsəvvür yaratmışdır. İnsanlar nəzakətli hərəkətləri görmüş və əxz etmişlər. Bu hərəkətlərlə (böyük gələndə ayağa durmaq, nəqliyyatda və digər yerlərdə böyüyə, uşağa, qadına yer vermək, danışanı axıracan dinləmək, ictimai yerlərdə - məclisdə, süfrə başında, yığıncaqlarda özünü aparmağı bacarmaq, ağsaqqalların, valideynlərin yolunu gözləmək, böyüyün üzünə ağ olmamaq, əlilə, xəstəyə, şikəstə kömək etmək, salam vermək və salam almaq, böyük olan yerdə siqaret çəkməmək, yayılıb oturmamaq və s. hər kəs başqalarına hörmət etdiyini nümayiş etdirməyə çalışır. Adamların şüurluluğu və mədəni səviyyəsinin yüksəldilməsi, şəxsiyyətlərarası münasibətlərin inkişaf etdirilməsi, insanın əhvali-ruhiyyəsi, bunun əmək fəaliyyətinə təsiri və s. kimi məsələlər daima cəmiyyətin, dövlətin diqqət mərkəzində olmuşdur. Ölkə prezidenti İ.Əliyevin “Azərbaycan Respublikası Prezidenti yanında Vətəndaşlara Xidmət və Sosial İnformasiyalar üzrə Dövlət Agentliyinin yaradılması və dövlət orqanaları tərəfindən vətəndaşlara göstərilən xidmətlərin təkmilləşdirilməsi ilə bağlı tədbirlər haqqında” 2012-ci il iyulun 13-də imzaladığı sərəncamda göstərilən bağlı tədbirlər haqqında” 2012-ci il iyulun 13-də imzaladığı sərəncamda göstərilən xidmətlərin daha keyfiyyətli həyata keçirilməsi, vətəndaşlara münasibətdə etik qaydalara, nəzakətli davranışa

əməl edilməsi, vətəndaş məmnunluğunun təmin olunması, dövlət orqanları əməkdaşları üçün etik kursların təşkili, vətəndaşları qarşılama, dinləmə, izahetmə bacarığının yaradılması və təkmilləşdirilməsi məqsədilə treninqlərin həyata keçirilməsinin təşkili kimi məsələlər mənəviyyatımızın bu sahəsinin inkişaf etdirilməsi baxımından son dərəcə mühüm əhəmiyyət kəsb edir. “Doğrudan da, hamı bir-biri ilə nəzakətlə dolansa, bir-birinə qayğıkeşlik göstərib başqalarının suallarına diqqətlə cavab versə, məmnuniyyətlə bir-birinə hörmət və kömək etsə, xəstələri və qocaları çətinliklərdən qurtarmağa çalışsa, təsəvvür edin ki, yaşayış nə qədər asan və gözəl olar” (40, 32). Müraciət formalarından düzgün istifadə olunması. Azərbaycan nitq etiketində bir çox müraciət formaları vardır ki, onlardan yerində və düzgün istifadə nitq mədəniyyəti baxımından mühüm əhəmiyyət kəsb edir. İnsanlara müraciət məqsədilə işlədilən sözlər – xitablar dinləyənin diqqətini cəlb etmək, onu çağırmaq, nəyəsə sövq etmək, nədənsə çəkindirmək və s. məqsədi daşıyır. Qohumluq əlaqələrinə, yaşa, cinsə, ictimai mövqeyinə, vəzifəyə və sairəyə görə ümumiyyətin qəbul etdiyi sözlər (bunlara vokativ sözlər deyilir) müraciət olunanları razı salır, onları hərəkət etməyə, fəaliyyət göstərməyə sövq edir. İnsanlara edilən müraciət formaları müxtəlifdir, rəngarəngdir. Bunların bir qismi qohumluq münasibətini bildirən adlardır. Məsələn, ana, anacan, atam balası, atacan, qardaş, bacı, baba, anam-bacım, bala, bacıqızı, bacıoğlu, qardaş, oğlum, qızım, gəlinbacı, xalagəlini, qardaşoğlu, xala, xalaoğlu, qaqaş, bibi, bibiqızı, dayı, dayıcan, dayıoğlu, dayıqızı, əmi, əmioğlu, əmiqızı, əmican, Nərgizcan və s. Bu cözlərlə həm qohumlara, həm də yadlara müraciət olunur. Müraciət bildirən baş sözlərə “ay” vokativ sözü də əlavə olunur: ay dayı, ay bacı, ay qız, ay ana və s. Bu müraciət formalarının bir çoxu adlarla da işlənir. Məsələn, Səfər dayı, Həqiqət xala, İslam əmi, Sənəm bacı, Nadir əmi və s. Müraciət bildirən sözlərin digər qismi şəxsin cəmiyyətdəki mövqeyi, vəzifəsi, peşəsi, milli və yaş mənsubiyyətini, insanların qarşılıqlı əlaqə və münasibətini ifadə edir. Müəllim, həkim, sürücü, satıcı, mühəndis, biznesmen, fermer, direktor, dekan, müdir, professor və s. belə sözlərdəndir. “Müəllim” sözü ünsiyyətdə geniş şəkildə işlənən müraciət formasıdır. Bu söz iki şəkildə işlədilir: həm ayrı, həm də xüsusi vokativ sözlə - adlarla. Təlim-tərbiyə ilə məşğul olan adama, həm də rəsmiyyət və hörmət əlaməti olaraq digər sənət sahiblərinə (müəssisənin direktoru, nazirliyin işçiləri, hökumət rəhbərləri və başqalarına) müraciət zamanı müəllim sözü şəxs adı ilə işlədilir (məsələn, Aslan müəllim, Sərvər müəllim, Həsən müəllim və s.). Müəllim sözünün əvvəlinə cənab, yoldaĢ kimi sözləri artırıb, cənab müəllim, yoldaş müəllim də demək olar. Bütün bunlarla bərabər müəllim sözü öz ilkin “təlim edən, öyrədən” anlayışından uzaqlaşmamalıdır. Yeri gəlmişkən qeyd edək ki, “müəllim” müraciət formasından bəzən uyğun olmayan məqamlarda, yersiz istifadə olunur, işindən, peşəsindən və s. asılı olmayaraq istənilən adama bu adla müraciət edilir. Məsələn, ANS-in “İç xəbər” verilişlərində demək olar ki, hamıya “müəllim” deyə müraciət olunur.Sərnişin qatarında bələdçi işləyən Səfər adlı bir nəfərin mənzil problemi ilə bağlı məsələsi müzakirəyə çıxarılmışdı. Aparıcı “Səfər müəllim” deyə dəfələrlə ona müraciət edirdi. Belə uyğunsuz müraciət həmin sözün ehtiva etdiyi mənaya, məzmuna, şübhəsiz ki, xələl gətirir, tamaşaçını, dinləyicini narazı salır. Həkim, sürücü, satıcı kimi sözlər həm ayrılıqda, həm də ümumi vikativ sözlərlə (yoldaş, vətəndaş, cənab) işlənir: yoldaş həkim, cənab həkim, yoldaş sürücü, vətəndaş Elxan və s. Nazir, mühəndis, fermer, direktor, dekan kimi adlar təklikdə müraciət forması kimi işlədilmir. Onlara cənab, yoldaş1 sözlərindən biri əlavə olunur: cənab mühəndis, yoldaş direktor, cənab nazir, cənab dekan və s. “Rəis” ayrılıqda müraciət forması kimi işlənir. Bəzən fikir adamları arasında “ustad” müraciət formasından da istifadə olunur. Dinləyicilərə edilən müraciət formasının əvvəlinə əziz, əzizim, hörmətli, möhtərəm sözlərini də əlavə etmək olar. Məsələn, hörmətli Qabil, möhtərəm İsmayıl müəllim, əziz tələbələr, əziz dinləyicilər, hörmətli xanımlar və s. Ünsiyyət prosesində yaşca böyük adamlara, tanış olmayanlara (bəzən də qohum və tanışlara), vəzifə sahiblərinə, qadınlara və başqalarına “siz” deyə müraciət olunur. Bu hörmət və ehtiram formasını bəziləri rus etiketinin təsiri sayırlar. Halbuki “hələ XI əsrdə M.Kaşğari yazırdı ki, türklər özlərindən yaşca və vəzifəcə kiçiklərə sən, böyüklərə siz deyirlər (“Divan”, I c., “Daşkənd” nəşri, s.326). Azərbaycan yazılı abidələrində də bu diferensiallaşmanın tarix boyu mövcudluğunu təsdiqləyən faktlar istənilən qədərdir. Ona görə də müasir Azərbaycan etiketində “siz” müraciət formasının işlənməsi heç bir təsirin nəticəsi 1 “Yoldaş” sözü hazırda müraciət etiketləri sırasından çıxmaqdadır. Onun əvəzində vəzifəli şəxslərə “cənab” deyə müraciət olunur. deyil, əksinə, tam milli xüsusiyyətdir” (17, 166). Yuxarıda qeyd etdiyimiz situasiyalarda “sən” deyə müraciət olunması bütün hallarda adamlar tərəfindən onlara qarşı hörmətsizlik və nəzakətsizlik kimi qiymətləndirilir. Rus nitq etiketində “siz” ehtiram forması o qədər əhəmiyyət kəsb edir ki, çox zaman “sən” deyə müraciət edənlərə cavab belə verilmir. Rəhbər işçi əməkdaşlarla təmas zamanı “siz” müraciət formasını işlətməlidir. Həmçinin o, qadın işçilərinə adını bilirsə xanım əlavə etməklə (məsələn, Sona xanım, Ayna xanım və s.), bilmirsə elə sadəcə olaraq, “xanım” deyə müraciət etsə, qarşı tərəf razı qalar. Özündən yaşlı adamlara (bir qədər ağsaqqal sayılan adamlara) adı ilə müraciət etmək qəbahət sayılır. İctimai yerlərdə aşna, lələ, ay arvad, a gədə, qağa, canciyər və s. kimi müraciət formalarının işlənməsi başqalarına hörmətsizlik kimi qiymətləndirilməlidir. Məhəmməd Peyğəmbərin kəlamlarının birində göstərilir: “Kim birisini öz adı ilə deyil, onun xoşlamadığı bir adla çağırırsa, mələklər ona lənət oxuyur”. Yazıçı, publisist Həsən Mehdiyev öz xatirələrində yazırdı ki, “...

müsahibim mənə "qəqəni" deyə müraciət etdi. Bu sözün rayon yerində gədə-güdəyə, əl altında qalana deyildiyini bilirdim. Söz məni yaman bərk tutdu. Bir mülahizəyə görə özümü saxladım. Müsahib bunu hiss etdi, məndən üzr istədi" ("Musavat", 15 may 2001). Bu həyati misal müraciət formasının ünsiyyətdə, qarşılıqlı münasibətlərdə nə qədər əhəmiyyətli rol oynadığına əyani bir sübutdur. Müəllimlər şagird və tələbələrə adından başqa oğlum, qızım, bala, əzizim kimi sözlərlə də müraciət edə bilərlər. Valideynlər öz uşaqlarına müraciət edərkən gülüm, əzizim, gözümün işığı, quzum, oğlum, sonam, ceyranım, evimin yaraşığı, maralım, bülbülüm, canım-ciyərim, şəkərim, evim-eşiyim, dilbərim, qurban olduğum, ömrüm-günüm, qurban kəsim, başına dönüm, qadanı alım, qoçaq balam və s. kimi oxşama və əzizləmə mənalı söz və ifadələri işlətsələr, daha yaxşı olar. Əzizləyici can ünsürünün isimlərə qoşulması yolu ilə müraciət bildirən sözlər yaranır: məs.: anacan, xalacan, nənəcan, Orxancan və s. Qadınlara və kişilərə müraciət zamanı rəsmiyyət və hörmət əlaməti olaraq xanım, bəy, ağalar, xanımlar sözləri də işlədilir. Bu sözlərdən iki formada istifadə olunur: a) təklikdə, sadəcə olaraq xanım, bəy formasında; b) adlardan sonra. Məs.: Leyla xanım, Rəşad bəy və s. Adamların tez-tez işlətdikləri ağsaqqal, oğlum, qızım, eloğlu, elli, dədə, elqızı, bibi, nənə, qohum kimi müraciət formaları nəzakət və hörmət baxımından məqbul sayılır. Son zamanlar ağa, bəy, əfəndim müraciət formalarının işlənməsinə də təsadüf edilir. Ağa müxtəlif mənbələrdə mülkədar, bəy, zadəgan, sahib, böyük qardaş, əmi, ata, yaşlı, savadlı adamlara müraciət forması olaraq kişilərə aid edilmişdir. Bəzən mədəni ailələrdə bacılardan böyüyünə "ağa bacı" deyə müraciət olunma halı da mövcuddur. Tarixən hökmdar, başçı, hakim, böyüklük mənasını ifadə edən bəy sözü, titulu türk dillərində bek, bəy, biy, bey şəkillərində, əsasən, hakim təbəqəyə müraciət forması kimi işlənmişdir. Hazırda bəy formasından məsləkdaşlar bir-birinə müraciət məqsədlilə (çox geniş yayılmasa da) istifadə edirlər. Nitqdə hörmət əlaməti olaraq cənab, cənablarına, zati-aliləri kimi yeni müraciət formaları da işlənilir. Məsələn, cənab Şeyx, cənab səfir, cənab hakim və s. Qeyd: Nitq mədəniyyəti məsələləri ilə məşğul olan görkəmli dilçi alim H.Həsənov cənab və cənablarına müraciət formasını ünsiyyət üçün yararlı saymır. "Cənab və cənablarına sözünün müraciət forması kimi işlədilməsi xalqımızın milli müraciət və ənənəsinə zidddir. Bu, təqlidçilik, modabazlıq təsiridir, ənənəvi, milli müraciət formalarını unutdurur, onlara kölgə salır, ünsiyyət mədəniyyətini özgələşdirir". Amma nə etmək olar? Həsrət müəllimin özünün etiraf etdiyi kimi bu müraciət forması artıq dəbdədir. Xüsusən rəsmi məqamlarda (daha çox yazılı nitqdə) geniş şəkildə işlənilir. Müraciətlərdən, xitablardan televiziya, radio verilişlərində də istifadə olunur ki, tamaşaçının, dinləyicinin diqqətini cəmləşdirmək, verilən informasiyaya, göstərilən təsvirə, hadisəyə diqqətli olmaq məqsədini daşıyır. Ən əsası odur ki, bu xitablar xoş, lirik, ürəkaçan bir əhvali-ruhiyyə yaratmaq, səfərbəretmə, ruhlandırma, qürur və fəxr məzmunu bildirmək üçün ən zəruri nitq elementləridir. Onlardan bəzilərini nümunə kimi göstərək: əziz dostlar, əziz və hörmətli televiziya tamaşaçıları, hörmətli radio dinləyiciləri, əziz analar, bacılar və s.

Nitqi dinləmək bacarığına ictənilən səviyyədə sahib olmayan adamların başqasına qulaq asmağa səbri çatmır, yersiz replikalarla müsahibinin sözünü ağzında qoyur, başqaları ilə danışır, nə söylənilən fikri lazımi dərəcədə dərk edir, nə də digərlərinə bunun üçün imkan yaradır. Bir türk zərbi-məsəlində deyilir ki, qulaq asmaq lazım gələndə birinci, danışmaq lazım gələndə axırıncı ol. Nə qədər yerinə düşən kəlamdır.

Nitqə hər hansı bir münasibətlə müdaxilə edildikdə müsahibə "Bağışlayın", "Üzr istəyirəm", "İcazə verin", "bir dəqiqə" və s. kimi nəzakətli söz və ifadələrlə müraciət olunmalıdır. Müsahibin sözünü ağzında qoymaq, onun nitqini "Düz danışmırsan", "Səhv edirsən", "Gah nala, gah da mıxa vurursan", "Bir şeyi bilmirsən, danışma", "Vaxtımızı alma", "Bir az qısa elə" və s. replikalarla kəsmək nəzakətsizlik sayılmalıdır. Dinləmə zamanı əsnəmək, başqaları ilə söhbət etmək, tez-tez saata baxmaq, gözü yol çəkmək və s. kimi hallar məqbul sayılmır. Nitqi dinləmə xüsusi qabiliyyətdir. İnsanda bu keyfiyyət onun mədəni səviyyəsini müəyyənləşdirən əsas göstəricilərdəndir.

## Ədəbiyyat

1. Abdullayev A.S. "Nitq mədəniyyəti və natiqlik sənəti". Bakı, "Maarif", 1981
2. Abdullayev N.Ə., Mımmədova Z.T. "Müəllimin nitq mədəniyyəti". Bakı-2002
3. Abdullayev N., Məmmədova Z. "Nitq mədəniyyətinin əsasları". Bakı-2005
4. Həsənov H. "Nitq mədəniyyəti və üslubiyyatın əsasları". Bakı, 1999
5. Əliyev K. Nitq mədəniyyəti və üslubiyyatın əsasları. Bakı, 2001
6. Əliyev V. "Heydər Əliyev dil siyasəti". Bakı, 2003
7. Azərbaycan dilinin orfoqrafiya lüğəti. Genişləndirilmiş və yenidən işlənilmiş 6-cı nəşr. Bakı, Şərq-Qərb, 2013
8. Həsənzadə N, Pənahova G., Abbasov Ə. Azərbaycan dili və nitq mədəniyyəti (dərslik). Bakı, Ecoprint, 2016

**Rəyçi: dos. S.Hümbətova**

Göndərilib: 13.12.2020 Qəbul edilib: 14.12.2020

DOI: 10.36719/2663-4619/61/152-156

**Səidə Novruz qızı Quliyeva**
Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universiteti
ziko-ziya@mail.ru

# ARXİV SƏNƏDLƏRİNİN ELEKTRONLAŞDIRMA PROBLEMLƏRİ

***Açar sözlər:*** *arxiv, sənəd, qanunvericilik, informasiya, elektronlaşdırma*

## Problems of digitization of archival documents

**Summary**

In modern times, the digitization of archival documents is one of the most global problems in the field of archives. Modern sources of innovation in archival work are directly related to technological development in office work. Digitization of documents is the conversion of documents into electronic form. The main problems of electronic archives in modern times can be divided into several blocks. These include legal, organizational and technical issues. Sometimes there are appropriate technical solutions to problems, but they are not regulated by existing legislation. In modern times, the electronicization of archival documents remains the most pressing problem. Work is being done in this area both in our country and around the world.

***Key words:*** *archive, document, legislation, information, electrification*

## Giriş

Bu gün sənədlərin elektronlaşdırılması dedikdə biz yazılı materialların elektron maşınlar vasitəsilə, elektron ötürücülərə köşürülməsini başa düşürük. Lakin materialları köçürərkən, həmin materialların, sənədlərin baza məlumatlarını dəyişmək qəti surətdə qadağandır. Daha dəqiq desək həmin sənədlərin informasiya dəyərini dəyişmək olmaz. Müasir dövrdə arxiv sahəsində ən qlobal problemlərdən biri arxiv sənədlərinin elektronlaşdırılmasıdır.

Arxiv sənədlərinin elektronlaşdırılması yəni elektron arxivlərin yaradılmasının əsas fəaliyyət istiqamətləri vardır və bunlar aşağıdakılardır; informasiyanın saxlanmasının işlənmə prinsipləri, informasiyanın qorunması, məlumatların ikinci dərəcəli istifadəsinin aktivləşdirilməsi, məlumatların təsviri üçün meyarların standartlaşdırılması, daim arxivlə elektron maşınların fəaliyyətini nəzarətdə saxlamaq və s. (1 səh 260-261)

Arxiv işində müasir innovasiya mənbələri dəftərxana fəaliyyətində texnoloji tərəqqi ilə bilavasitə əlaqədardır. Postmodernizm arxiv işi və arxivşunaslıqda arxiv seçiminin köhnə metodologiyasının elektron formada qeydi və qorunması getdikcə daha geniş şəkildə tətbiq olunmağa başlayır. İstənilən informasiyanın emalına imkan yaradan komputer sistemləri bu informasiyanin transinformasiyasina, onun cəld axtarışına, istənilən məsafələrdən ötürülməsini həyata keçirir. Elektron qeydiyyat əvvəllər analoji texnologiyalara əlçatmaz olan bir sira prinsipal cəhətdən yeni vəzifələrin həllinə imkan verir. Bunlar aşağıdakılar aiddir;

1. elektron qeydiyyat
2. elektron texnologiyalar.

Müasir dövrdə elektron arxivlərin əsas problemlərini bir neçə iri bloka bölmək olar. Bunlara hüquqi, təşkilati və texniki problemləri aid etmək olar. Bəzən olur ki problemlərin uyğun texniki həlli mövcuddur, lakin bunlar qüvvədə olan qanunvericiliklə tənzimlənmir.

Sənədlərin elektronlaşdırılması, sənədlərin elektron formaya yazılmasıdır. Rəsmləri mətnləri və kitabları elektronlaşdırmaq olar. Hər hansı qurumda ofisdə gec tez çox sayda sənəd yığılır. Əlbəttə həmin sənədlər masa üzərində rəflərdə qalır. Bu da öz növbəsində çox yer tutur. Yığılan sənədlər kağız dağlarını xatırladır və bunların arasından tez bir zamanda lazımı sənədi tapmaq o qədər də asan deyil. Beləliklə işçilərin işini asanlaşdırmaq vaxta qənaət etmək üçün sənədlərin skan edilməsi butun sənədləri elektronlaşdırmaq və sənədlərin tanınması xidmətlərindən istifadə edərək kağızdan elektron formaya keçirmək lazımdır. Elektron sənədlərdən istifadə daha əlverişli və asandır. Elektronlaşdırılmış sənədlərin itməsi korlanması olmur və istənilən elektron arxivdən lazımı sənədi tapmaq olur. Hər hansı qurumun, eləcədə ofis işçisinin ezamiyyətdə olması da elektron arxiv sayəsində işin ləngiməsinə rəvac vermir. Cibimizdə olan balaca flaş kart və ya sürücü idarə ofis şirkət sənədlərinin bütün arxivini yerləşdirməyə qadirdir və lazım olduqda sizə lazım olan sənədi tez bir zamanda əldə etməyə imkan verəcək. Sənədləşdirmənin rəqəmsallaşdırılması günümüzün ən aktual məsələlərindən biridir. Elektronlaşdırma çox rahat və praktikdir. Sənədlərin elektronlaşdırılması xidmətləri kifayət qədər bahalı deyil bunu həm dövlət, həm də qeyri-dövlət müəssisələri edə bilər. (2 M- 2017)

Elektron arxiv sənədlərinin yaradılmasını bir neçə mərhələdə həyata keçirmək olar. Bunlara ilkin olaraq skan üçün sənədlərin hazırlanması - texniki təlimi (bu tikiş və kağız kliplərinin çıxarılmasından ibarətdir) və materialların sistemləşdirilməsi (məzmunla işi əhatə edir: xronoloji, quruluş, sənədlərin seçimi) aiddir.

İkinci sənədlərin elektronlaşdırılması mərhələsidir ki, burada qətnamə üçün texniki parametrlərin seçilməsi, nəticələrə qənaət etmək üçün bir formatın seçilməsi və qətnamə növü daxildir.

Üçüncü alınan məlumatların işlənməsidir. Bəzən elə sənədlər olur ki onlar heç də qənaətbəxş olmur bu səbəbdən həmin sənədlər əlavə işləmədən keçməlidir.

Sənədləri elektron vəziyyətə salmaq üçün xüsusi texnikadan avadanlıqdan skanerlərdən istifadə edilir. Bunlara sənaye, böyük formatlı, planetar, kitab skanerlərini göstərmək olar. Elektronlaşdırmadan sonra həmin sənədlərin orijinallara uyğunluğunu yoxlamaq lazımdır və bu vacib eləcədə vaxt aparan bir prosesdir, çünki bəzi sənədlərdə komputerin tanımadığı zədələr, əyilmələr ola bilər. Bu səbədən bu işi diqqətlə həyata keçirmək lazımdır.

Arxivlərdə elektron sənədlərin qorunmasının təşkili üzrə dünya təcrübəsi bu sahədəki bəzi mühüm xüsusiyyətlərin olduğunu üzə çıxardıb. Bu sahədəki ən mühüm məqamlardan biri ənənəvi kağız arxivlərindən fərqli olaraq, elektron arxivlərdə əsas diqqət təsdiqlənmiş nüsxələrin saxlanmasına yönəldilir. Kennet Tibode, Lyuciana Dyurati kimi dünyanın aparıcı ekspertləri elektron mühitdə sənədin uzun müddət qorunmasının mümkün olmadığını qeyd ediblər. Müasir dövrdə arxiv sənədlərinin elektronlaşdırılması ən aktual məsələ olaraq qalmaqdadır. Bu sahədə həm ölkəmizdə, həm də dünya təcrübəsində işlər aparılır Arxivşünaslıqda müasir innovasiya mənbələri dəftərxana fəaliyyətində texnoloji tərəqqi ilə bilavasitə bağlıdır. Postmodernizm arxiv və arxivşünaslıqda arxiv seçiminin köhnə metodologiysı və praktikasına etiraz olaraq yeni çağırışlar edir. Arxiv informasiyasının elektron formada qeydi və qorunması getdikcə daha geniş şəkildə tətbiq olunmağa başlayır. İstənilən informasiyanın emalına imkan yaradan kompyüter sistemləri bu informasiyanın transformasiyasına, onun cəld axtarışına, istənilən məsafələrdən ötürülməsini həyata keçirir. Elektron qeydiyyat əvvəllər analoji texnologiyalara əlçatmaz olan bir sıra prinsipial cəhətdən yeni vəzifələrin həllinə imkan verir. Bunlar aşağıdakılardır:

elektron qeydiyyat informasiyanın keyfiyyətinə xələl gətirmədən çoxsaylı şəkildə ötürülməsinə imkan yaradır, yəni informasiyanın bir daşıyıcıdan digərinə köçürülməklə (miqrasiyası) əbədi olaraq mühafizəsini mümkün edir. Lakin analoji rejim bir daşıyıcıdan digərinə köçürülmə mərhələlərdə informasiyanın itirlməsi kimi mənfi hallara da gətirib çıxara bilər. Bu prosesdə məlumatların köçürülməsi prosedurasına ciddi əməl olunmalı, hazırkı sənədin siyahılardakı yerləşdiyi yerlərində uyğun dəyişiklik aparılmalıdır. Bu da avtomatik rejimdə bir necə dəqiqə ərzində həyata keçirlir:

elektron texnologiyalar öz fiziki mahiyyətinə görə müxtəlif siqnalları-rəngli və ağ-qara təsvirlər, filmlər, səslər (musiqi, nitq). və s. buna bənzərləri elektron daşıyıcılarda qeydə alamağa imkan yaradır. Bir neçə informasiya növünün bir sistemdə birləşdirməyə imkan yaratdı, belə sistemlər "multimedia" adını aldı;

elektron qeydiyyat qeyri-xətli oxunuşa imkan yaratmışdır, yəni multimedianın informasiya massivindən ayrıca sənədin, sətirlərin, təsvir detallarını əks etdirən seçilmiş informasiya ilə (gipermedia) tanışlığı təmin edir;

kompyüterlər skayner texnikasını daimi təkmilləşdirməklə informasiyanın təcili nəşrini mümkün edir. Elektron skaynetmə müxtəlif keyfiyyətdən olan informasiya yazısının (qüsurlu, zəifkontrastlı) skaynını həyata keçirir.

Lakin elektron daşıyıcıların uzunömürlüyünün aşağı səviyyəsi və bu daşıyıcıların özünün və avadanlıqlarının tez-tez bərpasına olan tələbat arxiv mühafizəsi təcrübəsi ilə az vəhdət təşkil edir. Ona görə də arxivlərdəki informasiyanın, hər iki formada-həm elektron, həm də analoji görkəmdə saxlanılmalıdır. Ona görə də informasiyanın eyni vaxtda iki nüsxədə, həm elekton, həm də mikrofilmdə təqdimi məsləhətdir. Elektron informasiya operativ istifadə üçün qorunacaq. Hazırda elektron nüsxənin mikrofilmlə birgə cəld edilməsini mümkün edən yeni texnologiya hazırlanmaqdadır ki, bu da arxivlər üçün çox vacibdir. Bu yolla gələcəkdə sənədlərin yenidənistehsalını əvvəlkilərdə olduğu kimi uzunmüddətli qorunması və istifadə vəzifələrini təmin edir. Yəni əvvəllərdə olduğu kimi indi də sənəd iki funksiyanı-informasiyanın qorunması və kommunikasiya vasitəsi olmasını həyata keçirəcəkdir. (3 səh 36)

Müasir dövrdə elektron arxivlərin əsas problemlərini bir-neçə iri bloka bölmək olar. Bunlara hüquqi, təşkilati və texniki problemləri aid etmək olar. Bəzən olur ki, problemlərin uyğun texniki həlli mövcuddur, lakin bunlar qüvvədə olan qanunvericiliklə tənzimlənmir. Xüsusilə, gücləndirilmiş elektron imzalı sənədlərin hüquqi əhəmiyyəti bu qəbildən olan problemlərdəndir. Bu nöqteyi-nəzərdən həmin istiqamət üzrə normativ-hüquqi bazanın olması aktuallıq kəsb edir. Elektron arxivlərin yaradılması və bunlardan səmərəli şəkildə istifadə məqsədilə, təkcə lazımi avadanlıqların, proqram təminatının, bunlara uyğun kadraların seçilməsi ilə kifayətlənmməli, həmçinin bir sıra mühüm məsələlərin həllində vacib rol oynayan və bu məslələrin

nizamlanmasını həyata keçirən uyğun normativ-hüquqi və metodiki baza da yaradılmalıdır. Bu normayiv-hüquqi baza aşağıdakı məsələlərin həllində mühüm rol oynayır:

elektron sənədlərin uzunömürlüyünün, onların bütövlüyü, autentliyinin təminatı;

arxiv fondlarına əlyetərliyin və onlardan istifadəyə;

Əsas vəzifə ilk növbədə arxivlərin konversiya prosesləri, elektron sənədlərinin miqrasiyası ilə bağlı olan müəyyən texniki qərarların tətbiqinin leqallaşdırılmasıdır. Qanunvericilik səviyyəsində nizamlanan əsas məsələlər sırasına aşağıdakılar daxildir:

arxivin elektron sənədlərin konversiya və miqrasiyasının keçirilməsində, konversiya və miqrasiya nəticələrinin orijinalla uyğunluğuna şahidlik hüququ;

miqrasiya olunmuş arxiv sənədlərinin sənədin əsilləri ilə hüquqi gücünün tanınması;

elektron sənədlərin qorunması üzrə xidmət göstərən etibarlı sayılan üçüncü tərəfin fəaliyyətinin hüquqi əsasları;

elektron arxivin komplektləşdirmə təşkilat-mənbənin sənədləşdirmə təminatı xidmətləri ilə qarşılıqlı fəaliyyətinin hüquqi çərçivələri (məsələn, iş və sənədlərin dövlət mühafizəsinə verən arxivlərin hüquqları);

Aşağıdakı məsələlərin işıqlandırılmasını mümkün edən normativ və metodiki sənədlərin hazırlanması da lazımdır:

elektron sənədlərin işgüzar informasiya sistemlərində və elektron sənəd dövriyyəsi sistemlərində qorunması qaydaları (həm dövlət orqanları, həm də kommersiya təşkilatları, şəxsi arxivlər üçün);

sənədlərin operativ qorunma xüsusiyyətlərini müəyyən edən qaydalar;

təşkilat və dövlər arxivlərində elektron arxiv sənədlərinin idrəolunmsı üsusiyyətləri;

təşkilatların fəaliyyətinin fasiləsizliyinin təmini üçün vacib sayılan ən mühüm sənədlərin seçilmə və mühafizə xüsusiyyətləri;

müasir texnologiylardan istifadə edilməklə (saytsız, portallarsız və s.) yaranmış elektron obyektlərin sənədləşdirilməsi və qorunması xüsusiyyətləri;

Arxivlərdə elektron sənədlərinin qorunmasının təşkili üzrə dünya təcrübəsi bu sahədəki bəzi mühüm xüsusiyyətlərin olduğunu üzə çıxardıb. Bu sahədəki ən mühüm məqamlardan biri daşıyıcısı kağız arxivlərdən fərqli olaraq elektron arxivlərdə əsas diqqət təsdiqlənmiş nüsxələrin saxlanılmasına yönəldilir. Elektron arxiv mütəxəssisləri elektron sənədlərin ilkin variantında saxlanılmasının mümkünsüzlüyünü etiraf edirlər. Kennet Tibode, Lyüçiana Dyüranti kimi dünyanın aparıcı ekspertləri elektron mühitində sənədin əslinin uzun müddət qorunmasının mümkün olmadığını çoxdan qeyd etmişlər. Kennet Tibode öz nöqteyi-nəzərini belə qeyd etmişdir:" Ciddi şəkildə desək, elektron sənədin uzun müddət qorunması mümkün deyil. Elektron sənədin yenidən yaradılması, yəni surətinin çıxraılması qabiliyyətini saxlamaq olar. Eyni nöqteyi-nəzərə L.Dyüranti də tərəfdar çıxır. Elektron sənədlərin qorunması zamanı onların bütövlüyü və oxnunaqlığının daimi nəzarətdə saxlanılması zərurəti ortalığa çıxır. Bunların ardıcıl olaraq konversiyası (digər formatlara köçürülməsi) və miqrasiyasını (yeni daşıyıcılara, yaxud da informasiya sistemlərinə köçürülməsi) həyata keçirilməsi tələb olunur.

Şərq.az 2016-cı il internet saytında Dilavər Əzimlinin və Fəzail İbrahimlinin arxiv sənədlərinin elektronlaşdırılması ilə bağlı qeyd etdikləri fikirlər olduqca önəmlidir. Beləki- Dilavər Əzimli: "Demək olar ki, bizim institutda arxiv sənədlərinin müəyyən hissəsi elektronlaşıb" Fəzail İbrahimli: "Bu proses zamanla öz həllini tapacaq. Bir günün, iki günün işi deyil axı!" kimi fikirlər bildirmişdilər.

Arxiv sənədlərinin elektronlaşdırılması artıq bir sıra dövlət və özəl müəssisələrdə reallaşdırılıb və uğurlu nəticələr əldə olunub. Bu sistemin tətbiqi şirkətlərdə və idarələrdə bütün növ cari və köhnə sənədlərin elektronlaşdırılması ilə onlara vahid mərkəzdən nəzarət etmək imkanı yaradır. Elektron mühitə köçürülmüş bütün sənədlər müvafiq qovluqlara yerləşdirilir və xüsusi proqramtəminatı vasitəsilə idarə olunur.

Arxiv sənədlərinin elektronlaşdırılması uzunmüddətli araşdırma prosesinin minimuma endirilməsi və sənədlərin təhlükəsizliyinin təmin olunmasına gətirib çıxarır. Bütün sənədlərin indeksləşdirilməsi ilə sənədlərin koordinasiyası və bütünlüyünün asanlıqla yoxlanılmasını asanlaşdırır. Bu isə nəticə etibarı ilə çox sayda sistemləşdirmənin mümkünlüyünə (mərkəzi, regional və yerli mərkəzlər) səbəb olur. Artıq bütün dünyada bu sistem tətbiq olunur. Amma nədənsə, ölkəmizdə arxiv sənədlərinin elektronlaşdırılması prosesi ləng gedir. Məsələnin kifayət qədər aktual və vacib olduğunu vurğulayan Azərbaycan Milli Elmlər Akademiyasının Tarix İnstitutunun əməkdaşı, tarixçi-alim Dilavər Əzimli Tarix İnstitutunda artıq bu prosesin başlanıldığını deyib: "Demək olar ki, bizim institutda arxiv sənədlərinin müəyyən hissəsi elektronlaşıb. Sevindirici haldır ki, Axundov Azərbaycan Milli Kitabxanası və Elmlər Akademiyasının kitabxanasında da elektronlaşma prosesi gedib. Hətta bildiyim qədəri ilə arxiv idarələrində də elektronlaşma sahəsində addımlar atılmaqdadır, amma bu proses daha da

sürətləndirilməlidir. Türkiyədə, Avropa ölkələrində bu proses tam təkmilləşdirilib. Kompyuter vasitəsilə istənilən sənədi tapıb, sifariş vermək olar. Çox ucuz qiymətə mən Türkiyənin Baş Bakanlıq arxivindən saysız sənədlər gətirmişəm". Əhəmiyyətli arxiv sənədlərinin əldən-ələ dəydikcə zədələndiyini, korlandığını deyən tarixçi-alim hesab edir ki elektronlaşmanın sürətlənməsi sənədlərin mühafizəsi üçün də vacibdir.

Tarixçi, millət vəkili Fəzail İbrahimli isə deyib ki, sovet dövrü ilə müqayisədə indi arxiv sənədlərini əldə etmək daha asandır: "Mən namizədlik və doktorluq dissertasiyalarımı yazan zaman arxivlərdə çox böyük əziyyətlər çəkmişəm. Amma indi elə deyil axı. Müstəqillik illərindən üzü bu yana arxivlərimiz təpədən-dırnağa yenilənib. Həm təmir-tikinti işləri, həm də sənədlərin qorunması istiqamətində əhəmiyyətli addımlar atılıb. Dünyanın bütün ölkələrindən Tarix İnstitutuna, dövlət arxivinə arxiv sənədləri gətirilir. Həmin sənədlərin elektronlaşdırılması isə tədrici bir prosesdir və zamanla öz həllini tapacaq. Bir günün, iki günün işi deyil axı! Əsas odur ki, proses başlanılıb və müəyyən nailiyyətlə də əldə olunub. Güman edirəm ki, yaxın illər ərzində proses tamamlanacaq". Azərbaycanı Türkiyə və Avropa ölkələri ilə müqayisə etməyin düzgün olmadığını vurğulayan millət vəkili deyib ki bizim müstəqilliyimizin cəmisi 25 yaşı var. Türkiyə isə 1923-cü ildən müstəqil olduğu üçün arxiv sənədlərinin elektronlaşdırılmasının təkmil formada olması təbiidir (4)

Borje Justrellin araşdırmasına əsasən arxiv sənədlərinin elektron formaya salınması bu gün arxivşunaslıq elminin ən önəmli məsələsidir beləki o qeyd edir ki II dünya müharibəsindən sonra olan sənədlər bir yerə toplanmalı və elektron formaya salınmalıdır. Məqsəd müasir texnologiyanın üstünlüklərindən istifadə edərək tarixi elmi məlumatların gələcək nəsillərə ötürülməsidir.(5 səh 93)

Elektron sənədlərin hansı formata köçürülərək saxlanılması da mühüm məsələlərdən biridir. Uzunmüddətli saxlanılma üçün elektron arxivlərin daha çox açıq formatlarda istifadəsi məqsədəuyğun sayılır. Bu sənədlərin kim tərəfindən riv formatlarına köçürülməsi də mühüm əhəmiyyət kəsb edir. Hazırda bu məsələ müxtəlif cür həll olunur, xarici ölkələrin təcrübəsinin gösttərdiy kimi, bu işin həlli milli arxiv xidmətinin statusundan da çox asılıdır.

Elektron arxivlərin təşəkkülü və istismarının yeni istiqamət olmasına baxmayaraq, onun özünün əsaslı sənədi mövcuddur. Əsaslı sənəd 2003-cü ildə qəbul edilmiş OAİS adlı standartdır və bu da elə həmin ildə qəbul edilmiş "Kosmik məkan haqqında məlumat və informasiyanın ötürülməsi sistemləri" Etalon model adlı beynəlxalq standartdan başqası deyildir. Bu standart kosmik məlumatların emalı üzrə Məsləhət Komitəsinin geniş elmi birlik və qrupu tərəfindən işlənilmişdir. Bu standart açıq interfeysdən və dərindən içlənilmiş sənədləşdirilmiş formatlardnn istifadəni tövsiyə edir. Standart açıq arxiv informasiya sisteminin etalon modelini təqdim edir. Onun məqsədi-informasiyanın elektron eləcə də fiziki strukturunun arxivləşdirilməsi üçün standartlaşdırılmış sisteminin yaradılmasından ibarətdir (6 / 2019)

Bu gün əlbəttə informasiya dəyəri olan elmi, tarixi, siyasi, həyati əhəmiyyət kəsb edən sənədlərin elektronlaşdırılması vacibdir və vacib olduğu qədərdə məsuliyyətli çətin işdir. Buna həm zaman lazımdır, həm də İKT bacarıqları olduqca yüksək olan mütəxəssislər cəlb olunmalıdır və onlar bilməlidirlər ki, hər hansı məsuliyyətsiz yanaşma həmin sənədinin əslinin düzgün informasiya verməməsinə səbəb ola bilərlər.

Elektron arxivlərin yaradılmasının əsas məqsədləri informasiyaxidmətinin keyfiyyətinin yüksəldilməsi informasiya xidmətləri nomenklaturasının istənilən növ və mövzulu informasiyadan istifadənin genişləndirilməsi elektron resurslara keçid zamanı istifadəçilərin sayının artırılmasıdır. Sonuncu aşağıdakı üsullar vasitəsilə həyata keçirilir

- İstənilən növ informasiyadan istifadənin təmin olunması
- İnformasiya ötürücüləri və alıcıların dairəsinin genişləndirilməsi
- Fiziki və ya soial əngəlli istifadəçilərin informasiya almasına məhdudiyyətlərin aradan qaldırılması
- İnformasiyanın istənilən yerə o cümlədən iş masasına və ya evə çatdırılması imkanlarının genişləndirilməsi və s.

Müasir həyatımız informasiya cəmiyyətidir.Bu səbəbdən də insanlığa aid informasiyanın müəssisələrdə yerindəcə elektron formaya salınması daha məqsədə uyğundur. Bir sıra dünya ölkələrində bu proses getməkdədir ümid edirəm ki ölkəmizdədə elektron arxivlərin yaradılması sahəsində olan problemlər yaxın gələcəkdə öz düzgün həllini tapacaq və bu sahədə Azərbaycan Respublikasının Prezidentinin 2020-ci il 12 fevral tarixli Sərəncamı ilə təsdiq edilmişdir Azərbaycan Respublikasında arxiv işinin inkişafına dair 2020-2025-ci illər üçün DÖVLƏT PROQRAMI qəbul olunub. (7. Bakı 2020)






Sənədə əsasən, məqsəd arxiv işi sahəsində həyata keçirilən islahatların davamlılığını, dövlət arxiv təşkilatlarının fəaliyyətinin təkmilləşdirilməsini, cəmiyyətdə arxiv işinin rolunun və arxivçi peşəsinin nüfuzunun artırılmasını, Milli Arxiv Fonduna aid sənədlərin toplanmasını, sistemləşdirilməsini, dövlət mühafizəsinə daimi qəbulunu, qeydiyyatını və onlardan səmərəli istifadəni təmin etməkdir. Proqramın əsas istiqamətlərindən biridə məhz elektronlaşdırmaya şamil olunub. Bu proqramın 6.2.6-cı bəndində arxiv işində İKT tətbiq etməklə vahid elektron arxiv məlumat sisteminin yaradılması da göstərilib arxiv işinin İKT tətbiq etməklə modernləşdirilməsi, müasir tələblər səviyyəsində qurulması, Milli Arxiv Fondu sənədlərinin rəqəmsallaşdırılması, vahid elektron arxiv məlumat sisteminin yaradılması və onun dövlət informasiya ehtiyatlarına və sistemlərinə inteqrasiyasının təmin edilməsi və Milli Arxiv Fondu sənədlərinin rəqəmsallaşdırma yolu ilə etibarlı mühafizəsinin təşkili. Bunun kimi vacib proqramların qəbulu günümüzün aktual problemlərinin həllində öz həllini qısa zamanda tapacaq.

## Nəticə

Arxiv sənədlərinin elektronlaşdırılması bu gün nəinki ölkəmizdə, həm də dünyada ən aktual məsələrdən biridir. Bu sahədə ixtisaslı kadrların olması işin həllini daha da asanlaşdırır. Bir sıra dünya dövlətlərində sənədlər yerindəcə elektronlaşdırılır və bu da vaxta qənaət edilməsi baxımdan uğurlu adddımdır. İstər dövlət, istərsə də özəl müəssisələrdə əlbəttə sənədlərin mikro elektron daşıyıcılara ötürülməsi lazımı informasiyanın lazımı vaxtda tez və sürətli əldə edilməsinə şərait yaradır. Əgər arxiv sənədləri elektron formada olarsa, axivə müraciət etmiş şəxs uzun müddət sənəd yığının içində vaxt itirmədən ona lazım olan sənədi qısa zaman çərçivəsində elektron formada əldə edə bilər. Bu işdə əsl məqsəd zamandan səmərəli istifadə etməkdir.

## Ədəbiyyat

1. Алексеева Е.В., Афанасьева Л.П., Бурова Е.М. Архивоведение: учебник / 2005 (səh. 260-261)
2. İ.E.Xvorova. Moskva-2017
3. Azərbaycan Respublikası Dövlət arxivlərinin əsas iş qaydaları. Bakı-2011
4. https://sherg.az/x%C9%99b%C9%99r/22354/
5. Borje Justrell Arşiv bilimi nedir İsatanbul 2017 səh 93
6. Codibly-in Blogunda məqalə 2019
7. Xalq qəzeti. Bakı-13 fevral 2020

**Rəyçi: dos. İ.Səfərova**

Göndərilib: 14.12.2020 Qəbul edilib: 16.12.2020

DOI: 10.36719/2663-4619/61/157-161

**Aytac Vüqar qızı Qurbanova**
Bakı Dövlət Universiteti
aytaqurbanova@gmail.com

# AZƏRBAYCAN RESPUBLİKASININ MALİYYƏ SİSTEMİ VƏ ONUN ANLAYIŞI

***Açar sözlər:*** *maliyyə, maliyyə sistemi, maliyyə sisteminin həlqələri, dövlət maliyyəsi,müəssisə və təşkilatların maliyyəsi.*

## Financial system of the republic of Azerbaıjan and its concept

**Summary**

The financial system is a set of separate links of interaction and interacting financial relations. The distribution, formation and use of cash funds are carried out through the financial system. The financial system includes financial institutions that serve to regulate the country's financial activities and money circulation. This article clarifies the concept and essence of the financial system of the Republic of Azerbaijan and provides examples from foreign financial systems for comparison.

***Key words:*** *finance, financial system, rings of the financial system, public finance, finance of enterprises and organizations*

## Giriş

İqtisadi elmi mənbələr “maliyyə” anlayışının latınca “finantio” – “ödəmə” sözündən törədiyini təsdiqləyir və ilk dəfə XVI əsrdə Fransada pul fondlarının yaradılması və istifadə olunması ilə bağlı işlənildiyi söylənilir. Bəzi mənbələrdə isə, bu anlayışın ilk dəfə XIII-XV əsrlərdə İtaliyanın ticarət-bank mərkəzləri hesab olunan Venesiya, Genuya, Florensiya şəhərlərində sərraflarla tacirlər arasında qarşılıqlı pul münasibətlərini tənzimləmək aləti kimi tətbiq olunduğu göstərilir.' Lakin leksikonumuzda işlətdiyimiz “maliyyə” sözü “mal” (var-dövlət) şumer kökündən törəmiş, ərəb xilafəti dövründə aidiyyət bildirən “iyyə” şəkilçisi ilə tamamlanmış və azərbaycanca “pul yığma” (var-dövlət və ya sərvət toplama) mənasında işlə- nir. 2 Qədim dövrlərdə maliyyə, əsasən, şahın xəzinəsinin yaradılması ilə bağlı münasibətləri əhatə etmişdir. [1, s. 11-12] Maliyyə haqqında hələ Nəsrəddin Tusi özünün “Maliyyə traktovkasi” əsərində geniş məlumat vermişdir. Sonradan bu anlayış digər müəlliflərin də əsərlərində tez-tez işlədilmiş və nəhayət beynəlxalq status almışdır. [2, s.8]

Dövlətin və əmtəə-pul münasibətlərinin meydana gəlməsi ilə əlaqədar olan maliyyə münasibətlərindən XIII-XV əsrlərdə İtaliyanın Florensiya, Venesiya, Genuya kimi iri şəhərlərində istifadə olunmağa başlanmışdır və maliyyənin zəruriliyi dedikdə əsasən aşağıdakı amillər nəzərdə tutulur: 1. Dövlətin mövcudluğu. Ona görə ki, cəmiyyəti idarə etmək üçün dövlətin olması vacibdir. Dövlət də bildiyimiz kimi, idarəçilik, təsərrüfatçılıq, müdafiə və s. kimi çoxsaylı funksiyalar yerinə yetirir. Belə aydın olur ki, onları gerçəkləşdirmək üçün idarəçilik subyekti olan dövlətin əlində müəyyən maliyyə vəsaiti cəmləşməlidir. Dövlətin yarandığı ilk dövrlərdə həmin vəsait natural yığımlar hesabına əldə edilirdi. Cəmiyyətin təkamülü və idarəetmənin mürəkkəbləşməsi prosesində dövlət gəlirləri, xərcləri, bütövlükdə maliyyə münasibətləri meydana gəlməyə başladı. 2. İkinci məqam odur ki, cəmiyyətin inkişafı maliyyə münasibətlərinin inkişafı ilə müəyyən olunur. Maliyyə münasibətlərinin inkişaf etdiyi, onların mütərəqqi metodlarından istifadə olunan cəmiyyətdə iqtisadi və sosial inkişaf da yüksək olur. ABŞ, Fransa, Almaniya, İtaliya Yaponiya və s. bu ölkələr sırasındadır. [3, s. 7]

Maddi məzmununa görə maliyyə dövlətin və bələdiyyələrin, habelə, idarə, müəssisə və təşkilatların pul vəsaiti fondudur. İqtisadi münasibətlər kimi, maliyyə dedikdə, iqtisadi və sosial ehtiyacların təmin edilməsi üçün zəruri olan, dövlətin və bələdiyyələrin, müəssisə, idarə və təşkilatların pul vəsaiti fondlarının yaradılması, bölüşdürülməsi və istifadə olunması prosesində yaranan ictimai münasibətlər kimi başa düşülməlidir. Maliyyə dövlətin öz vəzifə və funksiyalarını həyata keçirməsi üçün tətbiq etdiyi bir iqtisadi mexanizm olmaqla. Ümumi Daxili Məhsulun və Milli Gəlirin bölüşdürülməsi və yemdən bölüşdürülməsi mexanizmi, habelə istehsal və ictimai tələbatların ödənilməsi üzərində həm də nəzarət vasitəsidir. [1, s.12-13]

Maliyyəni müxtəlif kateqoriyalara ayırırlar. Məsələn, subyektlərinə və onların məqsədlərinə görə: 1) dövlət (kütləvi) maliyyəsi – pul formasında ifadə olunmuş və dövlət funksiyalarının yerinə yetirilməsi üçün ümumi daxili məhsulun bölüşdürülməsinə, eyni zamanda formalaşdırılmasına istiqamətlənmiş iqtisadi münasibətlər toplusudur; 2) şəxsi (xüsusi) maliyyələr - təsərrüfat subyektləri səviyyəsində maliyyə resurslarının formalaşdırılmasını, eyni zamanda idarəetməsini təmin edən və daha çox pulla bağlı olan

iqtisadi münasibətlər toplusudur. Əməliyyatların həyata keçirilmə sferasına görə: 1) daxili maliyyə-maliyyə münasibətləri subyektlərinin vətəndaşlığı ilə məhdudlaşmışdır. 2) xarici maliyyə - müxtəlif ölkələrin maliyyə münasibətləri subyektlərinin iştirakını nəzərdə tutur.

Xarici iqtisadi fəaliyyətin maliyyəsi ayrı-ayrı ölkələrin, həmçinin onların subyektlərinin xarici maliyyə əməliyyatlarında üstünlükləri, çatışmazlıqları nöqteyi-nəzərdən iştirakı ilə və bir qayda olaraq, həmin ölkənin ərazi sərhədləri çərçivəsində nəzərdən keçirilir. Beynəlxalq maliyyə münasibətləri müxtəlif ölkələrin, eyni zamanda onların subyektlərinin beynəlxalq maliyyə bazarlarındakı maliyyə əməkdaşlığını nəzərdə tutur, öz maliyyə maraqlarını müdafiə edən müxtəlif ölkə qruplarının yaradılma imkanını nəzərdə tutur. Dünya maliyyəsi beynəlxalq maliyyə təşkilatlarında və koalisiyalarda müxtəlif ölkələrin iştirakı zamanı onların maliyyə cəhətdən qarşılıqlı təsir xüsusiyyətlərini – həm millidən üstün statusa (dünyəvi və ya regional), həm də tövsiyə statusuna malik olan xüsusiyyətləri meydana çıxarır. [19]

Maliyyə sistemi anlayışı «maliyyə» anlayışının məntiqi davamıdır. Maliyyə xalis gəlirin bölüşdürülməsi və yenidən bölüşdürülməsi ilə və dövlət funksiyalarının, genişləndirilmiş təkrar istehsalın yerinə yetirilməsi üçün istifadə olunan mərkəzləşdirilmiş və mərkəzdənqaçan fondların formalaşdırılması ilə bağlı pul münasibətlərini əks etdirir. Maliyyə sistemi, bütöv bir kateqoriya kimi bir-birilə qarşılıqlı əlaqəli olan müxtəlif maliyyə institutlarının (həlqələrinin) məcmusundan ibarətdir. Maliyyə institutlarının (həlqələrinin) köməyi ilə dövlət pul vəsaitlərini toplayır, bölüşdürür və xərcləyir. Maliyyə özlüyündə ’’fondlar sistemi və hüquq institutları sislemidir”. Hüquq institutları sistemi pul vəsaiti fondlarını təmin edir. [1, s. 16]

Biz qeyd edə bilərik ki, maliyyə sistemi maliyyə siyasətinin həyata keçirilməsinin bir formasıdır. Elmi və tədris-metodiki ədəbiyyatlarda '"maliyyə sistemi“ anlayışının müəyyən edilməsinə müxtəlif yanaşmalar mövcuddur. Yəqin bu onunla əlaqədardır ki, əsas anlayış olan “sistem" çox əhəmiyyətə və çalarlara malikdir. Lüğətlərdə və digər mənbələrdə sistem dedikdə “müəyyən hərəkətlərin qarşılıqlı əlaqəsində nizamhhq", “təşkilatların forması", “struktur şəklində yerləşən və qarşılıqlı əlaqəli hissələrin vəhdəti", “cəmiyyətin quruluş formıası", “vəzifələri eyni olan təşkilatlar və ya müəssisələr birliyi“ başa düşülür [5, IV cild, s. 509].

“Maliyyə sistemi” anlayışına əsasən ya “təşkilatların forması", ya da “təşkilatların məcmusu" kimi baxılır. Məsələn, Y.V.Sokolov maliyyə sistemini öz xidmətlərini firmalara, vətəndaşlara, habelə dövlətə təqdim edən bir sıra idarələrin və bazarların məcmusu kimi müəyyən edir. Məşhur iqtisadçı L.A.Drobozina hesab edir ki, maliyyə sistemi-dövlətin və müəssisələrin pul vəsaitləri fondlarının yaradılması, bölüşdürülməsi və istifadəsinin forma və metodları sistemidir [9, s. 55]. Professor A.Q.Qryaznovaya və E.V.Markinaya görə, maliyyə sistemi öz aralarında qarşılıqlı əlaqədə olan maliyyə münasibətləri sferaları və həlqələrinin məcmusu kimi müəyyən edilir. [10, s. 29]. Maliyyə sisteminin “maliyyə münasibətləri sferasının", "maliyyə münasibətləri", “idarə və bazarların" məcmusu kimi müəyyən edilməsi o qədər də dəqiq deyildir, ona görə ki, göstərilən yanaşmalar sistemə qoyulan tələbə tam cavab vermir. Yuxarıda deyilənlərdən fərqli olaraq V.V.Kovalyova maliyyə sistemini təkrar istehsal prosesinin bütün subyektləri arasında məcmu ictimai məhsulun bölgüsü və yenidən bölgüsü üzrə pul münasibətlərinin təşkili forması kimi nəzərdən keçirir [11, s.14]

Maliyyə siyasətinin vəzifələrinin yerinə yetirilməsi zamanı aşağıdakılar nəzərə alınmalıdır: 1) Maliyyə siyasətinin təşkili zamanı müəyyən məkan və zaman daxilində hər bir ölkənin spesifik xüsusiyyətləri: mövcud tarixi şərait, ölkənin yerüstü və yeraltı sərvətləri, regional, demoqrafik, milli-psixoloji xüsusiyyətləri nəzərə alınmalıdır. Bu baxımdan respublikamızın bazar iqtisadiyyatına keçdiyi bir dövrdə maliyyə siyasəti elə qurulmalıdır ki, bu, xalqın həyat səviyyəsinin yüksəldilməsinə xidmət etsin. 2) Maliyyə ehtiyatlarının səmərəli istifadə istiqamətləri müəyyən edilməlidir.3) Maliyyə münasibətlərinin təşkilinin metod və üsulları müəyyənləşdirilməlidir. Bu vəzifəyə vergilərin və digər maliyyə tənzimləyicilərinin təşkili qaydaları, dövlət maliyyə orqanlarının işinin təşkili metodları və s. aiddir.

Maliyyə sisteminin iştirakı ilə Ümumi Daxili Məhsul müxtəlif təsərrüfat subyekti arasında və məqsədli istiqamətlərdə bölüşdürülür, eyni zamanda da, nəticədə hər bir təsərrüfat subyektləri zəruri maliyyə resursları ilə təmin olunur. Beləliklə, deyə bilərik ki, maliyyə sistemi iqtisadi kateqoriya kimi Ümumi Daxili Məhsulun və Milli Gəlirin bölgüsü və yenidən bölgüsü məhz onunla həyata keçirilir ki, bunun nəticəsində pul vəsaiti fondları yaradılır və istifadə edilir.

Maliyyə sistemi-qarşılıqlı əlaqə və qarşılıqlı fəaliyyət göstərən maliyyə münasibətlərinin ayrı-ayrı həlqələrinin məcmusudur. Maliyyə sistemi vasitəsilə pul vəsaitləri fondlarının bölgüsü, formalaşması və istifadəsi həyata keçirilir. Maliyyə sisteminə ölkənin maliyyə fəaliyyətinin və pul tədavülünün tənzimlənməsinə xidmət edən maliyyə idarələri daxil edilir. [6, s.22] Maliyyə sistemi müəyyən zaman müddətində pul dövriyyəsi və dövriyyədəki pulun həcminin müəyyənləşməsi, pul vəsaitlərinin müxtəlif funksiyalı, mahiyyətli fondlara cəlbi və istifadəsinin idarə edilməsi prosesidir. Maliyyənin belə açıqlanması

maliyyənin bütövlükdə məhsul axınlarını tamamlayan, mübadiləni asanlaşdıran pul dövriyyəsi olduğunu göstərir.

Maliyyə mərkəzi bankların, dövlətin kredit və büdcə siyasətinin yardımı ilə "yaranan" pul vəsaitlərinin məcmu həcmidir. Maliyyə müxtəlif fondlara-dövlət büdcəsi, fərdi kommersiya layihələri fondu, bank sektoru və s. cəlb edilən, istifadə edilən pul vəsaitləridir. Maliyyə-pul və pul fondları ilə bağlı bu və başqa proseslərin idarə edilməsidir. Ölkəmizdə maliyyə sisteminin quruluş prinsipləri kimi qeyd edə bilərik: maliyyə sisteminin ayrı-ayrı tərkib hissələrinin funksional təyinatı-maliyyə sisteminin hər bir həlqəsi özünün dəqiq müəyyən edilmiş vəzifələrini həll edir və buna müvafiq maliyyə aparatı yaradılır; maliyyə sisteminin vahidliyi prinsipi-dövlət tərəfindən maliyyə orqanları vasitəsi ilə vahid maliyyə siyasəti aparılır; dövlət maliyyə orqanlarının strukturu ölkənin inzibati-ərazi quruluşuna uyğun təşkil olunur. [7, s. 81]

Maliyyə haqqında iqtisadi elmin ən başlıca vəzifəsi budur ki, dövriyyədəki pul həcminin ümumi iqtisadi artımı şərtləndirən səviyyədə artımı və azalmasını müəyyənləşdirsin, fiksal siyasətin səmərəli olmasını təmin etsin, fərdi layihələrin nə dərəcədə effektiv olub-olmamağını aşkarlasın. Maliyyə mürəkkəb struktura malik bir sistemdir. [18]

Maliyyə sisteminə daxil olan həlqələr müxtəlif müəlliflər tərəfindən müxtəlif cür təsnif edilir. Məsələn, A.Q. Mirzəyeva qeyd edir ki, Azərbaycan Respublikasının maliyyə sisteminə bu həlqələr daxildir: 1. Dövlət maliyyəsi; 2. Müəssisələrin və təşkilatların maliyyəsi; 3. Kredit fondu; 4. Dövlət Sığorta fondu. Həmçinin o qeyd edir ki, hüquq ədəbiyyatında maliyyə sisteminin çoxhəlqəli olmasına mühüm əhəmiyyət verilir. Qeyd olunur ki, maliyyə sisteminin çoxhəlqəliliyi onun daha da çevik olmasına və təsirinin səmərəli olmasına kömək edir. Bu həlqələrin alt qruplarını müəllif belə qeyd etmişdir: dövlət maliyyəsi: büdcə sistemi, dövlət büdcədənkənar fondları, dövlət krediti; müəssisə və təşkilatların maliyyəsi: kommersiya müəssisələri və təşkilatlarının maliyyəsi, kommersiya fəaliyyəti ilə məşğul olmayan idarə, təşkilat və ictimai birliklərin maliyyəsi; kredit fondu: bank krediti fondu, kommersiya krediti fondu; dövlət sığorta fondu: şəxsi sığorta, əmlak sığortası, digər növ sığorta. [1, s.16]

Başqa müəlliflər isə qeyd edirlər ki, maliyyə ilk növbədə bölgü münasibətlərinin daşıyıcısı olduğuna görə, məhz bu bölgü müxtəlif təsərrüfat subyektləri arasında baş verir. Onlar vurğulayırlar ki, pul vəsaiti fondlarının yaradılması və istifadəsi qaydasından asılı olaraq maliyyə sistemi iki yerə ayrılır: Ümumdövlət maliyyəsi (mərkəzləşdirilmiş maliyyə); müəssisə və təşkilatların (təsərrüfat subyektlərinin) maliyyəsi (qeyri-mərkəzləşdirilmiş maliyyə). Maliyyə sistemi geniş mənada habelə kredit-bank sistemini də (ölkənin banklarını və digər kredit idarələrinin məcmunu) əhatə edir. [6, s.22]

Bu bölmənin hər biri təşkilati struktura malik olmaqla bir neçə həlqədən ibarətdir. Birinci bölmədə - dövlət maliyyəsinin həlqələri mərkəzləşdirilmiş maliyyəyə aiddir və makro səviyyədə iqtisadiyyatı, eyni zamanda maliyyə-bölgü münasibətlərini tənzimləmək üçün istifadə edilir. İkinci bölmə isə müəssisə və təşkilatların maliyyəsini , yəni qeyri-mərkəzləşdirilmiş maliyyəni əhatə edir və mikro səviyyədə iqtisadiyyatı və sosial münasibətləri tənzimləmək və stimullaşdırmaq üçün yararlıdır. Kredit-bank sferası isə məlum olduğu kimi, ölkənin banklarından və digər kredit idarələrdən ibarətdir. Ölkənin maliyyə sisteminə həmçinin maliyyə fəaliyyətini həyata keçirən və tənzimləyən dövlət maliyyə institutları da (təşkilatlar və.idarələr) aiddir. Bəzi müəlliflər hətta AR-ın maliyyə sisteminin strukturunu bu şəkildə təsvir edirlər: 1) İctimai maliyyə: dövlət və bələdiyyə maliyyəsi, qeyri-kommersiya təşkilatlarının, büdcə təşkilatlarının, ictimai təşkilatların, fondların maliyyəsi. 2) Təsərrüfat-sahibkarlıq subyektlərinin maliyyəsi: kommersiya təşkilatlarının maliyyəsi, fərdi sahibkarlığın maliyyəsi, maliyyə vasitəçilərinin maliyyəsi, qeyri-dövlət təşkilatlarının maliyyəsivə s. 3) Sığorta maliyyəsi: sosial sığorta, şəxsi sığorta, məsuliyyətliliyin sığortası, riskin sığortası, əmlak sığortası. 4) Kredit-bank sferası: AR-ın Mərkəzi Bankı, AR-ın kommersiya bankları, bank olmayan kredit təşkilatları. 5) Dövlət maliyyə orqanlarının sferası: AR-ın maliyyə Nazirliyi, AR-ın Vergi Xidməti, AR-ın subyektlərinin maliyyə orqanları və s. 6) Beynəlxalq maliyyə- beynəlxalq maliyyə təşkilatları, beynəlxalq kredit təşkilatları, investisiya əmliyyatları, valyuta əməliyyatları. [7, s.82]

Onu da qeyd edək ki, maliyyə münasibətlərinin iki sferası ayird edilir: mərkəzləşdirilmiş və mərkəzləşdirilməmiş maliyyələr. Mərkəzləşdirilmiş maliyyəyə dövlət büdcəsi, büdcədənkənar fondlar, dövlət sığortası, dövlət krediti aid edilir. Mərkəzləşdirilməmiş maliyyə dedikdə isə, müxtəlif əlamətlərə görə təsnifatlana bilən müəssisə maliyyəsi nəzərdə tutulur. Məsələn, maddi istehsal müəssisələrinin maliyyəsi və qeyri-istehsal sferasının müəssisə və təşkilatlarının maliyyəsi və ya dövlət müəssisələrinin maliyyəsi və digər mülkiyyət formalı müəssisələrin maliyyəsi bura aid ola bilər. Həmçinin maliyyə sisteminin intitusional strukturu anlayışı da fərləndirilir. Ölkənin maliyyə sektorunda fəaliyyət göstərən təşkilatların məcmusu maliyyə sisteminin institusional strukturu adlanır. Maliyyə sektoru geniş və dar mənada başa düşülür. Geniş mənada ona müxtəlif maliyyə təşkilatları, müşahidəçi və nəzarətedici orqanlar və maliyyə birlikləri aid edilir. Əgər təşkilat iqtisadiyyatın müxtəlif subyektləri (şəxsi firmalar, ev təsərrüfatları, dövlət müəssisələri və b.)

arasında pul vəsaitlərinin formalaşması və paylaşdırılması kimi başlıca funksiyaları yerinə yetirisə, o zaman o, dar mənada maliyyə sektoruna aid edilə bilər. [4, s.296]

Xarici ölkələrdə mərkəzləşdirilmiş və mərkəzləşdirilməmiş maliyyə sferalarına daxil olan hissələrin yalnız bəzilərini ayırmaq qəbul edilir. Belə ki, xarici ölkələrin maliyyə sistemlərinə aşağıdakı elementlər daxildir: dövlət büdcəsi; yerli maliyyələr; xüsusi büdcədənkənar fondlar; dövlət müəssisələrinin maliyyələri. [19] Məsələn, Avropa Birliyinin büdcəsi AB-yə üzv ölkələrin pul vəsaitlərinin dövlətlərarası mərkəzləşmiş fondunu ifadə edir və əsas maliyyə planı formasında çıxış edir. Bu plana uyğun olaraq Avropa Birliyinin vəsaitlərinin səfərbər edilir və xərclənir. Avropa Birliyinin büdcəsi AB-nin inkişaf siyasətinin və strategiyasının reallaşdırılmasına yardım etməyə yönəlmişdir və aşağıdakıları əks etdirir: valyuta stabilliyinin yaradılması; müasir və dinamik Avropa sənayesinin inkişafı; yeni texnologiyaların inkişafının stimullaşdırılması; müxtəlif regionların sosial və mədəni inkişaf səviyyələrinin bərabərləşdirilməsi.

ABŞ-ın federativ quruluşu onun maliyyə sistemində də öz əksini tapır. Burda əsas diqqət dövlət xərclərinə, dövlət gəlirlərinə və büdcələrarası əlaqəyə verilir. ABŞ-ın büdcə quruluşu federativdir və buraya daxildir: federal büdcə; 51ştatın büdcəsi; 12,7 min inzibati, təsərrüfat-sahibkar və digər yerli şöbələrin büdcələri. [12, s.95]. Bundan başqa ABŞ-ın maliyyə sistemində xüsusi fondlar mühüm yer tutur. Onlar müstəqil maliyyə müəssisələri kimi fəaliyyət göstərir. Məsələn onlara aid edilə bilər: sosial sığorta fondları, hərbi-siyasi fond, təsərrüfat fəaliyyətinin tənzimlənməsi üçün nəzərdə tutulmuş iqtisadi fondlar (məsələn, investisiya fondları) və s. [13, s.115].

Almaniyanin büdcə sistemi 3 hissədən ibarətdir: federal büdcə; regional büdcə; yerli büdcə (11min icmadan çox). Bununla yanaşı Almaniyada maliyyə sisteminə həmçinin xüsusi hökümət fondları, büdcədənkənar fondlar, Federal Dəmir yolunun (Bundesbank), Federal Poçtun fondları (Bundespost), dövlət müəssisələrinin, sosial sığorta orqanlarının, əmək üzrə federal idarənin fondları daxildir. Almaniyanın maliyyə sisteminin əsas həlqəsi xüsusi fondlardır, xüsusilə də Sosial Müdafiə Fondu. Bu fondun 3 maliyyə mənbəyi var: məcburi ayırmalar, sahibkar ödəmələri, federal büdcədən subsidiyalar. Müharibə Yükünü Bərabərləşdirmə Fondu da fəaliyyət göstərir ki, onun da əsas məqsədi müharibədən əziyyət çəkmiş əhaliyə yardım etməkdir. Ağır sənayeyə kömək etmək üçün isə 1952-ci ildə yaradılan İnvestisiya Fondu fəaliyyə göstərir. Onu da qeyd edək ki, 2002-ci il alman federal büdcəsi alman markaları ilə deyil, avro ilə hesablanmışdır. [14, s.232]

Fransada isə 1959-cu il dekreti "maliyyə haqqında qanun" və "büdcə haqqında qanun" anlayışlarını bir-birindən ayırdı. Birinci anlayış dövlət vəsaitlərinin, dövlət xərclərinin anlayışı və təyinatını iqtisadi və maliyyə tarazlığı nəzərə alınmaqla müəyyənləşdirirdisə, ikinci anlayış maliyyə qanununun ümumi maddələrini şərh edirdi. Fransanın maliyyə sisteminə aid edilirdi: dövlət büdcəsi; yerli büdcələr (ərazi təşkilatlarının, yerli təşkilatların, onların ittifaqlarının, sindikatların, şəhər birliklərinin, rayonların büdcələri); xüsusi fondlar (pensiya fondu, ailələrə yardım fondu, əlillik, xəstəlik, analıq üzrə sığorta fondu, işsizlərə milli yardım fondu). [15, s.67]

Büdcədənkənar fondlar xarici ölkələrdə dövlət maliyyəsinə dəstək üçün geniş istifadə olunur. Hətta bəzi müəlliflər hesab edirdilərki, bu fondların yaranmasında əsas zərurət dövlət büdcəsində olan çatışmamazlılar, yəni kəsirlərdir. [17, s.15] Ümumiyyətlə beynəlxalq təcrübədə mövcud olan büdcədənkənar fondlar iki kateqoriyaya bölünür. Birincisi, təbii ehtiyatlardan əldə olunan gəlirlər hesabına formalaşaraq sosial-iqtisadi problemlərin həllinə yönəlmiş, ikincisi isə dövlət büdcəsindən aynlan transfertlər və həmçinin, (bir qayda olaraq sosial sığorta haqları) digər ödənişləri hesabına formalaşan və cəmiyyətdə mövcud olan sosial problemlərin həllinə (pensiyia təminatı və s.) yönəldilən fondlardır. Büdcədənkənar dövlət fondlannın təbii resursdan yaranma səviyyəsinə görə 3 növü mövcuddur: Stabilləşmə fondu; Gələcək nəsillər fondu; Büdcə ehtiyatlan fondu.

Stabilləşmə fondu (Alyaska, Venesuela. Kolumbiya, Küveyt, Nigeriya, Norveç, Çili) - bir qayda olaraq hər hansı bir təbii resursun (neft, mis və s.) dünya bazarındakı qiymətindən asılı olaraq formalaşır. Gələcək nəsillər fondu (Kanada, Alyaska, Kiribati, Küveyt, Oman, Papua-Yeni Qvineya) -hər hansı bir təbii resursdan əldə olunan gəlirlərin konkret fondda toplanaraq gələcək nəsillər üçün saxlanmasını nəzərdə tutur. Büdcə ehtiyatları fondu (Honkonq, Sinqapur, Estoniya, CAR) - əksər hallarda dövlət büdcəsində yaranan (neft və ya digər gəlirlər hesabına) profisit əsasında formalaşır və iqtisadi tənəzzül dövründə büdcə xərclərinin maliyyələşdirilməsi məqsədi daşıyır. [8, s. 114-115]

Norveçdə 30 il ərzində neft-qaz sahəsinin inkişafı nəticəsində dövlət neft hasilatı üzrə üçüncü yerdə durur. Digər tərəfdən neftdən əldə olunan vəsaitlərin uğurlu istifadəsi nəticəsində ÜDM-in əhəmiyyətli artımı müşahidə edilir, Norveç hökumətinin ümumiyyətlə dövlət borcu heç yoxdur, vergi daxilolmalarının həcmi və ümumən yığım əmsalı cox yüksəkdir, Avropada ən aşağı işsizlik səviyyəsi məhz Norveçdədir. Bu əsasda, neftdən əldə olunan gəlirlər həm iqtisadi inkişafa, həm də əhalinin maddi rifahına yönəldilir. Norveç Neft

Fondu 1990-cı ildə yaradılmışdır. Lakin, ilk dəfə olaraq fonda pul 1996-cı ildə köçürülmüşdür (349 mln.ABŞ dollan). 1998-ci ildə isə fond bazarlarına daxil oldu. 2006-cı ildən isə fond artıq Dövlət Pensiya Fondu adlanmağa başlandı, amma öz mahiyyətini itirmədi. Hazırda fondda toplanan vəsaitlər iki mənbədən formalaşır: dövlət büdcəsində yaranan profisit və neftdən gələn gəlirlər. Həmçinin fond iki yerə bölünmüşdür: Qlobal və Norveç Fondu (keçmiş Sığorta Proqramı üzrə Milli Fond). [16, s. 45]

## Nəticə

Beləliklə, belə nəticəyə gələ bilərik ki, maliyyə sistemi-pul vəsaitlərinin yaranması və istifadəsi prosesində yaranan maliyyə münasibətlərinin məcmusudur. Maliyyə sistemi-maliyyə bazarlarının, dövlət maliyyəsinin fəaliyyətinə imkan yaradan qarşılıqlı əlaqəli elementlərin toplusudur. Azərbaycan Respublikasının maliyyə sisteminin həlqələrinə isə daxildir: dövlət maliyyəsi, müəssisə və təşkilatların maliyyəsi, kredit fondu, sosial sığorta fondu.

## Ədəbiyyat

1. Mirzəyeva A.Q. "Maliyyə hüququ". Dərslik. "Adiloğlu" nəşriyyatı, Bakı, 2018, 264 səh.
2. Sadıqov M., Məmmədov S., "Maliyyə". Dərslik, "Gəncə" nəşriyyatı, Gəncə, 2010, 568 səh.
3. Bağırov D., Həsənli M., "Maliyyə". Dərslik, "İqtisadiyyat Universiteti" nəşriyyatı, Bakı, 2011, 384 səh.
4. Zeynalov V. "Maliyyə (suallar və cavablar)". Dərslik. "İqtisadiyyat Universiteti" nəşriyyatı, Bakı, 2010, 361 səh.
5. Böyük iqtisadi ensiklopediya. 5 cilddə. Bakı, 2012. İdeya rəhbəri və baş redaktor akademik Z.Ə.Səmədzadə.
6. Novruzov N., Hüseynov X., "Maliyyə". Dərslik, "Koperasiya" nəşriyyatı, Bakı, 2011, 464 səh.
7. Ataşov B., Novruzov N., İbrahimov E., " Maliyyə nəzəriyyəsi". "Koperasiya nəşriyyatı", Bakı, 2004, 646 səh.
8. Vəliyev Z. Büdcə nəzəriyyə və praktikada, 2010, 530 səh.
9. Финансы. Денежное обращение. Кредит. Учебник. /под. ред. Л.А.Дробозиной. М., 2000.
10. Финансы. Учебник. / Под. ред. А.Г.Грязновой, Е.В. Маркиной. М., 2012.
11. Финансы. Учебник. Под. ред. В.В. Ковалева. М., 2003.
12. Буторина О. Трудный путь к единой европейской валюте // МЭ м МО. 1998. № 1 С. 94-104.
13. Пищик В.Я. Евро и доллар США. Конкуренция и партнерство в условиях глобализации. М.: Консалтбанкир, 2002. 304 с.
14. Новая единая европейская валюта евро /М.: МГУ; ТАСИС, 1998. 391 с.
15. Аникин А.В. Валютные проблемы Западной Европы. М.: ИМО, 1960. 179 с.
16. Intergovenmental fiscal transfers: principles and practice. The World Bank, 2007, Edited bv Robin Boadway and Anwar Shah:
17. Managing and Controlling Extrabudgetary Funds by Richard Allen and Dimitar Radev, OECD Journal on Budgeting Volume 6 – No. 4 © OECD 2006, 31p.
18. https://hozir.org/doc-dr-cihan-bulut-elcin-suleymanov-dovlet-maliyyesi-bak-2013.html?page=8
19. https://kayzen.az/blog/finance/1042/1.1.1.maliyy%C9%99-sistemi-anlay%C4%B1%C5%9F%C4%B1-v%C9%99-elementl%C9%99ri.htm

**Rəyçi: dos. A.Mirzəyeva**

Göndərilib: 07.12.2020 Qəbul edilib: 09.12.2020

DOI: 10.36719/2663-4619/61/162-165

**Ülkər Faiq qızı Bayramova**
Milli Aviasiya Akademiyası
ulkerbayramova998@gmail.com

# GƏNCƏ BEYNƏLXALQ HAVA LİMANINDA KÜLƏK REJİMİNİN TƏHLİLİ

***Açar sözlər:*** *külək, temperatur, aviasiya, külək gülü, görünüş məsafəsi*

## Wind analysis at Ganja International Airport

**Summary**

The article reviews wind conditions at Ganja International Airport and specifies the maximum winds observed during the month and the direction of the winds. The direction of the mean, maximum wind speed of the prevailing wind was analyzed. Based on our analysis, we can see that the prevailing wind direction is northeast and the maximum speed was recorded in March.

***Key words:*** *wind, temperature, aviation, wind rose, visibility*

## Giriş

Hava limanlarında uçuşların meteoroloji təminatının yüksək keyfiyyətli təşkili, effektivliyin artırılması bir çox amillərdən asılıdır. Bu amillərə hava limanlarında hakim küləklər, onların təkrarlanması, küləyin sürətinin ayrı-ayrı komponentləri, meteoroloji görünüş məsafəsi, ona təsir edən amillərin təhlili, atmosfer hadisələri, o cümlədən təhlükəli meteoroloji hadisələr, hava temperaturunun orta və ekstremal göstəricilərinin paylanması və s. aiddir.

Gəncə beynəlxalq hava limanı Kiçik Qafqaz dağlarının şimal-şərq yamacında Qazax-Gəncə maili düzənliyində, Gəncə çayın hər iki sahilində dəniz səviyyəsindən 350 m hündürlükdə olan ərazidə yerləşir. Ərazi şimaldan Ceyrançöl alçaq dağları, cənubdan isə Murov silsiləsinin şimal ətəkləri ilə qovuşur. Şəhərin şimal-şərqində Kür çayının sağ sahili boyunca Mingəçevirə qədər arial Bozdağ silsiləsi uzanır. Rayonun ərazisi 200-500 m-dən başlamış 3700 m mütləq yüksəkliyə qədər ucalır.

Aeroport ətrafı relyef dağətəyi düzənlik üçün səciyyəvi olan müxtəlifiyi və rəngarəngliyi ilə fərqlənir. Dağlıq relyef şəhərə doğru dərin dərələr və yarğanlarla kəsilmişdir. Gəncə şəhərinin dağlıq ərazisi mürəkkəb geoloji qurluşa malikdir. Kiçik qafqazın şimal-şərq yamacı şaquli qurşaqlıqla xarakterizə olunur. Gəncə beynəlxalq hava limanına yerləşən ərazinin dörd yüksəklik qurşağı ayrılmışdır:

1) Maili düzənliklər qurşağı (160-500);
2) Dağətəyi qurşaq (500-1200);
3) Orta dağlıq qurşaq (1200-2200);
4) Yüksək dağlıq qurşaq ( 2200 m-dən hündür).

Gəncə-Qazax maili düzənliyi və həmçinin Gəncə aeraportu yerləşən ərazi üçün qışı mülayim, yayı quraq keçən yarımsəhra və quru çöl iqlimi səciyyəvidirsə, dağətəyi və alçaq dağlıq hissədə qışı quraq keçən mülayim isti iqlim tipi üstünlük təşkil edir. Atmosfer yağıntılarının qeyri-bərabər paylanması quruçöl və yarımsəhra landşaftının inkişafına imkan yaradır.

Azərbaycan ərazisinin müasir iqlimi bir çox amillərin təsiri altında yaranır. Bu amillər sırasında respublika ərazisinin coğrafi mövqeyi mühüm yer tutur. Yer səthinə günəşdən gələn radiasiyanin miqdarı birbaşa coğrafi mövqedən aslıdır. Həmin radiasiyanın yer atmosferində, eləcə də yer səthində müxtəlif dərəcədə akkumulyasiyası, sərf edilməsi, istilik balansının kəmiyyət göstəriciləri, ümumiyyətlə, iqlimin xarakteri bu passiv amildən aslidir.

Coğrafi mövqeyin iqliməmələgəlmədə rolu həm günəş radiasiyasının miqdarını və radiasiya balansını, həm də ərazinin termik şəraitini müəyyən etməklə bitmir. Coğrafi mövqe eyni zamanda ərazinin atmosferin planetar və regional dövranı sistemində yerini müəyyən edir.

Aerodromdakı iş şəraiti təyyarələrin qalxma və enməsi əsasən səthi külək xüsusiyyətlərindən çox asılı olur və bu hallarda təyyarələr küləyin istiqamətinin əleyhinə eniş edirlər. Çünki bu eniş sürətini, təyyarənin yerdən ayrılma sürətini azaldır və buna görə uçuş uzunluğu, təyyarənin dayanıqlığı artır. Beləliklə, üstünlük təşkil edən küləyin istiqaməti və sürətinin müəyyən edilməsi hava limanları üçün mühüm əhəmiyyət kəsb edir. Aerodromlarda uçuş-enmə zolağı üstünlük təşkil edən külək istiqamətinə nəzərən lahiyə edilir.

Güclü küləklər uçuş təhlükəsizliyinə və təyyarələrin hərəkətinin müntəzəmliyinə təsir göstərir. Təyyarələrin hər bir növü üçün küləyin sürətinə uyğun məhdudiyyətlər mövcuddur. Küləyin sürəti 30

düyündən çox olduqda təyyarənin enməsi qeyri-mümkün olur. Güclü küləklər zamanı səth qatında turbulentlik meydana gəlir. Gəncə hava limanında külək rejimi həm dövran amillərindən, həm də ərazinin oroqrafiyasından asılıdır.

Gəncədə külək rejimi atmosferin ümumi dövranı və relyefin xarakteri ilə müəyyən edilir. Meteoroloji elementlərdən fərqli olaraq küləyin sürəti bir vektorial kəmiyyətdir və buna görə də iki göstərici ilə müəyyən edilir: külək sürəti və istiqaməti. Təhlildə aşağıdakı külək parametrləri araşdırılır:

- minimum, maksimum, orta sürətin dəyərləri;
- küləyin ani və şiddətli sürəti;
- küləyin sürətinin 30 düyündən çox olduğu halların sayı;
- fərqli külək istiqamətlərinin təkrarlanması.

Şəkil 1-də 2005-2018 illər ərzində küləyin aylar üzrə orta çoxillik və maksimal sürətləri verilmişdir. Xəttin yuxarı və aşağı nöqtələrini təmsil edən xətt külək sürətinin maksimum və orta kəmiyyətlərini göstərir. Ən yüksək külək sürəti mart ayında müşahidə edilir. Küləyin orta sürəti 4 ilə 8 düyün arasında dəyişir.




**Şəkil 1. Küləyin orta və maksimum sürəti**

Şəkil 2-də küləyin orta sürəti düyünlərlə verilmişdir. Ən zəif küləklər 0-1 düyün arası 0.05 %, 30 düyündən artıq küləklər isə 10.52 % təşkil edir.




**Şəkil 2.Düyünlə küləyin sürətinin orta illik intervalı**

Şəkil 3-də Gəncə hava limanında tərtib olunmuş külək gülü verilmişdir. Burada küləyin 8 əsas istiqamətindən istifadə edilmişdir: şimal (Ş), şimal-şərq (ŞŞ), şərq (Ş), cənub-şərq (CŞ), cənub (C), cənub-qərb (CQ). Şəkildə göründüyü kimi hakim küləyin istiqaməti Şimal qərbdir. Bu istiqamətlərin hər birinin tezlikləri cəmi (27.2% + 15.8% = 43%) təşkil edir. Şimal və Cənub istiqamətlərdə küləyin nadir hallarda əsdiyi göstərilir. Bundan əlavə şəlakətli günlərin sayı 4,1%-dir.




**Şəkil 3. Gəncə beynəlxalq hava limanında külək gülü**

Külək rejimi təhlili onu göstərir ki, Gəncədə il ərzində qeyri-sabit küləklərin miqdarı 5%-dir. Qərb küləkləri Avropanın cənubundan, Qara dənizdən və Gürcüstan ərazisindən Azor maksimumunun keçməsi, Şərq küləkləri isə Sibir, Orta Asiya antisiklonlarının və ya soyuq Artktik havanın qarışması nəticəsində əmələ gəlir. Fəsillərdən asılı olaraq Gəncə aeroportu və onun ətraf ərazilərində küləyin sürət və istiqaməti müxtəlifdir. Belə ki, qışda qərb və şimal-qərb küləkləri üstünlük təşkil edirlər. Yay aylarında şərq, qərb, cənub-qərb və şimal-qərb küləklərinin təkrarlanması daha üstünlük təşkil edir.

Gəncə aeroportu ərazisində, o cümlədən Gəncə-Qazax düzənliyində, cənub-şərq istiqamətli ağ yelin əksi olan, yəni şimal-qərbdən əsən küləklər qara yel adlanır. Bu küləklər çox sürətli olduqda tozanaq qopur, hava qaralır, payızda və yazda torpaq yeni şumlandığı zaman havalar quraq keçirsə torpaq qatını sovurur. Bu küləklər ilin bütün fəsillərində əsir, isti dövrdə isə bəzən çox güclü olur, ağacları sındırır, görünmə məsafəsini çox aşağı salır və bununla aviasiya üçün təhlükə yaradır. Şərq istiqamətli güclü küləklər ilin istənilən vaxtlarında, əsasən isə yay fəsilinin quraqlıq dövründə müşahidə olunurlar. Əsasən sakit havadan, zəif qərb və dəyişkən istiqamətli küləklərdən sonra, qəfildən şərq küləklərinin təkrarlanması artır və qısa müddət ərzində küləyin sürəti 18-22 m/san-yə çatır. Bu küləklər quru hava şəraitində əsən zaman tozu atmosferə qaldırır və görünmə məsafəsini xeyli azaldır.

Bu küləklərin qalxmasının sinoptik şəraitinin aşağıdakı kimi səciyyələndirmək olar. Şərqi Azərbaycan, Abşeron yarımadası üzərində azqradiyentli barik sahə, şimali Xəzər üzərində yüksək atmosfer təzyiqi, Qara dəniz üzərində isə alçaq təzyiq zonaları yerləşir. Kür çayının vadisi boyunca atmosfer kütləsinin müxtəlif, qeyri-bərabər qızması nəticəsində atmosfer təzyiqi Gəncə aeroprtu sahəsində düşməyə başlayır, bu isə barik qradiyentin kəskin artmasına gətirib çıxarır. Şərq istiqamətli küləklərin qalxması qəfildən baş verir və bir neçə stansiyalarda müşahidə olunur.

## Nəticə

“Gəncə beynəlxalq hava limanında külək rejiminin təhlili” mövzusunda buraxılış işi yazılarkən aşağıdakı nəticələr əldə edilmişdir:

1. Gəncə beynəlxalq hava limanının qısa coğrafi səciyyəsi təhlil edilmişdir.
2. Gəncə beynəlxalq aeroportunda il ərzində hakim küləklər cənub-qərb (15,8%), qərb (13,2%) və şimal-qərb (27,2%) küləkləridir. Aeroport ərazisində şimal küləkləri 5,5%, şimal-şərq 8,3%, şərq 12,8%, cənub-şərq 9,7%, cənub 3,4%, küləksiz günlərin təkrarlanması isə 4,1% təşkil etmişdir.

3. Gəncə beynəlxalq hava limanında küləyin müxtəlif göstəriciləri (orta aylıq, və maksimum külək sürətləri, güclü küləkli günlərin sayı) statistik təhlil edilmişdir. Aeroport ərazisində küləyin sürəti müxtəlif qradasiyalar üzrə təhlil edilmişdir. Çoxillik dövr ilə müqayisədə 2005-2018-ci illər ərzində sürəti 30 düyündən artıq olan küləklərin təkrarlanma halları təxminən 10%-dək artmışdır. Gəncə beynəlxalq hava limanı ərazisində küləyin orta sürəti çoxillik iqlim məlumatları ilə müqayisəli təhlil edilmişdir. Belə ki, küləyin orta illik sürətinin 6.6 düyün (1961-1990), 2005-2018-ci illərdə isə 6.1 düyün olduğu aşkarlanmışdır.

**Ədəbiyyat**

1. Gəncə aeroportunun elektron formada arxiv məlumatları.
2. Hüseynov N.Ş., Məlikov B.M., Hacıyev A.X., Məmmədova H.V. Azərbaycan Respublikasının Beynəlxalq Hava Limanlarında dumanlı hava şəraitlərinin fiizki-statistik təhlili. Milli Aviaisya Akademiyasının Elmi Əsərləri. 2013-cü il., №1.
3. Hüseynov N.Ş., Məlikov B.M., Hacıyev A.X., Məmmədova H.V. Azərbaycan Respublikasının Beynəlxalq Aeroportlarında temperatur rejiminin təhlili. Milli Aviaisya Akademiyasının Elmi Məcmuələri №2, 2013.
4. Баранов А.М., Белоусова Л.Ю., Лещенко Г.П. Авиационная метеорология и метеорологическое обеспечение полётов. – М.: Транспорт, 1993.
5. http://ready.arl.noaa.gov.
6. Azərbaycan Respublikasının Beynəlxalq Hava Limanlarında külək rejiminin paylanma xüsusiyyətlərinin fiziki-statistik təhlili Məqalə Milli Aviasiya Akademiyasının Elmi Əsərləri. 2013-cü il. №2. Səh. 119-125.7 səh.Məlikov B.M.Məmmədova H.V.Məmmədova G.A

**Rəyçi: prof. R.Mahmudov**

Göndərilib: 20.12.2020 Qəbul edilib: 21.12.2020

DOI: 10.36719/2663-4619/61/166-169

**Nigar Mehman qızı Quliyeva**
Bakı Dövlət Universiteti
nigar.quliyeva.5649@gmail.com
**Rövşanə İkram qızı Əhmədova**
Bakı Dövlət Universiteti
rovshaneehmedova96@gmail.com

# AVROPA ÖLKƏLƏRİNDƏ (FİNLANDİYA, ALMANİYA, DANİMARKA) MƏKTƏB COĞRAFİYASININ TƏDRİSDƏ YERİ VƏ İNKLÜZİV TƏHSİL

***Açar sözlər:*** *tədris planı, coğrafiya dərsliyi, təhsil sistemi, təhsil səviyyəsi, inklüziv təhsil, SİM*

## School geography in the curriculum and inclusive education in Germany, Finland, Denmark

**Summary**

A number of countries have specially designed educational programs for both healthy and students with disabilities. Differences in the education systems of countries reveal differences in the teaching of geography and the application of inclusive education. This article provides information on the geography curriculum, syllabus, lesson hours, textbooks in Finland, Germany and Denmark's secondary schools, and compares them with Azerbaijani schools. At the same time, the general content and differences of inclusive education in those countries are reflected.

***Key words****: curriculum, geography textbook, education system, level of education,inclusive education, Limited Health Opportunities.*

## Giriş

Coğrafiya gələcəkdə daha mükəmməl bir dünyanın inşası üçün vacib fənlərdən biridir. Bu fənn fəal və məsuliyyətli gənclərin yetişdirilməsində əvəzedilməz rola malikdir. Daha mükəmməl bir dünyanın gələcəyi təkcə sağlam şagirdlərdən yox, sağlamlıq imkanları məhdud olan (SİM) şagirdlərdən də asılıdır. Bunun üçün həmin şagirdlərin inklüziv təhsilə cəlb olunması mühüm əhəmiyyət kəsb edir. Ölkələrin təhsil sistemindəki fərqliliklər coğrafiyanın tədris edilməsi və inklüziv təhsilin tətbiq edilməsində olan müxtəlifliyi ortaya çıxarır. Bəzi ölkələr digərləri ilə müqayisədə təhsilin keyfiyyətinə görə ön plana çıxır. Bu fərqlilikləri bir neçə ölkənin nümunəsində təhlil edək.

Təhsilin keyfiyyətinə görə bütün dünyada tanınan **Finlandiya**da coğrafiyanın tədrisinə aşağı siniflərdən başlanılır. 1-ci və 4-cü siniflər arasında coğrafiya, "Ətraf mühit və təbiət elmləri" fənni adı altında tədris edilir. 5-ci və 6-cı siniflərdə coğrafiya, "Biologiya və Coğrafiya" fənni daxilindədir. 7,8 və 9-cu siniflərdə isə ikisi məcburi, ikisi seçmə fənn olaraq 4 coğrafiya fənni tədris edilməkdədir.

Finlandiya məktəblərində təhsil 190 gün davam edir. İyun ilə avqust arasında 2,5 aylıq müddətdə şagirdlər yay tətilinə buraxılır. İki yarımilə bölünən tədris ilində həftədə 19-30 saat arasında dərs verilməkdədir. Dərslərin bəziləri seçmə, bəziləri isə məcburidir. Bir dərsin müddəti Azərbaycanda olduğu kimi 45 dəqiqədir. Tənəffüs müddəti isə bizim məktəblərdən fərqli olaraq 15 dəqiqədir. Aşağı siniflərdə bir fənn həftədə 2 dəfə olmaqla 27 saat tədris olunur. 9-cu sinfin sonunda şagirdlər könüllü olaraq 10-cu sinfə davam edə və yaxud öz istəklərinə uyğun lisey təhsilini seçə bilərlər. 9 illik təhsil məcburidir. Bütün bölgələrdə yerləşən məktəblərdə eyni adlı fənlərdən və tədris ədəbiyyatından istifadə olunur. Finlandiyada Azərbaycan dərsliklərindən fərqli olaraq variativ dərsliklər mövcuddur. Lakin bu dərsliklər eyni standartlar əsasında hazırlanır. Demək olar ki, Finlandiyada təhsilin keyfiyyəti bölgələr üzrə bərabərdir.

Lisey təhsilində coğrafiya, fizika, kimya və biologiya ilə birlikdə eyni fənn daxilində fərqli mövzularda tədris edilir. Bu fənlərdən "Mavi planet" və "Ortaq bir dünya" məcburi olaraq tədris edilir. "Təhlükələr dünyası" və "Regional iş" fənləri isə seçmə fənn olaraq tələbələrin ixtiyarına buraxılır. Azərbaycan məktəblərində isə coğrafiya 6-cı sinifdən 11-ci sinfə qədər eyni fənn adı altında tədris edilir və şagirdlərin seçimi üçün başqa coğrafi fənlər mövcud deyil.

Günümüzdə Finlandiyada bütün uşaqlar (sağlam və SİM uşaqları) eyni təhsil sisteminin içərisində yer alırlar. SİM uşaqlarının sadəcə 2%-i xüsusi təhsil müəsisələrində təhsil alır, 16%-i isə inklüziv təhsilə cəlb olunub. Finlandiyada inklüziv təhsilə keçid 1970-ci illərdə başlanılmış, 1990-cı illərdə isə geniş vüsət almışdır. Salamanka bəyənnaməsi və "Hərkəs üçün təhsil" hərəkatı Finlandiyada İnkluziv təhsilin inkişafında mühüm rol oynamışdır.

Finlandiyada inklüziv təhsil qanunvericilik səviyyəsində inkişaf edir. Finlandiya təhsil sisteminə rəhbərlik edən qanunvericilik, bərabərlik, öyrənmə ədaləti və inklüziya prinsiplərinə əsaslanır. Təhsilin ən vacib hədəfi SİM uşaqlarının böyüməsini və inkişafını mümkün olan bütün yollarla dəstəkləməkdir. Xüsusi ehtiyacı olan şəxslər mümkün olan ən geniş və ən əhatəli təhsil sistemindən faydalanmalıdırlar. Yerli qanunlara görə, sağlamlığında məhdudiyyəti olan şəxslərin təhsili üçün diferensiallaşmış mühitin formalaşdırılması başlıca şərtdir. Milli tədris proqramına edilmiş xüsusi dəyişikliklərə əsasən, belə məhdudiyyəti olan uşaqlar da digərləri kimi kütləvi məktəblərdə təhsil ala bilərlər. Bundan əlavə, dövlət tədris-məsləhət mərkəzləri fəaliyyət göstərir ki, onlar da fiziki qabiliyyətləri məhdud olan uşaqlara, onların valideynləri və pedaqoqlarına təhsil prosesində yardım edir. Məktəblərdə pedaqoqlar üçün inklüziv təhsil mütəxəssislərinin başçılığı ilə uzunmüddətli kurslar və qısamüddətli təlimlər də keçirilir. Pedaqoqları hər növ fiziki məhdudiyyəti olan uşaqlarla işləmək üçün ciddi hazırlaşdırırlar. Bu baxımdan müəllimin tək təhsildən deyil, tibb və psixologiyadan da hazırlıqlı olması başlıca şərtdir. Ailələr, müəllimlər və şagirdlərlə birlikdə məktəbin təhsil və icra planlarının hazırlanmasında iştirak edirlər.

Finlandiyada inklüziv təhsil iki fərqli növə bölünür: "Part-time xüsusi təhsil" adı verilən hissədə şagirdlər həftədə bir saatdan bir neçə saatadək fərdi və ya kiçik qruplarda digər şagirdlərlə birgə xüsusi fənn müəllimlərindən dərs alırlar. "Part-time xüsusi təhsil"ə qatılan əsas sinif şagirdlərinin nisbəti son illər ərzində 22,7% yüksəlmişdir. (Statistika Finlandiya, 2018 ).

İnklüziv təhsilin ikinci forması isə uşağın "xüsusi dəstək sinfinə" rəsmi köçürülməsini əhatə edir. Şagirdə "xüsusi dəstək" təyin etmək, ümumiyyətlə onu xüsusi təhsil otağına köçürmək deməkdir. Bu sinif otaqları daha çox ümumi məktəblərdə yerləşir. Və bu siniflərdə təhsil alan uşaqların nisbəti 7,3% təşkil edir.

İnklüziv təhsil müddəti uzadıla və ya təxirə salına bilər. Şagird ümumi və gücləndirilmiş dəstək tədbirlərinin öhdəsindən gələ bilmirsə, məcburi təhsili uzadılır. Həmin şagirdlər əsas təhsilinə bir il sonra başlaya bilərlər. Finlandiyada həmçinin SİM şagirdləri icbari 9 illik təhsildən sonra könüllü bir il də əlavə oxuya bilərlər.

Ölkədə inklüziv təhsilin reallaşması üçün pedaqoq hazırlığı ilə dövlət məşğuldur. Məsələn, Laplandiya Unversitetində "Məllimlərin tədrisi" adlı proqram fəaliyyət göstərir. "Elm və təhsilin müasir problemləri" elektron elmi jurnalının verdiyi məlumata görə, bu proqramdan müəllim olmaq istəyən hər bir mütəxəssis yararlana bilər. Bələdiyyə səviyyəsində isə iş bu formada təşkil olunub: bir sinifdə iki qrup formalaşdırılır - adi uşaqlar və fiziki məhdudiyyəti olan uşaqlar. Dərsi iki müxtəlif müəllim aparır. Ehtiyacdan irəli gələrək bu müəllimlərə xüsusi pedaqoq və köməkçi də qoşula bilər. Belə siniflərdə uşaqların sayı təqribən 25 nəfərdən ibarət olur.

**Almaniyan**ın təhsil sistemi Azərbaycanın təhsil sistemindən tamamilə fərqlidir. Azərbaycanda bütün bölgələrdə yerləşən məktəblərdə eyni təhsil proqramından istifadə edilsə də, Almaniyada bu qanunauyğunluq pozulur. Almaniya 16 federal torpaqdan ibarətdir və hər federal torpağın özünəməxsus təhsil sistemi mövcuddur. Bu da o deməkdir ki, Almaniyada 16 müxtəlif təhsil sistemi tətbiq olunur. Orta təhsil bəzi bölgələrdə 12, bəzilərində 13 il davam edir. Məcburi təhsil bütün bölgələrdə 4 il olsa da, Berlin və Bradenburgda 6 ildir. Almaniyanın təhsil sistemində 1964-cü ildə imzalanan Hamburg müqaviləsinə görə bütün federal torpaqlarda yerləşən məktəblərdə tədris ili və tətillərin müddətində birlik yaradılmışdır. Tədris ili avqust ayından iyula qədər davam edir. Həftə içi 5 gün dərs keçilən məktəblərdə bir tədris ilinin orta müddəti 188 gündür. Tədris ili 2 yarımilə bölünmüşdür.

Aşağı siniflərdə şagirdlərə daha bəsit coğrafi bilik və bacarıqlar öyrədilərkən, orta siniflərdə bunlara əlavə informasiya, bilik və bacarıqlar əlavə olunaraq orta səviyyəyə çatdırılır. Azərbaycanda tətbiq olunan Kurikulum tədris proqramında da standartlar sadədən mürəkkəbə doğru dəyişir. Universitetə hazırlıq məqsədi ilə hazırlanmış, bizim ölkədə təmayül sinfi adlandırılan 11 və 12-ci siniflərdə, digər aşağı səviyyələrdə əldə olunan bilik və bacarıqlara əlavələr edilərək şagirdlərin bacarıqları yüksək səviyyəyə çatdırılır. Aşağı siniflərdə coğrafiya mövzuları bəzi bölgələrdə tarix, bəzi bölgələrdə kimya, fizika ilə birlikdə başqa fənn adı altında tədris olunur. Verilən coğrafi təhsilin əsas məqsədi şagirdlərin bu bacarıqları bütün həyatları boyu öz fəaliyyətlərində istifadə etmələridir. Bizim məktəblərdə isə coğrafiya heç bir fənlə birləşmir və yalnız fənlərarası inteqrasiya mövcuddur.

Almaniyada orta təhsil 2 pillədən ibarətdir. Bütün bölgələrdə 5-ci və 10-cu, Berlin və Bradenburg əyalətlərində isə 7-ci və 10-cu siniflər arası birinci pillə adlandırılır. Bölgələr üzrə tədris planlarında tərtib olunan mövzular məktəbin coğrafi mövqeyinə, şagird və müəllimlərin istək və dəyərləndirmələrinə görə hazırlanır. Bəzi bölgələrdə mövzular daha dərindən, bəzilərində isə səthi tədris olunur. Ümumi götürüldükdə, 10-cu sinfə qədər bütün bölgələrdə şagirdlər daha çox fiziki coğrafiyaya aid bilik və bacarıqlar əldə edirlər. Həftə üzrə dərs saatı da bölgələr üzrə dəyişir. Almaniya təhsilindən fərqli olaraq Azərbaycanda bütün bölgələrdə yerləşən məktəblərdə tədris proqramı və tədris saatları eynidir.

Orta təhsilin ikinci pilləsi 11 və 12 ci sinifləri, bəzi bölgələrdə 13-cü sinfi də əhatə edir. Bu pillədə şagirdlərə coğrafiya seçmə fənn kimi təqdim olunur və iqtisadi coğrafiyaya aid bilik, bacarıqlar qazandırılır. Təbiət elmləri təmayüllü siniflərdə, coğrafiya fənni həftədə 5 saat, digərlərində isə həftədə 3 saat məcburi tədris olunur. Bölgələr üzrə məktəblərdə fərqli dərsliklərdən və mövzulardan istifadə olunur.

Almaniyada son aparılan statistik araşdırmaya görə ümumi şagird sayı 7.352.753, xüsusi təhsilə ehtiyacı olan şagirdlərin sayı 500.544, inklüziv təhsilə cəlb olunan şagirdlərin sayı isə 157.201 nəfərdir. Almaniya məktəblərində inklüziv təhsil vacib bir mövzudur. İctimaiyyətdə bu istiqamətdə müxtəlif fikirlər çox olsa da inklüziv təhsillə bağlı empirik tədqiqatlar da mövcuddur. Almaniyada xüsusi təhsil həm ümumi təhsildəki dəyişikliklərdən, həm də beynəlxalq mübahisələrdən təsirlənərək keçid dövründədir. Almaniyada SİM uşaqları üçün xüsusi təhsil təminatı hər bir federal torpaq üzrə dəyişir. Bu müxtəlifliyə baxmayaraq, SİM şagirdlərinə pedaqoji dəstək daha çevik əsaslarla təşkil edilir və inklüziv təhsil sahəsində irəliləyişlərə nail olunur.

Almaniyada sağlamlıq imkanları məhdud şəxslər üçün dəstək və təhsil, Əsas Qanuna (Grundgesetz) və Sosial Məcəlləyə (Sozialgesetzbuch) tabe olan bir qanuni çərçivə ilə təmin edilir. Bundan əlavə, Birləşmiş Millətlər Təşkilatının Əlillər Hüquqlarına dair Konvensiyasının 2009-cu ilin martında Almaniyada qüvvəyə minməsi də, bu sahədə irəliləyişlərə zəmin yaratdı. Dövlət, Konvensiyanın məqsədlərinə müvafiq qanunvericiliklə, inzibati addımlar atmaqla çatır. Almaniyada təhsil müəssisələrinin əksəriyyəti dövlət orqanları tərəfindən maliyələşdirilir, yəni vəsaitlərin böyük hissəsi dövlət büdcəsindən təmin edilir. Almaniyadakı bütün şagirdlərin təxminən 6.6% -nin xüsusi təhsilə ehtiyacı var.

Almaniyanın inklüziv təhsil təcrübələrindən bir sıra ölkələr yararlanır ki, onlardan biri də Azərbaycandır. Bunun üçün Azərbaycanda bir sıra layihələr həyata keçirilib. Hətta, inklüziv təhsil üzrə pilot məktəblərinin direktorları, müəllimləri və xüsusi təhsil mütəxəssisləri üçün Almaniyada təlim səfəri təşkil edilib. Bakıda onlara Almaniyanın Oldenburq Universitetinin 4 nəfərdən ibarət professor heyəti tərəfindən iki həftəlik təlim də keçirilib.

**Danimarka**da təhsil digər ölkələrdə olduğu kimi pillələrə bölünmür. Orta təhsil 9 illikdir. 10 və 11-ci siniflər isə orta təhsilin yuxarı pilləsi adlanır. Orta məktəbdə tədris ili 40 həftə davam edir.

Danimarkada coğrafiyanın tədrisi digər fənlərin daxilində təhsilin ilkin pilləsindən başlayır. Coğrafiya fənninin minimal illik tədris saatı 7-ci siniflərdə 60 saat, 8-ci və 9-cu siniflərdə 30 saat olmaqla cəmi 120 saat götürülür. Burada əsas məqsəd şagirdlərin digər təməl fənlərlə birlikdə sadə coğrafi bacarıqlara yiyələnməsidir. Tədris ədəbiyyatı şagirdin öz həyat fəaliyyətində icra edə biləcəyi coğrafi məlumatlar əsasında hazırlanmışdır. “Təbiət və Texnologiya” fənni məktəbdə məcburi bir fənn olub 1-ci sinifdən 6-cı sinfə qədər tədris olunur. Bu fənn vasitəsilə şagirdlər elmi səriştələri inkişaf etdirməli, vacib fenomenlər və kontekstlər haqqında bilik və bacarıqlara yiyələnməlidirlər. Həmçinin gündəlik həyatda dəyəri olan düşüncələri, davranışları, konsepsiyaları inkişaf etdirməli və elmin əhəmiyyətini dərk etməlidirlər.

Coğrafiya müstəqil fənn kimi 7-ci sinifdən 9-cu sinfə qədər məcburi tədris edilir. Coğrafiya dərslərində şagirdlər, əsas coğrafi anlayışları, kontekstləri və cəmiyyətin təbii ehtiyatlardan səmərəli istifadə şərtlərini öyrənirlər.

Danimarkada 1970-ci illərdən inklüziv təhsilə maraq daha da artdı. Bu ölkədə bütün uşaqlar kimi SİM uşaqlarının da təhsil almaq hüququ var və uşaqların təxminən 10%-nin xüsusi təhsilə ehtiyacı var. SİM uşaqları həftədə ən azı doqquz saat Təhsil Nazirliyindən dəstək ala bilirlər. Danimarkada inklüziv təhsil hüququ nəinki qanuniləşdirilib, paralel olaraq inklüziv təhsilin reallaşdırılması üçün milli strategiya da hazırlanıb. Milli Resurs Mərkəzi bu prosesə nəzarət edir. İnklüziv təhsil sahəsində araşdırmalar aparan universitetlər bələdiyyələrin bu sahədəki fəaliyyəti ilə maraqlanır və hesabatlar hazırlayır. İnklüziv təhsil pedaqoqların hazırlanması bakalavr və magistr səviyyəsində həyata keçirilir. İnklüziv təhsil sahəsində işləyəcək gənc pedaqoqları hazırlayarkən onların konkret pedaqoji situasiyaya necə reaksiya verəcəklərinə diqqət yetirilir, bu istiqamətdə müxtəlif pedaqoji məsləhətlər işlənib hazırlanır. Tədris proqramına əsasən gələcək pedaqoqlar xüsusi kurs keçməlidirlər.

Danimarkada valideyn SİM uşağını istədiyi təhsil müəssisəsinə yollaya bilər. Həmin məktəblərdə xüsusi qrup psixoloqlar, loqopedlər və pedaqoqlar var ki, onlar SİM uşaqlarına xidmət üçün ezam olunurlar. Bu ölkədə SİM şagirdlərin mümkün qədər ümumi məktəblərdə təhsil almasına çalışılır. Bəzi məktəblər xüsusi təhsil üzrə ixtisaslaşmışdır. SİM uşaqlar üçün ehtiyac yaranarsa əlavə və ya əvəzedici təhsil də təşkil edilir.

Danimarkada Valideynlər uşaqlarının xüsusi təhsili üçün yerli bələdiyyədəki təhsil-psixoloji məsləhət xidməti (PPR) ilə əlaqə qururlar. Ehtiyac yaranarsa tədris prosesinə SİM şagirdi üçün əlavə pedaqoq və tibb bacısı da cəlb oluna bilər. Həmçinin valideynlər övladları üçün xüsusi təhsil və dəstəklə bağlı müəyyən bir qərarla razılaşmazlarsa, Xüsusi Təhsil Apellyasiya Şurasına müraciət edə bilərlər. SİM şagirdin vəziyyəti hər

il yenidən qiymətləndirilir, müəyyən qeydlər götürülür. Şagirdin güclü tərəfləri, maraqları və gələcəyə dair gözləntiləri üzə çıxarılır və sonda inkişafı üçün tələblər sənədləşdirilir.

## Nəticə

Finlandiya, Almaniya və Danimarkanın təhsil sistemlərində müxtəliflik olmasına baxmayaraq, hər ölkənin təhsil sistemini birləşdirən ortaq xüsusiyyətlər mövcuddur. Bu xüsusiyyətlər şagirdlərin coğrafi bilik və bacarıqlara yiyələnməsindən və bu bacarıqların öz həyat fəaliyyətlərinə tətbiqindən ibarətdir. İnklüziv təhsil sahəsində hər üç ölkəni birləşdirən ortaq cəhət 1970-ci illərdən sonra normativ aktların qəbulu və geniş islahatların həyata keçirilməsidir. Bu ölkələrdə inklüziv təhsil dövlət səviyyəsində inkişaf edir və onların təcrübəsi digər ölkələrlə yanaşı, Azərbaycan üçün də yol xəritəsi təqdim edir. İnklüziv təhsilin təşkilində ortaq problem isə SİM uşaqların tamamilə təhsilə cəlb oluna bilməməsidir.

## Ədəbiyyat

1. Europen Geography Education: The Challenges of a New Area.
2. Farklı ülkelerde coğrafya eğitimi ve öğretimi. Mayıs 2013. Ankara
3. https://eng.uvm.dk/primary-and-lower-secondary-education/the-folkeskole
4. https://vgdh.geographie.de/wp-content/docs/2014/10/geography_education.pdf
5. https://www.studying-in-germany.org/german-education-system/
6. https://journals.openedition.org/belgeo/10062?lang=en
7. Geografi Undervisningsvejledning 2019
8. Scandinavian Journal of Educational Research-2020
9. International Journal of Inclusive Education-2019
10. The Right to Inclusive Education in Germany-2014
11. Teacher attitudes towards inclusive education in Finland and Brandenburg, Germany and the issue of extra work-2016
12. https://www.unicef.org/azerbaijan/inclusive-education
13. TİPİİ.İnklüziv siniflərdə təlimin təşkili-2018

**Rəyçi: dos. N. Seyfullayeva**

Göndərilib: 22.12.2020 Qəbul edilib: 23.12.2020

DOI: 10.36719/2663-4619/61/170-173

**Mələkxanım İnqlab qızı İsmayılova**
Bakı Dövlət Universiteti
melekismayilova777@gmail.com

# ÇİNİN MÜASİR ENERJİ SİYASƏTİ: PROBLEMLƏR VƏ PERSPEKTİVLƏR

***Açar sözlər:*** *enerji, enerji təhlükəsizliyi, enerji siyasəti, Çinin inkişafı, yanacaq-energetika kompleksi*

## China's modern energy policy: challenges and prospects

**Summary**

China is the world's rapidly growing economy after the United States. Economic growth has increased China's energy demand. Ensuring energy security is important for China. In order to study China's modern energy policy, the article first examines the nature of the country's fuel and energy complex. The future prospects and problems of this field were discussed. The article also examines the main threats to China's modern energy security.

***Key words:*** *energy, energy security, energy policy, China's development, fuel and energy complex*

## Giriş

Enerji təhlükəsizliyi iqtisadi, siyasi və hərbi təhlükəsizliklə sıx bağlı olduğundan müasir dövrdə beynəlxalq təhlükəsizliyin təmin olunmasında böyük əhəmiyyətə malikdir. Enerji mənbələri dövlətlərin milli maraqlarının həyata keçirilməsində siyasi, iqtisadi və hərbi istiqamətlərə təsir edə bilir. Bu baxımdan da qədim dövrlərdən bəri enerji mənbələrinə sahib olmaq uğrunda mübarizə gedir. Dövlətlər enerji mənbələrinə sahib olmağı milli təhlükəsizliyin təmin olunması baxımından dəyərləndirirlər. Elə buna görə də, enerji ehtiyatları ilə zəngin olan bölgələr digər dövlətlərin hədəfinə çevrilir.

Beynəlxalq münasibətlər sahəsində enerji təhlükəsizliyi dedikdə, dövlətlərin enerji ehtiyaclarının etibarlı, təhlükəsiz mənbələrdən sabit qiymətlərlə təmin edilməsi nəzərdə tutulur. Enerji təhlükəsizliyinin vahid tərifi yoxdur. Son dövrlərdə yeni iqtisadi güclərin meydana gəlməsi dünya enerji bazarında canlanmaya səbəb olmuşdur. Belə ölkələrin iqtisadi inkişafında enerji amili böyük rol oynamışdır. Eyni zamanda neft və qaz kimi enerji mənbələrinin siyasi vasitə olaraq istifadə edilməsi enerjini ixrac və idxal edən dövlətlərin siyasətlərində böyük əhəmiyyət daşıyır. Bu baxımdan dünya enerji bazarında idxalatçı ölkə olan Çin üçün enerji mənbələrinin təhlükəsizliyinin təmin edilməsi davamlı iqtisadi inkişafında vacib yer tutur (Yergin, 2011: 13-15).

Çin tarixin bütün mərhələlərində dünyada öz yeri və təsiri olan ölkə kimi diqqəti cəlb edir. Bu gün təkcə Şərqi və Mərkəzi Asiyada, Yaxın və Orta Şərqdə deyil, bütün dünyada gedən proseslərə hərtərəfli təsir gücünə malik bir dövlət rolunu oynayır. Çin son otuz ildə iqtisadi, siyasi, mədəni və sosial inkişaf sürətinə görə bütün dünyanı heyrətləndirir. Dünyanın ən nəhəng iqtisadi və hərbi güclərindən birinə çevrilmişdir. Çinin iqtisadi inkişafında və milli təhlükəsizliyinin möhkəmləndirilməsində mənfi faktor kimi özünü enerji resursları və ərzaq məhsulları ilə təmin edə bilməməsi hesab olunur (Eyvazlı və b, 2017: 8).

1912-ci ildə min illik monarxiya rejimi dağılmış və Sun Yatsen rəhbərliyi ilə Çin Respublika elan olunmuşdu. 1912-1945-ci illər ərzində müharibələr meydanına çevrilən Çində iqtisadiyyat çökmüşdü. 1945-1949-cu illərdə ölkədə vətəndaş müharibəsi dövrü kimi xarakterizə olunur. 1949-cu il oktyabrın 1-də Çin Xalq Respublikası yaranmış və ölkə sosializm ideologiyası ilə idarə olunmağa başlamışdır. Mao Dzedunun yaratdığı ÇXR-in iqtisadiyyatı sosialist model əsasında qurulmuş və ölkə xarici dövlətlərdən təcrid olunmuşdur (İstikbal, 2019: 51).

1978-ci ildə Den Syaopin hakimiyyətə gəlmiş və iqtisadiyyatda bir çox islahatlar həyata keçirmişdir. Çində açıq qapılar siyasətinin həyata keçirilməsi ilə Çinin qapıları xarici investisiyaya və investorlara açılmışdır. "Çin səciyyəli sosializm" yolu tutmuş ÇXR-də bazar iqtisadiyyatına keçidə yer verilməsi, azad iqtisadi zonaların yaradılması, bir sözlə, iki əks qütbü əhatə edən iqtisadi sistemin yanaşı fəaliyyətinin təmin olunması qısa müddət ərzində ölkədə müsbət nəticələr vermişdi (Talıbov, 2015: 13).

Çin iqtisadiyyatı 1990-cı illərdən sonra yerli enerji mənbələri ilə kifayətlənə bilmədi. Enerjiyə olan tələbatını yerli istehsal hesabına təmin edə bilməyən Çin digər ölkələrdən asılı bir vəziyyətə düşdü. Neft hasilatı və istehlak balansının bərabərləşməsi Çinin neft idxal edən ölkə olmasına səbəb oldu. Çin 1995-ci ildən neft idxal edən ölkəyə çevrildi. Bu asılılıq Çinin daxili siyasətinin və xarici siyasətinin, bununla əlaqəli olduğu üçün enerji siyasətinin daha qlobal quruluşa sahib olmasını şərtləndirdi. Beləliklə, Çin enerji ehtiyatları olan ölkələrlə münasibətlərinə diqqət yetirməyə başladı (İstikbal, 2019: 52).

Çinin müasir enerji siyasətinin araşdırılması üçün əvvəlcə yanacaq-energetika kompleksinin səciyyəsinin öyrənilməsi vacibdir. Yanacaq-energetika kompleksi dünya iqtisadiyyatının əsasını təşkil edir. Yanacaq-energetika kompleksi yanacağın çıxarılması və işlənməsi, elektroenergetika həmçinin, yanacağın və elektrik enerjisinin daşınması və bölüşdürülməsi proseslərini özündə əks etdirir. Enerji mənbələri ümumi olaraq əsas və ikinci enerji mənbələri kimi fərqləndirilir. Əsas enerji mənbələri öz içində bərpa olunan və bərpa olunmayan enerji mənbələri olaraq iki yerə bölünür. Məsələn neft, təbii qaz və kömür bərpa olunmayan enerji mənbələrinə aiddir. Bununla birlikdə, hidroenerji, külək enerjisi, günəş enerjisi və nüvə enerjisi bərpa olunan enerji mənbələridir. İkinci enerji mənbəyi isə elektrik enerjisidir. Bu isə əsas enerji mənbələrindən əldə olunur (Bahgat: 2011, s. 9).

Çin hökuməti yanacaq-energetika kompleksinin göstəricilərinin yaxşılaşdırılmasına xüsusi diqqət yetirir. Bu kompleksin istehsal həcmlərinin artmasına baxmayaraq, yuxarıda qeyd edildiyi kimi, bütövlükdə tələbatın xeyli hissəsi idxal hesabına təmin edilir, ona görə də hökumət enerji resurslarından səmərəli istifadəni mühüm vəzifə kimi qarşıya qoymuşdur (Səmədzadə, 2009: 128).

Çin dünyanın yanacaq-energetika resursları ilə zəngin ölkəsidir. Onun yanacaq resursları strukturunda rəqabətsiz birinci yeri kömür tutur. Adətən Çində ümumi geoloji kömür ehtiyatları 1,5 trilyon ton, kəşf edilmiş ehtiyatlar isə 850 milyard ton qiymətləndirilir. Hətta bir ildə kəşf edilmiş 1 milyard ton kömür çıxarılsa belə, həmin ehtiyatlar 7-8 əsrə bəs edə bilər. Eyni zamanda, Çin ən müxtəlif markalı kömür ehtiyatlarına malikdir. Kömür mədənlərinin ümumi sayı isə 300-ə çatır. Onlar ölkənin bütün əyalətləri boyu yerləşir (Səmədzadə, 2009: 129).

Beynəlxalq Enerji Agentliyi (IEA) məlumatlarına əsasən, kömür dünya miqyasında istifadə olunan enerjinin 1/3-ni təmin edir. Elektrik istehsalının 38%-ni təşkil edən kömür dəmir və polad sənayesində mühüm rol oynayır. Neft və təbii qazın istifadəsinə baxmayaraq kömür gələcək əsrlər boyu əhəmiyyətli bir fosil yanacağı olmağa davam edəcəkdir. İEA-nın 2018-ci il kömür hesabatında göstərilmişdir ki, kömürdən uzaqlaşma hədəflərinə baxmayaraq bazar tendensiyaları dəyişə bilər. Kömür istehlakında Avropa və Amerikadakı azalmalar, Çin və Asiya ölkələrindəki artımlarla tarazlaşdırılacaqdır. Beləliklə, qlobal tələb 2023-cü ilə qədər sabit qalmağa davam edəcəkdir. Kömür bazarının əsas aktorlarından biri olan Çinin tələbinin 2023-cü ilə qədər tədricən azalacağı gözlənilir (7).

Çinin kömür tələbində gözlənilən azalmanın əsas səbəbi iqlim dəyişikliyi ilə bağlı olsa da, qazdan istifadənin artmasının da təsiri vardır. Dünyanın bir çox yerində kömür layihələri sərt müqavimətə məruz qalır və investorlar üçün güclü maneələr yaradır. İqlim dəyişikliyi və böhranın baş verməsi riski investorların bu sahəyə olan marağını azaldıb. Bu amillərə baxmayaraq, Çin iqtisadiyyatında struktur dəyişikliyi baş verir. Bu struktur dəyişiklikliyi tədricən istifadənin azalmasına kömək edəcəkdir. Çinin "mavi səma üçün müharibəni qazanmaq" şüarı ilə irəli sürdüyü siyasət kömürə tələbi azaldır. Kömürün daha təmiz istifadəsi əsas götürülsə də, kömürün maye, qaz və kimyəvi maddələrə çevrilmələri də strategiyanın başqa bir sütunudur (8).

Yanacaq resursları strukturunda neft və təbii qaz ikinci yeri tutur, lakin onların qiymətləndirilməsi çox fərqlidir. Çinin şimal-şərqində iri neft yatağı – Dassin yerləşir. Son zamanlar axtarış və kəşfiyyat işləri ölkənin qərb və şimal-qərb rayonlarına keçir. Burada neft və qaz sarıdan başlıca perspektivlər Turfan, Tarim, Tsaydam və Cunqar ovalıqları ilə bağlıdır. Bu işlər həmçinin San, Şərqi- Çin və Cənubi Çin dənizlərinin şelfində də davam etdirilir. Neft-qaz resurslarının aşkara çıxarılması işinə xarici şirkətlər də cəlb olunmuşdur. Dassində, Şenlidə və Şentszyuda neft ehtiyatlarının tükənməsi, şelfdə yataqların ləng istifadəyə verilməsi perspektiv üçün neft ehtiyatlarına yenidən baxılmasını zəruri etdi. (Səmədzadə, 2009: 130).

Bu sahənin inkişafı yolunda bir çox başqa çətinliklər də vardır. Ən böyük çətinlik texniki gerilikdir ki, bu səbəbdən də neftin çıxarılması cəmi 20-25% səviyyəsindədir. Neftayırma zavodlarının çox olmasına baxmayaraq, onların əksəriyyəti kifayət qədər məhsuldar olmayıb, dərin neft emalını təmin edə bilmir. Ona görə də yanacaq kimi burada xam neft və mazutdan geniş istifadə olunur. Neft kəmərlərinin uzunluğu 10 min kilometrdən artıq olsa da, onlar vahid sistem şəklində birləşdirilməmişdir. Bu kəmərlər ayrı-ayrı neft mədənlərini neftayırma zavodlarına və neft limanlarına bağlayır. Çinin keçmişdən bu günə qədər inkişaf edən iqtisadiyyatı onu neftdən asılı vəziyyətə gətirdi, bununla da neft özünü istehsal və idxal baxımından əhəmiyyətli bir mənbə kimi göstərdi (Səmədzadə, 2009: 130).

Çin inkişaf etdikcə neftə ehtiyac olacaqdır. Çinin neft hasilatı üç böyük neft şirkətinin əlindədir. Bunlara CNPC, Sinopec və CNOOC aiddir. Bu üç şirkət Çinin neft hasilatının 90%-dən çoxuna sahibdir. Beynəlxalq neft şirkətlərinin burada iştirakı adətən dənizdəki ehtiyatların kəşfiyyatı və ya texniki çətinliklərin qarşısını almaq üçün neft hasilatı pay bölgüsü müqavilələri yolu ilə həyata keçirilir. Çinin neft sənayesində özəl sektorun iştirakının artırılması maliyyə və qabaqcıl texnologiya təmin edilməsi baxımından vacib və prioritet bir siyasət halına gəldi. 2017-ci ilin may ayında qəbul olunan islahatlara görə Milli Neft Şirkətlərinin

korporativ idarəetməsini yaxşılaşdırmaq üçün "çox mülkiyyətli" islahatlarla özəl sektorların MNŞ-də iştirakı təmin edilmişdir. Bununla da əsas hədəf neft və qaz axtarışı və inkişafına onların dəstək verməsidir (9).

Çinin idxal etdiyi neft Yaxın Şərqdən, Afrikadan gətirilir. 2010-cu ildə Orta Şərq və Afrika, Çinin neft ehtiyacının ¾-i təmin edirdi. Onların 80%-i Malakka körfəzindən keçməklə gətirilir. Bu baxımdan Çinin neft idxalında Orta Asiyadan asılılığı gələcəkdə də davam edəcəkdir. Cənub-Şərqi Asiyadan daşınan neft miqdarı da artacaq və bu bölgənin təhlükəsizliyi Çin üçün böyük əhəmiyyət kəsb edəcək.

XX əsr boyunca neftin kölgəsində qalan təbii qaz qeyri-kommersiya məhsulu olaraq görülürdü. Beləliklə, bəzən yeraltıdan çıxarılmır və ya havaya buraxılırdı. XXI əsrdə təbii qazın neft qədər əhəmiyyətli olduğu aşkar edildi. Təbii qaz digər fosil yanacaqlara nisbətən ətraf mühitə daha az ziyanlıdır. Belə ki, təbii qaz ətrafa kömür və neftlə muüqayisədə daha az karbon emissiyaları və tullantılar buraxır. Bu səbəbdən qazdan istifadənin genişlənməsi ekologiyanın dekarbonizasiyasında mühüm bir addım kimi qəbul edilir.

Beynəlxalq Enerji Agentliyini qiymətləndirmələrinə əsasən, XXI əsr təbii qazın qızıl dövrü kimi qəbul edilmişdir. Bu təbii qazın üstünlüklərini nəzərə alaraq ondan geniş istifadə perspektivinin olması ilə bağlıdır. Enerjidən asılı olan inkişaf etmiş ölkələrin çoxunda qaz elektrik enerjisi istehsalı üçün istifadə olunur. Beləliklə, təbii qazdan istifadə enerji qaynaqlarında müxtəliflik yaradır (10).

Çinin qaz sənayesi öz inkişafının hələ başlanğıc mərhələsindədir. Kəşf edilmiş təbii qaz ehtiyatları hələ bu yaxınlarda 800 milyard kubmetr idi, sonra hətta 2 trilyon kubmetrə çatmışdır, potensialı isə 10 trilyon kubmetr həcmində qiymətləndirilir.

Çinin qaz sənayesində LNG özünəməxsus yer tutur. Bu baxımından Çinin LNG-nin gələcəyini formalaşdıracaq aktyor olacağı gözlənilir. Qarşıdakı dövrdə Çin Yaponiyanı üstələyərək dünyanın ən böyük LNG idxalatçısı olacaqdır. LNG qaz bazarında müxtəlifliyi artıracaq, rəqabəti təmin edəcək və Çinin mövcud idxal müəssisələrinə fayda gətirəcəkdir. Həmçinin də yerli qaz ötürmə xətlərinin inkişafına kömək edəcəkdir(10).

Çin dünyanın ən böyük bərpa olunan enerji bazarıdır və bu onun yanacaq-energetikasında özünəməxsus yer tutur. 13-cü beş illik planda Çinin hədəfi bərpa olunan enerjini 2020-ci ilə qədər 15%, 2030-cu ilə qədər isə 20%-ə çatdırmaqdır. Çində bərpa olunan enerjidə hidroenerji geniş yer tutsa da, külək və günəş enerjisi istehsalının da genişlənməsi müşahidə olunur. Bərpa olunan enerji Çində 2040-ci illərdə bütün istehsalın 60%-ni təşkil edəcəkdir. Hidroenerji Çinin enerji sənayesindəki ən böyük bərpa olunan enerji mənbəyidir və növbəti illərdə öz payını qoruyacağı düşünülür. Dünyadakı hidroenerjinin ¼ -ni təkcə Çin təşkil edir. 2016-cı ildə Çində hidroenerjidən 1200 TW elektrik enerjisi əldə edilmişdir və bu Almaniya ilə müqayisədə iki dəfə çoxdur. Bərpa olunan hidroenerji üçün hökumət 2020-ci ilə qədər 340 GW-a qədər hədəf müəyyən etmişdir. Yeni hidroenerji üçün uyğun sahələri tapmaqda çətinlik artdıqca genişlənmə nisbəti məhdudlaşacaqdır (11).

Günəş enerjisi Çinin yanacaq-energetika sənayesində gələcəkdə əhəmiyyətli yer tutacaqdır. Bu gün Çin bu sahədə texnologiya baxımından dünyada qabaqcıl ölkədir. Günəş enerjisindən istifadə nəticəsində elektrik enerjisi istehsalında maya dəyərinin azalmasını nəzərə alsaq, onun ən ucuz elektrik enerjisi mənbəyi olması hesab olunur. Eyni zamanda, Çinin əksər bölgələrində günəş enerjisinin inkişafı üçün əlverişli şərait mövcuddur.

Külək enerjisi Çinin enerji bazarında sürətlə inkişaf edən bərpa olunan enerji mənbəyidir. Çinin külək enerjisindən istifadə imkanları böyükdür. Külək stansiyaları bir çox bölgədə quraşdırılıb. Bu bölgələrə Monqolustan, Sincan, Gansu və Ningxia misal göstərmək olar. Bu bölgələr ölkənin quraşdırılmış külək enerjisi tutumunun 52%-ni təşkil edir. 2016-cı ildə külək enerjisi istehsalı 242 TW/saat çatdı. Beləliklə, elektrik enerjisi istehsalında kömür və hidroelektrik enerjidən sonra üçüncü yerdə qərarlaşdı. 2016-cı ildə Çin məcmu külək enerjisinin həcminə görə Avropa İttifaqını üstələmişdir. Çin həmçinin açıq dənizdə 1,6 GW həcmində külək enerjisinə sahibdir. Bu sahədə Avropa İttifaqından sonra ikinci yerdədir. 2020-ci ildə bərpa olunan enerjidə külək enerjisinə görə Çin 210 GW quraşdırılmış güc və təxminən 420 TW/saat elektrik enerjisi istehsal etməyi hədəfləyir. Çində külək stansiyalarının quraşdırılması yanacaq-energetika balansında gərginliyi azaldacaqdır (11)

Enerji təhlükəsizliyi üçün Çinin qarşıya qoyduğu hədəflərə görə bərpa olunan enerjinin istehlakdakı payı 15% -i keçəcək. Bu nisbətdə ən vacib rolu nüvə enerjisi oynayır. Nüvə qaynaqlı elektrik enerjisi istehsalı son 10 ildə sürətlə artdı və beləliklə, 2005-ci ildə 53 TW-dan (2%) 2016-cı ildə 213 TW (3,5%)-a yüksəldi. Başqa sözlə, 11 ildə təxminən iki dəfə artdı. Nüvə enerjisi 2040-cı ilə qədər 1100 TW-a (11%) çatacağı gözlənilir. İEA-nın 2018-ci il hesabatına əsasən, Çin 2030-ci ildə nüvə stansiyalarından alacağı elektrik enerjisi ilə ABŞ və Aİ-ni keçəcəyi gözlənilir(12).

Böyük nailiyyətlərə baxmayaraq, Çinin yanacaq-energetika kompleksi öz inkişafında bir çox çətinliklərlə üzləşməyə davam edir. Bunlara misal olaraq, kömür sənayesində texniki geriliyi, neft məhsullarının çatışmazlığını

və qaz sənayesinin yavaş inkişaf etməsini göstərmək olar. Bu baxımdan, Çin bərpa olunan enerji mənbələrindən istifadəni artırmaqla daxili ehtiyatları hesabına öz enerji təhlükəsizliyini təmin edə bilər (13).

Beləliklə, Çin öz enerji resurslarına olan tələbatının ödənilməsində xarici bazara istiqamətlənir. Bu baxımdan Afrika və Yaxın Şərq üstünlük təşkil edir. Həmin regionlar üçün xarakterik olan qeyri-stabilliyi və uzaq dəniz marşrutu ilə bağlı riskləri nəzərə alsaq, qeyd edə bilərik ki, ÇXR-ə enerji resurslarının çatdırılması təhlükəsizliyinə potensial hədədir. Beləliklə, Çin riskləri azaltmaq və enerjinin nisbətən stabil çatdırılmasını təmin etməli olacaq. Bu mənada bugün Mərkəzi Asiya Çin üçün ən mühüm perspektiv tərəfdaşdır (Abbasbəyli, 2011: 553).

Çində 12-ci beşillik plan (2010-2015) enerji siyasətinin yaxşılaşdırılması üçün əsas mərhələ hesab olunurdu. Bu siyasətin mahiyyətini iqtisadiyyatın enerji mənbələri ilə təchizatı problemini həll etmək və eyni zamanda ölkənin yanacaq-energetika kompleksində köklü bir islahat aparmaq təşkil edir (Zhang, 2009: 11). 2020-ci il Çinin enerji sektorunda mühümdür, çünki 13-cü beş illik planın (2016-2020) son ilidir. Çin hökumətinin bu illər üçün qətiyyətli planları var idi, lakin Covid-19 pandemiyası dünya iqtisadiyyatını və enerji sektorunu zəiflətdi. Pandemiya dövründə neft şirkətləri xaricdəki maliyyə xərclərini azaldaraq daxili bazarda neft istehsalına diqqət yetirdilər. Bununla da xaricdən asılılıqlarını azaltmağa çalışırlar.

İEA-nın bərpa olunan enerji haqqında 2020-ci il məlumatına əsasən, Covid-19 pandemiyası enerji sektorunun bir çox sahəsində azalmalar yaratdığı halda bərpa olunan enerji sürətlə artacaqdır. 2020-ci ilin ilk 6 ayını 2019-cu ilin eyni dövrü ilə müqayisə etsək, Çində neft, qaz və kömür istehsalında artım görürük. Eyni zamanda bu artımı bərpa olunan enerji mənbələri olan külək günəş və hidroenerji üçün demək olar (11).

## Nəticə

Çin dünyanın ən çox əhalisi olan və sürətlə böyüyən iqtisadiyyata malik ölkəsidir. İqtisadiyyatın inkişafı Çinin enerjiyə olan tələbatını artırır. Ölkənin özünü enerji ehtiyatları ilə təmin edə bilməməsi nəticəsində ixracatçı ölkədən idxalatçı ölkəyə çevrildi. Bu asılılıq Çinin daxili, xarici siyasətinin və həmçinin enerji siyasətinin qlobal səviyyədə nəzərdən keçirilməsini şərtləndirdi. Çinə enerji ehtiyatlarının çoxu qeyri-sabit region olan Yaxın Şərq ve Afrika regionundan gətirilir. Həmçinin, ticarət müharibələri Çinin enerji resurslarına çıxışını təhdid edir. Çinə enerji ixrac edən İran, Rusiya, Anqola və Venesuela kimi ölkələr ABŞ tərəfindən sanksiyaya məruz qalır. Çinə tətbiq olunan ticarət tarifləri Çini çətin siyasi və iqtisadi vəziyyətə salır. Çin üçün enerji ehtiyatları olan bölgələr və onların sabitliyi əhəmiyyət qazandı. Bu baxımdan enerji təhlükəsizliyi Çin üçün prioritet sahəyə çevrilir. Buna görə də enerji təhlükəsizliyinin təmin edilməsi strateji cəhətdən mühüm məsələdir. Əsas enerji mənbələrini diversifikasiya etmək üçün yeni ixracatçıların axtarılması və enerji ixracının daha rasional strukturunu yaratmaq tələb olunur.

## Ədəbiyyat

1. Yergin D. The Quest: Energy, Security and Remaking of the Modern World. US, Penguin Press, 2011, p. 832
2. Eyvazlı C.V, Ələkbərova A.F. Çin Xalq Respublikasının müasir regional siyasəti. Bakı: Mütərcim. 2017, s. 120
3. İstikbal D. Rejimin meşruiyeti ve enerji güvenliği: Çin Kommunist partisinin enerji politikaları. Uluslarası Ekonomi, İşletme ve Politika dergisi, 2019, 3(1), s. 49-68
4. Talıbov R. Asiya ölkələri beynəlxalq münasibətlər sistemində. Bakı, «Elm və təhsil», 2015, s. 312
5. Bahgat G. Energy Security: An Interdisciplinary Approach. Chichester: John Wiley & Sons Ltd, 2011, p. 254
6. Səmədzadə Z. Çin qlobal dünya iqtisadiyyatında. Bakı, "Elm və təhsil" nəşriyyatı, 2009, s. 608
7. İEA Coal Report, 2018, p. 153
8. İEA Coal İnformation Overview, 2019, p. 168
9. İEA Oil information Overview, 2019
10. İEA Natural Gas information Overview, 2019
11. İEA renewable report 2020//https://www.iea.org/reports/renewables-2020
12. Nuclear power in China //https://cnpp.iaea.org/countryprofiles/China/China.htm
13. Abbasbəyli A.N. Dünya siyasət. Bakı, "NURLAR" Nəşriyyat-Poliqrafiya Mərkəzi, 2011, s. 584
14. Zhang J. Energy Security: Prospects, Challenges, Opportunities. China, Autumn 2009, p. 32

**Rəyçi: prof. İsmayıl Musa**

Göndərilib: 21.12.2020 Qəbul edilib: 22.12.2020

DOI: 10.36719/2663-4619/61/174-178

**Cavidan Baladayı oğlu Nəzərov**
nezerovaturkan29@gmail.com
Bakı Dövlət Universiteti

# TSİKLİK İQTİSADİ İNKİŞAFIN HÜQUQİ TƏNZİMLƏNMƏSİ VƏ TSİKLLƏRİN FAZALARI

***Açar sözlər:*** *böhran, iqtisadi inkişaf, tsiklik fazalar, dövlət tənzimlənməsi, hüquqi normalar, maliyyə böhranı, fiskal və monetar siyasət, hüquqi tənzimləmə*

**Legal regulation of cycle economic development and phases of cycles**

**Summary**

The subject of the article covers issues that have been relevant since the last century. The study of economic fluctuations, the study of their causes allows us to make proposals to eliminate its negative consequences. Frequent crises since the early twentieth century necessitate the expansion of research in this area.

The peculiarities of cyclic phases require different approaches and problem-oriented regulatory policies. For this reason, it is necessary to pursue an adequate state policy. Normative legal acts, laws and decisions are the main tools of legal regulation. Steps are also being taken to reduce the negative effects of the cyclical phases used by the Central Bank and other banking and financial institutions

***Key words:*** *crisis, economic development, cyclical phases, government regulation, legal norms, financial crisis, fiscal and monetary policy, legal regulation*

## Giriş

Tədqiqat zamanı, tarixi metoddan istifadə edilərək iqtisadi tsikllərin baş vermə səbəbləri araşdırılmışdır:

- Fazaların bir-birini izləməsinin qanunauyğunluqları müəyyən edilmiş;
- Tsiklik tərəddüdlər zamanı iqtisadi inkişafın davamlılığına nail olmanın yolları tədqiq edilmiş;
- Son övrlərdə qlobal hadisələrlə bağlı baş vermiş və ya baş verməsi ehtimal edilən böhran fazalarında tənzimləmə yolları tədqiq edilmiş;
- Tədqiqat aparılması ilə tsiklik iqtisadi inkişafın idarə olunmasının funksiyaları və perspektiv imkanları öyrənilmişdir.

Məlumdur ki, təbiətdə mövcud olan hərşey bəlli tərəddüdlərlə inkişaf edir. İqtisadi hadisələr də bundan yan keçmir. İstər makroqtisadi, istərsə də mikroiqtisadi cəhətdən iqtisadi proseslərdə inkişaf bir istiqamətli olmayıb, zaman-zaman böhranlarla, enmələr-qalxmalarla müşahidə olunur. Bu cür dəyişmələrlə müşahidə olunan inkişafın yaradacağı mənfi nəticələrin aradan qaldırılması, makroiqtisadi tarazlığın və sabitliyin əldə olunması üçün dövlətin məqsədyönlü tədbirlər həyata keçirəsi labüddür. Bunun üçün antitsiklik siyasət həyata keçirən dövlət tənzimləyici rolunu hüquqi cəhətdən həyata keçirir. İqtisadi sabitlik elə bir anlayışdır ki, biz onu ayrı-ayrı iqtisadi sahələrə deyil, bütövlükdə iqtisadiyyata aid edirik. Belə olan halda sabitliyin pozulması bütövlükdə ölkənin iqtisadi inkişaf dinamikasında dəyişikliyə səbəb olur. Məqalənin mövzusu o səbəbdən əhəmiyyətlidir ki, iqtisadi inkişaf tarixinin bütün dövrlərində böhranlar, enmələr müşahidə olunmuşdur. Mövzunun təhlili, tsiklillərin araşdırılması, tsikllərin xarakteristikasının öyrənilməsi bizə imkan verir ki, onun mənfi nəticələrinin aradan qaldırılması və ya zəiflədilməsi üçün təkliflər irəli sürə bilək. İqtisadi inkişaf, habelə iqtisadi artım nəticə etibarilə dövlətin iqtisadi cəhətdən qüdrətlənməsinə əsas verir.

Qloballaşan iqtisadi münasibətlər fonunda tədqiq edilən mövzu olduqca aktualdır. 2008-ci ildən başlayan və günümüzdə də fəsadları ayrı-ayrı sektorlarda müşahidə edilən maliyyə və iqtisadi böhranların öyrənilməsi, iqtisadi tsikllərin durğunluq və böhran dövrlərində idarəedilməsi məsələləri, bu məsələdə daxili və xarici faktorların, iqtisadi şokların qiymətləndirilməsi, həll yollarının, tənzimləmə istiqamətlərinin, funksiyaların müəyyən edilməsi, nəticə etibarilə, iqtisadiyyatın ayrı-ayrı sahələrinin inkişaf dinamikasında öz müsbət nəticələrini göstərəcəkdir.

## Nəticə

Tsikl dedikdə biz elə bir iqtisadi vaxt periodu başa düşürük ki, həmin dövrdə zamanla əmtəə və xidmətlərin həcmində artma, durğunluq, azalma kimi mərhələlər bir-birini əvəz edir. İqtisadi tsikl dedikdə dövrü olaraq dörd mərhələdən keçən iqtisadiyyatın ümumi vəziyyəti başa düşülür. Bir tsikl daxilində bu hadisələrdə müəyyən təkrarlanmalar baş verir ki, bunu tsiklin fazaları adlandırırıq. Tərifi elmi ifadə ilə belə deyə bilərik: İqtisadi tsikl, iqtisadiyyatda bir tarazlıq vəziyyətindən digər tarazlıq vəziyyətinə qədər olan dövrü, yaxud da bir böhran nöqtəsindən digərinə qədər keçən dövrü ifadə edir. Bəzi iqtisadi ədəbiyyatlarda tsiklik inkişafın əsasən sənayə sahəsi üzərindən öyrənilməsini irəli sürərək, iqtisadi tsikli sənaye tsikli də adlandırırlar. İqtisadi inkişafda müşahidə olunan qeyri-sabitlik müxtəlif xarakter alırsa, bu hal iqtisadi tsikl adlanır.

İqtisadi böhranların öyrənilməsi, böhrandan çıxış yollarının araşdırılması məsələləri iqtisadi məktəb nümayəndələrinin diqqət mərkəzində olsa da, bu mövzuya əhatəli yanaşma 1929-1933-cü illəri əhatə edən "Böyük İqtisadi Böhran"-ın baş verməsindən sonra yaranmışdır.

Makroiqtisadi qeyri-sabitliyin müşahidə olunduğu dövrlərdə iqtisadi fəaliyyət sahələrinin bütün istiqamətlərində qiymətlərin səviyyəsində, məşğulluq və işsizliyin nisbətində, sahələr üzrə istehsalın həcmində əhəmiyyətli dəyişikliklər nəzərə çarpır. Belə ki, iqtisadi qeyri-stabillik zamanı istehsalın həcmi azalır və müəyyən zaman kəsiyində əmtəə və xidmətlər istehsalının artırılması mümkün olmur. Bu isə öz növbəsində bazarda məcmu tələb və məcmu təklif arasındakı tarazlığın pozulması ilə nəticələnir. İqtisadiyyatın tsiklik inkişafı müxtəlif iqtisadi məktəblərin araşdırma mövzusu olmuşdur. C.M.Keyns, K. Marks, Y.Şumpeter, C.Klark və digərlərinin tədqiqat obyekt olmaqla, onlar tərəfindən nəzəriyyələr irəli sürülmüşdür. Monetarist iqtisadi məktəbinin nümayəndələri iqtisadi fazaların dəyişimini kredit faiz dərəcələri ilə əlaqələndirirdilər. Faiz dərəcələrindəki dəyişimlər tədricən ev təsərrüfatları, müəssisə və firmalar, habelə hökümət tərəfindən borcalmaya bu və ya digər formada təsir etdiyindən iqtisadi aktivliyi azalda və ya təhrik edə bilir. Bəzi iqtisadçıların fikrincə praktik olaraq iqtisadi tarazlıq mümkün deyildir, yalnız bir-birini əvəz edən tsiklik periodlar vardır (Allahverdiyev, 2009).

İqtisadi qeyri-sabitlik həm daxili, həm də xarici təsirlər hesabına formalaşa bilir. Xarici təsirlərə: innovativ dəyişikliklər, ixtiralar, istehsala təsir günündə olan texnika və texnologiyaların inşikafı; müharibələr, siyasi proseslər; yeni yananacaq və qiymətli metal yataqlarının kəşfi və s. aid ola bilər.

Daxili təsirlər: şəxsi istehlakın həcminin dəyişməsinə müvafiq istehsalda və məşğulluq nisbətindəki dəyişmələr, əsas kapitalın xidmət üçün yararlılıq xidməti, əsaslı kapital qoyuluşunun artırılması, istehsalın modernləşməsinə, innovativ istiqamətlərə kapital yatırımlarının edilməsi, dövlətin iqtisadi siyasətinin dolayı və birbaşa alətləri hesabına istehsalın həcminə, istehlak və tələbata təsirlər və sair.

Tsiklik iqtisadi inkişafın öyrənilməsində digər bir məsələ onun qısamüddətli və uzunmüddətli dövrdə fərqli xarakteristikaya sahib olmasıdır. Bu fərqlilik özünü ən çox qiymətlərin səviyyəsində göstərir. Belə ki, uzunmüddətli dövrə qiymətlər bazarda tələb və təklif arasınakı dəyişməni tez əks etdirir. Qısamüddətli dövrdə isə qiymtlər müəyyən zaman üçün sabit qəbul edildiyindən bazarda tələb və təklifin uzlaşması nisbətən qorunur. Uzunmüddətli dövrdə pul bazarında məcmu təklifin həcmi, əsasən, nominal göstəricilərə təsir edir, nəinki real göstəricilər. Nəticə etibarilə, bazarda pul kütləsinin azalması əmtəə və xidmətlərin qiymətlərini aşağı salır. Uzunmüddətli dövrdə qiymətlərin dəyişməsi nominal əməkhaqqının həcmini dəyişsə də, real əmək haqqı, istehsalın həcmi və işsizlik səviyyəsi kimi iqtisadi kateqoriyalarda nəzərəçarpan dəyişiklik yaratmayacaqdır. Uzunmüddətli və qısamüddətli dövrlərdə inkişafın təlatümlüyü makroiqtisadi qeyri-sabitliyin göstəricisidir.

İqtisadi tsikllərin yaranma səbəbləri müxtəlifdir, bunlara iqtisadiyyatda zamanla investisiyaların həcmindəki artma-azalmalar, bəzi hallarda investisiya imkanlarının tükənməsi, bazarda pul kütləsinin həcminin dəyişməsi, real istehsal imkanları ilə planlanan iqtisadi istehsalın üst-üstə düşməməsi kimi səbəbləri sıralamaq olar. Aparılan tədqiqatlar göstərir ki, iqtisadi stabilliyi pozan, zamanla iqtisadi sistemə təsir göstərən impulslardır. Bu impulslar hesabına təsir şokları yaranır və iqtisadi sistemin tarazlığında tərəddüdlər əmələ gəlir. İqtisadçı alimlər sözügedən impulsların aşağıdakı növlərini ayırırlar:

1. Əsas təsiri istehsal üzərindən müşahidə edilən təklif şokları-bu impulslara dünya bazarında xammal məhsullarının qiymətlərinin tez-tez dəyişməsini, iqlim dəyişikliklərini, innovativ yenilikləri, yeni texnika və texnologiyanın ixtiraları, yeni xammal mənbələrinin kəşfi və sair aid edilə bilər.
2. Makroiqtisadi səviyyədə verilən qərarlar və qanunlarla bağlı olan və əsasən tələbə təsir göstərən şoklar. Bunlara dövlətin monetar-pul və fiskal siyasətini, borc faiz həcmindəki dəyişmələri, valyuta məzənnəsinin qeyri-sabitliyi, dalğalanmaları və s. aiddir.
3. Özəl sektorda yaranan tələb şokları-Bunlar iqtisadiyyatın müxtəlif sektorlarında investisiya yatırımları, habelə istehlakçıların xərclərinin həcmindəki dəyişmələrlə xarakterizə edilir (2).

Karl Marksın iqtisadi yanaşmasına əsasən, iqtisadi stabilliyin pozulduğu dövrlərdə ortaya çıxan tsiklik fazalar dörddür:

- İqtisadi böhran-tsiklik periodun birinci fazası olan durğunluq dövründə xalq təsərrüfatının və ya istehsalın ayrı-ayrı sektorlarında deyil, bütünlükdə əmtəə və xidmətlər istehsalında, təsərrüfat fəaliyyətində sarsıntı və çöküş müşahidə edilir. İqtisadi böhran dövrünün səciyyəvi xüsusuiyyəti istehsal edilən mal və məhsulların həcminin bazarda həmin əmtəələrə olan tələbi üstələməsidir. Alqı-satqı əməliyyatlarının çətinləşməsi, həddən artıq istehsalla əlaqədar tədricən istehsalın fəaliyyətinin zəifləməsi, işsizlik faizlərinin artımı, istehlakçıların alıcılıq qabiliyyətinin aşağı düşməsi böhran fazasının xarakterizə edən əsas xüsusiyyətlərdəndir. Ölkənin pul-kredit, maliyyə sistemi çökür, kiçik və orta sahibkarlıq müəssisələrindən başlayaraq biznes sektorunda iflaslar müşahidə edilir. Əhalinin rifah halı pisləşir, orta təbəqənin sayı azalmaqla yoxsulluq kütləvi xarakter alır.
- Durğunluq-böhran fazası tədricən durğunluq övrü ilə əvəvz olunur. Bu dövr uzun müddət ərzinə davam edə bilər. Xarakteristik xüsusiyyətləri əhalinin alıcılıq qabiliyyəti nisbətən yaxşılaşsa da, əmtəə və xidmtələrə aşağı tələbin olması, işsizlik faizinin yüksək olması, zamanla qiymətlərin enməsinin qarşısının alınması, istehsalın həcminin sabit saxlanılması və sairdir.
- Canlanma-İstehsalın genişlənməsilə iqtisadi inkişafı canlanma mərhələsi başlayır. Zamanla istehsalın həcmində əsaslı artım müşahidə edilir, işsizlik faizləri azalmağa başlayır. İstehsal amilləri bazarına amil məhsullarına olan tələb artır, borc faiz dərəcələri və qiymətlərdə artım müşahidə olunur.
- Yüksəliş-istehsal potensialından tam istifadə edilməsi və qısa zaman kəsiyində mənfəətin maksiumumlaşırılması imkanı iqtisadi inkişafın canlanma mərhəsindən yüksəliş mərhələsiə keçidə əsas verir. İstehsalın tam həcmə işləməsi işçi qüvvəsi bazarını canlandırdığından və işçi qüvvəsinə olan tələbi artırdığından məşğulluğun təmininə və əmək haqqının artımına səbəb olur. Həm işçilərin, həm də kapital sahiblərinin gəlirləri özünün maksiumum həddinə çatır (Veral, 2018: 463-488).

İqtisadi dövrləri müəyyən etmək üçün məşğulluğun səviyyəsi, faiz dərəcələri, istehlak xərclərinin həcmi kimi iqtisadi kateqoriyalardan istifadə edir.

Hökumətlər və böyük maliyyə qurumları iqtisadi dövrlərin gedişatını və təsirlərini idarə etmək üçün müxtəlif vasitələrdən istifadə edirlər. Hökumətin idarəedici aləti maliyyə siyasətidir. Böhranın aradan qaldırılması üçün hökumətlər genişləndirici maliyyə siyasətini tətbiq edir. Əksinə, yüksəliş dövrlərində ümumi xərcləri azaltmaq üçün vergi və büdcə profisiti tətbiq edərək daraldıcı maliyyə siyasəti tətbiq edirlər. Mərkəzi banklar iqtisadi dövrlərin idarəedilməsi üçün pul siyasətindən istifadə edir. Belə ki, iqtisadiyyatda durğunluq və enmələrin müşahidə edildiyi zamanlarda genişləndirici pul siyasəti hesabına faiz dərəcələrini aşağı salır, xərcləri və ya investisiya yatırımlarının həcmini artırır. Əksinə, iqtisadiyyat yüksəliş dövründə olduqda daraldıcı siyasət yeridir. Bu dövlərdə Mərkəzi bank faiz dərəcələrini artırır, infilyasiya təzyiqlərini azaldır, kredit axınlarını yavaşladır (Veral, 2018: 463-488).

Yüksəliş dövründə investorlar, əsasən, texnika və texnologiya məhsullarının, iri şirkətlərin, enerji şirkətlərinin alışını həyata keçirdikləri halda, böhran dövrlərində isə investorlar kapital yatırımını maliyyə, kommunal, səhiyyə cəhətdən tənəzzül edən şirkətlərin alışına sərf edirlər.

Qeyd etdiyimiz kimi, iqtisadi tsikllər müəyyən fazalar üzrə hərəkət edirlər. Bu hərəkət trayektoriyası çevrəşəkilli deyil, spiralvaridir, yəni fazaların bir-birini əvəz etməsi həm uzunmüddətli, həm də qısamüddətli dalğalanmaları ehtiva edir. Bu aspektdən yanaşıldıqda iqtisadi tsiklləri aşağıdakı formaları fərqləndirilir:

Uzunmüddətli tsikllər-iqtisadi inkişafın uzun zaman kəsiyində davam edən tərəddüdləridir. Bu tərəddüdlər bəzi hallarda əlli ilə qədər davam edir. İqtisadi ədəbiyyatlarda "Kondratyev" tsiklləri şəklində adlandırılır. Kondratyev dalğaları texnoloji inkişafın gətirdiyi yüksəliş dövründən sonra ortaya çıxan uzunmüddətli dövrlərdir. Öz adını rus kommunist iqtisadçısı Kondratyevin adından götürən bu iqtisadi tsikllər 18-ci əsrdən etibarən təsbit edilməyə başlanılmışdır. Kondratyev hesab edirdi ki, sözügedən dalğalanmalar özündə təkamül və özünüyeniləmə dövrlərini ehtiva edir. Əlavə olaraq, Kondratyev tsikllərinin dörd alt mərhələsi vardır:

I dövr: infilyasiya ilə yanaşı məhsuldarlığın artması, habelə iqtisadi partlayışla xarakterizə edilir.

II dövr: iqtisadi böyümənin tədricən yavaşlaması, işə münasibətin dəyişməsi, ümumi məhsul həcmindəki artımın stabilliyi ilə müəyyən edilir.

III dövr: iqtisadi şərtlərin pisləşməsi hesabına inkişaf perspektivləri azalır, daraldıcı təcrid siyasətini labüd eən deflyasiyalı artım spiralı yaranır.

IV dövr: İqtisadiyyatdakı çöküş, əhalinin sosial təbəqəsi arasında uçurum tədricən dərinləşir. Orta təbəqəli əhali qrupları itir, həm iqtisadi, həm də sosial cəhətdən depressiya müşahidə edilir (4).

Kondratyevin yanaşması ortodoks iqtisadi nəzəriyyəyə müvafiq olduğundan qəbul edildi, lakin kommunist cəmiyyətində birmənalı qarşılanmadı. Buna səbəb Kondrtayvein kapitalist cəmiyyətlərin qaçılmaz məhv yoluna olmadığını, əksinə zamanla dəyişən fazalara inkişaf meyilli olduğunu sübut etməsi idi.

Digər bir qrupa səkkiz-on iki il davam edən sənaye tsiklləri aiddir.

Üçüncü qrupa üç-dörd il müddətində mövcud olan "Kitçin" dalğalanmaları aiddir.

Hazırda iqtisad elminə 1300-dən çox tsikl növü məlumdur ki, bunların hər biri müxtəlif iqtisadi sektora təsir göstərməklə tərəddüdlərin meydana gəlməsinə səbəbiyyət verir.

Tsikllərin iqtisadi davam müdətinə görə aşağıdakı növləri fərqləndirilir:

1. İki-dörd il ərzinə davam edən Kitçin tsiklləri. Onun əsas xarakteristik xüsusiyyətləri infilyasiya dalğalanmaları, məşğulluq-işsizlik nisbətində, ehtiyyatların həcmində dəyişmələr və sairdir.
2. Yeddi-on iki il davam edən Cuqlar tsiklləri-İnvestisiya tsiklləri adlanan bu fazalar infilyasiya və məşğulluq dərəcələrinin dəyişməsində özünü göstərir.
3. On altı-iyirmi beç il davam edən Kuznesta tsiklləri-gəlirlərdə, məcmu tələbin həcmində, immiqrasiyadaki dəyişmələrdə özünü göstərir.
4. Qırx-altmış il davam edən Kondratyev tsiklləri-əsaslı struktur dəyişiklikləri, tələbə təsir edəcək gücdə texnoloji yeniliklər zamanı yaranır.
5. İki yüz ilə qədər davam edə bilən Forrestera dalğalanmaları-enerji və materiallar sektorunda köklü dəyişikliklər və istehsalın strukturunun dəyişməsi ilə xarakterizə edilir.
6. Min illərlə avam edə bilən Toffler dalğalanmaları-bəşər sivilizasiyalarının inkişafı ilə mümkün olur (2).

Dövlətin iqtisadiyyata tənzimləyici müdaxiləsinin labüdlüyü 1929-32-ci illərdə "Böyük durğunluq" zamanında özünü daha qabarıq göstərdi. Cəmiyyəti mövcud sosial-iqtisadi böhrandan çıxara bilmək üçün hüquqi və iqtisadi tənzimləmə qaşılmaz oldu. Beləliklə, dövlət öz üzərinə bir sıra iqtisadi və hüquqi funksiyalar, vəzifələr götürməli oldu.

Uzunmüddətli dövrdə iqtisadi stabilliyin təmini, geniş təkrar istehsalın stimullaşdırılması, makroiqtisadi tarazlığın təmini, səmərəli idarəçiliyin təşkil edilməsi, işgüzar fəaliyyətin yaxşılaşdırılması məsələləri üçün dövlətin hüquqi baza əsasında tənzimləmə tədbirləri görməsi tələbolunandır. Dövlətin bu istiqamətdəki tənzimləmə siyasəti antitsiklik siyasət adlanır.

İqtisadi artım heç də hər zaman iqtisadi inkişaf anlamına gəlmir. İqtisadiyyatın ayrı-ayrı sektorlarındakı rəqəmsal artım əhalinin rifah halında öz əksini tapmadığı halda bu artımı inkişaf kimi xarakerizə etmək yalnış olardı. Eyni zamanda sosial və iqtisadi inkişaf anlayışları da bir-birindən ayrılır. Müxtəlif əhali qruplarına iqtisadi fəaliyyətin göstərdiyi təsirlər tədricən sosial problemləri də gündəmə gətirir və aktuallaşdırır. Məsələn, sənaye və emal sahəsinin inkişafı, bu sektorlardakı inkşafın ixrac yönümlülüyünün artımı sənaye sahələrini kənd təsərrüfatına nisbətdə daha gəlirli edir. Kənd və şəhər arasında yaranan iqtisadi boşluqlar zamanla əhali qruplarının davranışında öz əksini tapmağa başlayır. Biz bunun regionlar arasındakı disproporsiya, bəlli şəhər

və şəhərətrafında kəskin mərkəzləşmə ilə nəticələndiyini görə bilərik. Tipik misal Bakı şəhəri və Abşeron rayonu ərazisində sənaye sahələrinin yüksək inkişafı ilə əhalinin kənddən bu ərazilərə miqrasiyası ola bilər. Regionların inkişafı arasında disbalansın olması, habelə həmin ərazilərin müvafiq istehsal sahəsi üzrə ixtisaslaşmaması, Bakı və ətrafının aqlomerasiyalaşması ilə nəticələnmişdir. Rəsmi mənbələrdə Bakı şəhərinin əhalisi iki milyon qeyd edilsə də, qeyri-rəsmi mənbələrdə bu say dörd milyona yaxındır. Kəskin təmərküzləşmə məhz regionlar arasında mövcud olan iqtisadi boşluqlar hesabına yaranmışdır. Bu çatışmazlıqlar nəinki sosial eyni zamana ekoloji problemləri də aktuallaşdırır. Davamlı iqtisadi inkişafa nail olunması üçün etibarlı hüquqi baza formalaşdırılmalı, istehsalın diversifikasiyasına nail olunmalıdır. Tsiklik iqtisadi inkişafa nail olunmasında sosial tərəqqinin də rolu əhəmiyyətlidir. Məsələn, işçi qüvvəsinə münasibətdə gender ayrıseçkiliyinin aradan qaldırılması, sosial cəhətdən zəif əhali qruplarının müxtəlif formalarda istehsala cəlb edilməsi, istehsalda qadınların iştirakının stimullaşdırılması kimi faktorlar nəticə etibarilə iqtisadi inkişafa dəyər qatacaqdır (Dagner, 2018).

## Ədəbiyyat

1. Allahverdiyev H., "İqtisadiyyatın hüquqi tənzimlənməsinin əsasları", Dərs vəsaiti, Bakı, "İqtisad Universiteti" nəşriyyatı, 2009.
2. https://azrefs.org/kafedra-iqtisadi-nezeriyye.html
3. Evren Sapmaz Veral, "Döngüsel ekonomiye geçiş doğrultusunda yeni tedbirler ve AB üye ülkelerinin stratejileri", Ankara Avrupa Çalışmaları Dergisi, Ankara, 2018, s. 463-488.
4. http://unec.edu.az/application/uploads/2015/07/HT1.pdf
5. Jihad Dagher, "Regulatory Cycles: Revisiting the Political Economy of Financial Crises", IMF WORKING PAPER, Los Angeles, 2018.

**Rəyçi: dos. L.Abışlı**

Göndərilib: 21.12.2020 Qəbul edilib: 22.12.2020

DOI: 10.36719/2663-4619/61/179-183

**Sirus Rafiq Asgarov**
Baku State University
siruz_esgerov@mail.ru

# CHINA'S ENERGY POLICY IN AFRICA

**Summary**

China's interest in Sub-Saharan Africa, which can be summarized within the framework of 2 main objectives as the acquisition of fossil resources such as oil and natural gas, which are needed as a result of rapidly increasing production, as well as the marketing and supply of products obtained as a result of production, was first carried out with Angola, which has a very rich position in terms of oil. started as a result of contacts. Within the framework of the agreements made between the Chinese government and the Angolan government, which was selected as the pilot country in the opening towards the region, the long-term transfer of the oil extracted in Angola to China was ensured; In return for this sale, China made dams, power plants, electricity transmission, and distribution lines and various transportation infrastructure investments in the region.

***Key words*****:** *Africa, China, energy, resource, policy*

## Introduction

The changes experienced in the international system after the Cold War paralleled the technological development. Technological development has caused communication to become easier and widespread and triggered globalization. The impact of globalization has made itself felt especially in the economic field. Economic developments have caused changes in countries' understanding of power.

These changes caused economic power to become dominant and to prevent political and military power. In addition, the high cost of using military power and the requirement of obtaining approval from the national / international public made the use of soft power important. With the effect of the use of soft power, economic factors came to the fore more.

In the economic sense, different centers have been added to the multi-center world structure consisting of the USA, Europe and Japan. China comes first among these centers. The policies pursued with Deng Xiaoping's rule have created an ever-growing economy and this growing economy has made China a global player.

While having a constantly growing economy is seen as important for the development of the country, the continuity of growth is considered as the continuation of the regime. The necessity to continue economic growth makes China increasingly dependent on energy. Obtaining energy smoothly and uninterruptedly becomes the main foreign policy objective. China evaluates energy security, economic security and national security in a "holistic way". This holistic assessment is also an indicator of the desire to be a power in the international system. From this point of view, it is seen that energy and security are increasingly becoming the main determinants of foreign policy for China.

## Challenges: Finding an effective collaboration formula

Now the Russian-Chinese relations are considered mainly in this aspect. Harvard University professor C. Nay analyzes the prospects for an alliance between the two countries in the context of the agreements they have reached in the field of energy[1]. The figures he brings are huge. The cost of the project, which covers gas trade between Russia and China, is $ 400 billion. Moscow must supply 68 billion cubic meters of gas to China annually for 30 years. Russia currently sells 40 billion cubic meters of gas a year to Germany. So the deal with China serves a bigger purpose.

Will such a large energy project be able to sincerely ally the two countries? This is the other side of the issue. Cooperation in the field of energy makes it possible. Because there are plans to establish a fairly broad relationship in the middle. Given China's growing demand for energy, there is no doubt about the prospects for cooperation. But other factors should not be forgotten.

Nay cites demographic and military factors as examples in this context. According to them, Russia-China relations may not rise to the level of a sincere strategic partnership. It turns out that some additional factors must be taken into account in energy policy in order to achieve the expected result. It is in this aspect that experts emphasize the importance and, at the same time, the complexity of energy policy.

The seventh China-Africa (FOCAC) summit in Beijing in the first decade of September was remembered as the most attended meeting in its 18-year history. The meeting was attended by leaders of 53 of the 54 African countries, with the exception of Eswatini (formerly Swaziland), the last country on the continent to maintain diplomatic relations with Taiwan. The summit was also attended by UN Secretary-General Antonio Guterres. China took its first and less daring steps in the "invasion" of Africa in the 1970s. At the time, Beijing was at the bottom of the continent's list of trading partners. At that time, the favorites among the continent's investors were the United States, the Soviet Union and European countries.

But much has changed since then. The USSR no longer exists, and Russia, the successor to all its foreign assets, has lost most of its position. Europe, which is embroiled in internal problems, is now paying less attention to Africa. As for the United States, its new administration has decided to suspend humanitarian and other aid to foreign countries. The White House requires everyone to be fair to it in trade, which has weakened Washington's cooperation with African countries. In general, Western investment in Africa has been relatively insignificant since the 2008 crisis[1].

**Strategic competition in the East**

According to experts, Beijing has ignored this recommendation. Because "China's support for Iran is an important element of the strategic competition between the United States and China in the Middle East[2]".

An interesting aspect of China's Middle East policy is the military. In this regard, Beijing is cooperating more with Israel and Saudi Arabia. Relations with Iraq, Syria and Qatar have also expanded in recent years. It should not be forgotten that Turkey signed an agreement on the purchase of new missiles from China. Although NATO protests, Ankara does not change its mind.

All this reflects the main points of China's Middle East policy. First of all, it should be noted that Beijing's approach to the region in the context of West Asia and North Africa in general. The main goal here is to systematically ensure the country's economic development and geopolitical interests in a wider space. China initially preferred the economic and military spheres. In recent years, it has increased its focus on socio-cultural issues. It is acknowledged that Beijing has succeeded in spreading language and culture.

In general, China's Middle East policy is "restrained," but not "organizing[3,p.53]". In other words, Beijing does not determine the general direction of geopolitical processes in the region. He is still trying to be a "neutral party" in the current situation, without interfering in the internal affairs of local states. However, a new situation is emerging in the region and Beijing is experiencing difficulties in its foreign policy. Experts point out that the differences between the US, Russian and Chinese Middle East policies are in this area[4].

US Secretary of Defense Chuck Hagel said that the essence of Washington's Middle East policy is to "shape the course of events." The United States is trying to determine the overall geopolitical landscape of the region. In doing so, it moves to control the dynamics of change in the situation as a whole.

According to experts, in contrast, Russia's policy in the region is contradictory. For example, Alexander Shumilin, director of the Center for Middle East Conflict Analysis at the US-Canadian Institute of the Russian Academy of Sciences, says that "... Moscow is taking difficult steps, especially on Iran and Syria. "On the other hand, it does not want the country to have nuclear weapons. The situation is the same in relations with Israel. Moscow is abolishing the visa regime with this country and at the same time voting against it at the UN."

Wu Bingbing, a professor at Peking University, says China, unlike the United States and Russia, has no plans to influence any process in the Middle East[3,p.53]. At the same time, Beijing is defending Syria at the UN, developing energy cooperation with Iran and defending Palestine. In parallel, it seeks to expand ties with the major powers in the region in all areas. It turns out that despite its so-called concealment, China is increasingly trying to defend its geopolitical interests in the Middle East. There is a specific reason for this.

The point is that the United States has been working to "geopolitically blockade" China in recent years. The Middle East has a special place in this process. It is no coincidence that Washington is putting pressure on each of the countries in the region that cooperate with China. This can be seen when looking at the geography of conflicts in the region. In this context, it is difficult to predict how "quiet, gentle and restrained" China's foreign policy will be in the Middle East.

## Trade imbalances

Against this background, a significant increase in Chinese investment in the "Black Continent" is expected. Beijing has been Africa's largest economic partner since 2008. In the last 40 years, the trade turnover between the parties has increased at least 200 times - from $ 765 million in 1978 to $ 170 billion in 2017. In the first half of 2018, bilateral trade turnover increased by 16% compared to the same period last year and amounted to $ 98.8 billion.

During all this time, China has repeatedly "touched" the strategy of cooperation with Africa. According to the "Black Continent", the use of highly processed goods as a place of sale and a source of raw materials has been stopped, and China has decided that the development of industry and agriculture is in its interests.

The point is that the increase in trade turnover between African countries and China does not indicate a balanced expansion. Today, China is the largest exporter to Africa, but imports are low. Raw materials and unprocessed materials are transported in one direction, and industrial goods and cheap processed products are transported in the other direction. For example, for Uganda, the import-export ratio with China is 22: 1. Even Nigeria, the continent's largest oil producer, imports $ 11 from China for every $ 1 it exports.

## Easy money

Until recently, China was mainly a creditor of Africa. The countries of the continent gladly borrowed from him. Because for this we need to fight corruption, protect the environment, respect human rights, ensure freedom of speech and so on. There was no need for such promises. Moreover, in most cases, no collateral is required for the loan, which was simply guaranteed by the state. But "easy" money goes so easily - it is stolen, uncontrolled and often spent on meaningless projects. As time passed, the debt was accumulated. Finally, the debtors realize that it will not be easy to repay it[5, p.137].

In a number of countries, including the Republic of Congo, Zambia and Djibouti, China's credit has even caused a debt crisis. Because, for example, in Djibouti, this money makes up 75% of GDP. Moreover, its share in public debt is projected to rise from 82% to 91% in the coming years. The situation in Kenya is no better. Kenya, which has $ 50 billion in foreign debt, must return 72% of that amount to Beijing. Almost all of Angola's oil is used to pay off its $ 25 billion debt to China.

China is well aware of this and from time to time restructures its debt. At the last summit, Chinese President Xi Jinping said that by the end of 2018, less developed countries, as well as landlocked countries and small island nations will be exempt from interest-free government bonds.

## Four suggestions

Balancing trade with China will also help Beijing's efforts to increase investment in recent years and boost production in Africa. To this end, Beijing is considering buying local industries in Africa or creating new ones. At the same time, it intends to export its products to both China and other markets.

About 3,100 Chinese companies have already invested in Africa in transport, energy, telecommunications, mining and processing, agriculture, water supply, health and education. According to McKinsey, in 2017, the number of Chinese companies operating in Africa exceeded 10,000.

For example, the Chinese company Hua Jian built a shoe factory in Ethiopia, and today its products are mainly exported to the United States. At the same time, China is working in the field of soybean exports in this country. In doing so, Beijing is trying to avoid paying for soybeans at the expense of the United States[7, p.43-44].

At the same time, some African leaders believe that China's actions will not be enough to address the imbalance. They demanded a solution to the problem at a summit in Beijing. In response to this request, Xi Jinping put forward 4 proposals.

First, to promote the "promotion" of African products within China. For example, the introduction of e-commerce, the organization of regular specialized trade fairs and other marketing activities. As a first step, African countries have been promised free participation in the China International Import Expo, which opens in Shanghai in November. Second, the Chinese government is ready to develop a trade support program for each of the African countries. In particular, we are talking about programs that will regulate customs procedures. Third, it is proposed to create a new fund of $ 5 billion to finance imports from Africa. Fourth, Beijing has agreed to begin talks on transition to free trade with middle-income countries. At present, 97% of the products of the less developed countries of the continent are exported to the Chinese market duty-free[9,p.91-93].

## Security

Probably, the dependence on Africa's natural resources, as well as the active growth of investment in the region, including in the framework of the international project "One Belt - One Road" (which involves 37 countries), are forcing Beijing to take steps to secure assets. There are several real tools for this: its own

army, the armed forces of countries with Chinese economic interests, as well as UN peacekeepers. Beijing uses each of them.

In 2017, China established its first overseas military base in Djibouti. Following the base, which can accommodate up to 10,000 troops, Beijing is expected to take the same step in Sudan, Kenya and several other African countries. In June-July 2018, Beijing hosted a two-week China-Africa defense and security forum. The forum was attended by representatives of 50 African countries. This is seen as a great opportunity to coordinate efforts to maintain order on the continent. At the meeting, China also announced its readiness to provide $ 100 million in military assistance to the African Council[7,p.45].

China's first armed force as a UN peacekeeping contingent appeared in Liberia in 2003. Later, Beijing became the most active participant in peacekeeping missions in Africa among the five permanent members of the UN Security Council. As a participant in the international anti-piracy program, China has been sending Navy ships to the East African coast since 2008. In general, since 2010, China's peacekeeping contingent has become the largest UN peacekeeping contingent. Beijing pays more than 10 percent of the cost of UN peacekeeping missions. He also said he was ready to spend $ 10 billion over 10 years[8, p. 80-81].

## "I brought peace to Africa"

The Sammit and the military meeting are not the only major Sino-African events this year. Two more forums were held in the summer to discuss issues such as education, health and the fight against poverty in Africa. The parties also organized a forum for cooperation with the media. An investment congress is scheduled for November. Thus, cheap billions in credit investments, funding for social and educational programs, and intensive work with all segments of the population are helping China gradually seize real power on the continent[6,p.1-2].

In 2015, Beijing failed to achieve peace between war-torn Sudan and South Sudan. The biggest thing he did at the time was to get assurances from both sides that China's oil infrastructure would not be attacked. Instead, China has vetoed UN Security Council sanctions against officials in both countries.

However, in July this year, China ended the 22-year war between Eritrea and Ethiopia and brought the leaders of the two sides to the negotiating table. China needs peace in this region. Because the Ethiopia-Eritrea-Djibouti triangle must become an important transport corridor in the growing trade turnover with the continent. China has achieved this by taking advantage of the opportunity to seriously influence these countries. Today, Beijing is trying by all means to prove that it came to Africa only in good faith. Maybe that's really the case. However, his desire for a monopoly on the continent is a matter of concern.

## Conclusion

With its relatively homogeneous population, constantly developing economy and foreign policy that this economic development has made increasingly effective, whether China will continue to use these features as an indicator of a great challenge is one of the most debated issues today. China is aware that if it loses stability in economic terms, its development in all areas will be interrupted.

The biggest obstacle to China's economic growth is the ever-increasing energy need and therefore energy imports that increase more and more each year. Using its economic growth as a foreign policy argument against the regions / countries from which it imports energy, China does not hesitate to compete with other powers on these regions / countries. This foreign policy understanding has made China one of the new but most important players in the energy wars.

With this understanding, Chinese foreign policy has made it a principle to veto UN resolutions that are tried to be imposed under US pressure and contain embargo / sanctions. The main reason for this is its desire not to make an enemy to itself within the framework of its "peaceful development" policy. If it receives energy from the country that is against the embargo / sanction, it definitely rejects the embargo / sanction, even if it accepts it, it does not fully fulfill the conditions. This political attitude accelerates the approach of these countries to China.

China tries to make energy source countries dependent on cheap Chinese goods through export and by offering import advantages to these countries by opening their own domestic market. The policy he pursues in this context aims to obtain energy by encouraging export and maintain the economic and political stability of the country.

The stability provided by the trouble-free supply of energy will mean success in building prosperity and creating a modern army. The welfare of the people and the modern army will be able to create a more confident foreign and domestic policy. This policy will reduce the influence of the international public opinion against the ethnic problems that it may experience within itself, ensure the continuation of Taiwan

policy and will mean regional superiority to other powers of the region, Japan, India and South Korea. The opposite would mean breaking the most important part of the "grand strategy". The Taiwan policy, which has been maintained patiently since 1949, will mean a loss of power and may cause the breakdown of the regional influence that is becoming more and more visible.

In addition to these, the prosperity level, which has been increasing continuously since the early 1990s, may draw the people under constant pressure into the social explosion and the continuity of the regime will be in trouble. In order to counter this situation, China may become more aggressive in order to protect its national interests at sea or on land. All these predictions show that experiencing difficulties in obtaining energy will draw China into more competition, and its strengthened structure will lead China to an active foreign policy in which military elements can be more effective.

## References

1. Joseph S. Nye. A New Sino-Russian Alliance? / Project Syndicate, January 12, 2015
2. Nikolai Bobkin. Iran and China: on the basis of friendly relations of pragmatism / "New East Review", February 21, 2014
3. Eyup Ersoy. The work cited, p. 53
4. Natasha Brain. USA, China, Russia - three different views of the Middle East / Voice of America, 10 may 2013
5. Ahmad Hajjaj.“International Competition for Africa: China Rediscovering Africa”, International Policy Magazine, No. 163, Al-Ahram Foundation, Cairo, January 2006, p. 137.
6. FU, BU, “Le silence diplomatique de la chine”.Le monde diplomatique, mars 2003, p. 1-2.
7. Oyebade.The United States' Foreign Policy Africa in the 21st Century Issues and Perspectives, North Carolina: Carolina Academic Press, 2014, p. 43-46.
8. Walid Abdel El-Hay. China’s future status in the international system (1978-2010). Emirates Center for Strategic Studies and Research. Abu Dhabi. 2000, p. 80-81.
9. Khaled Hanafi Ali, "Global Companies: The Game of Resource Conflict in Africa", International Politics. No. 169. July 2007, Vol. 43, p. 91-93.

**Rəyçi: prof. İsmayıl Musa**

Göndərilib: 10.12.2020 Qəbul edilib: 12.12.2020

DOI: 10.36719/2663-4619/61/184-186

**Rəfiqə Emin qızı Ağazadə**
Azərbaycan Respublikasının Prezidenti yanında
Dövlət İdarəçilik Akademiyası
rafa.ağazade@gmail.com

# İSTEDADLI GƏNCLƏRƏ DÖVLƏT QAYĞISI

***Açar sözlər:*** *gənclər, ağıllı gənclər siyasəti, dövlət qayğısı, istedadlı gənclər*

**State care for talented young people**
**Summary**
Today, when we look at the main political activities of various countries in the international arena, we can clearly see that working with young people is a priority. Ensuring material and spiritual development not only locally but also globally depends on the proper development of young people, their socio-psychological, and economic state. At all stages of history, the youth and the youth movement have played a great role in the regulation of social relations, in determining the directions of future development.
***Key words**: youth, smart youth policy, state care, talented youth*

## Giriş

Gənclərdə vətənpərvərlik ruhunun daha da gücləndirilməsi, məşğulluq imkanlarının artırılması, sahibkarlıq fəaliyyətlərinin dövlət tərəfindən daimi dəstəklənməsi, sosial problemlərinin həlli, gənc ailələrə, eləcə də yaradıcı və istedadlı gənclərə dövlət qayğısının göstərilməsi, onların ictimai-siyasi məsələlərə daha çox cəlb olunması məqsədilə bir çox addımların atılması son d zəruri hal almışdı.

Bu istiqamətdə ölkədə fəaliyyət göstərən ən vacib dövlət orqanlarından biri Azərbaycan Respublikası Gənclər və İdman Nazirliyidir.

Azərbaycan Respublikası Gənclər və İdman Nazirliyinin Gənclərlə iş Departamenti 4 hissəyə bölünür.

1. Gənclər Təşkilatları ilə İş şöbəsinin əsas məqsədləri aşağıdakılardır:

a.Qeyri-hökumət təşkilatlarının işini tənzimləmək;

b.Gənclər siyasətini seminarlar, təlimlər, kurslar və s. vasitəsilə inkişaf etdirmək;

c.Azərbaycanın beynəlxalq miqyasda iştirakçılığını dəstəkləmək;

d.Qeyri-hökumət təşkilatlarının layihələrini maliyyələşdirmək.

2.Sağlam həyat tərzi və sosial proqramların təşviqi şöbəsi aşağıdakı məslələrə fokus olmuşdur:

a.Sağlam həyat tərzinin gənclər arasında təbliği və siqaret, narkotik vasitələrdən istifadə, alkoqolizm. AİDS və s. qarşısının alınması;

b.Gənclər üçün sosial proqramların reallaşdırılması və məşğulluqlarının təmin edilməsi (bilik və bacarıqlarının inkişafı)

c.Çətin həyat şəraitində yaşayan gənclərlə işi həyata keçirən təşkilatları dəstəkləmək;

3. Yaradıcı və istedadlı gənclərlə və gənclərin asudə zamanlarının düzgün təşkili ilə məşğul olan təşkilatlarla iş şöbəsi fokus olmuşdur:

a.Yaradıcı və bacarıqlı gənclərlə iş;

b.Festivallar, müsabiqələr, elmi yarışlar, sərgilər və s. tədbirlərin təşkili;

c.Asudə vaxtların səmərəli təşkili (kamplar, turlar və s.)

4.Vətənpərvərliyin tərənnümü ilə məşğul olan şöbə fokus olmuşdur:

a.Məktəblilər arasında milli vətənpərvər oyunların təşkili;

b.Gənclərin müxtəlif fəaliyyətlər vasitəsilə orduya hazırlanması;

c.Milli və ənənəvi tədbirlər, tariximiz haqqında informasiyaların təbliği ilə vətənpərvərlik ideyalarının təbliği;

d.Vətəndaşlıq ideyasının təbliği.(5).

2005-2009-cu illəri əhatə edən “Azərbaycan Gəncliyi Dövlət Proqramı” Azərbaycan Respublikasında dövlət gənclər siyasətini daha da inkişaf etdirmək, gəncləri dövlət idarəçiliyində aparıcı qüvvəyə çevirmək, onların sosial-iqtisadi problemlərinin həllini təmin etmək və istedadlı gənclərə dövlət qayğısının göstərilməsi məqsədilə təsdiq edilmişdir. Bu proqram çərçivəsində gənclərin əsas fəaliyyəti 9 aprel 2002-ci ildə qəbul edilmiş "Gənclər Siyasəti Haqqında" Azərbaycan Respublikasının Qanunu ilə tənzimlənir. Dövlət tərəfindən bu proqramın icra edilməsinə dövlət büdcəsindən 8 milyon 375 min manat vəsait ayrılmışdır.

Proqramda gənclərin sosial müdafiəsinin təmin edilməsi, məşğulluğunun artırılması, yaradıcılıq axtarışlarının və özünüreallaşdırma fəaliyyətlərinin stimullaşdırılması, milli ruhda təlim-tərbiyə edilməsi, vətənpərvərlik hisslərinin daha da gücləndirilməsi, sağlam yaşam tərzinin təbliği istiqamətində tədbirlər həyata keçirilməsi təsbit olunmuşdur.

Proqram çərçivəsində sosial və maddi vəziyyəti dəyərləndirilmədən istedadlı və yaradıcı gənclərə təhsilini davam etdirməsi və tamamlamasına dövlət təminatı verilir. Belə ki, sosial müdafiəyə ehtiyacı olan istedadlı gənclər təhsilini yekunlaşdırdıqdan sonra qanunvericiliklə müəyyən olunmuş qaydada kreditlər əldə edə bilər. Həmçinin, burada istedadlı gənclərin maraq dairəsində olan sahələrdə təcrübə proqramından keçməsinə şərait yaradılması da nəzərdə tutulmuşdur.

AR Prezidentinin 2011-ci il 19 dekabr tarixli fərmanı ilə AR Gənclər və İdman Nazirliyi yanında gənclərə dövlət dəstəyinin göstərilməsi məqsədilə Gənclər Fondu təsis edilmişdir. Fondun yaradılmasında başlıca məqsəd ölkədə gənclər siyasəti ilə əlaqədar elm, təhsil, mədəniyyət kimi və digər sferalarda, həmçinin beynəlxalq səviyyədə həyata keçirilən, müvafiq konfrans, seminar, festivallar, olimpiada və ya digər beynəlxalq proqramların, ictimai və sosial əhəmiyyətli layihələrin qrantlar şəklində maliyyələşdirilməsidir.

Eyni zamanda, Azərbaycan Respublikasının Gənclər Fondu elmi araşdırmalar, sosial əhəmiyyətli və innovativ ideyaları, gənclər siyasətini həyata keçirən müəssisələrin fəaliyyətini yaxından izləyərək, gənc nəslin müxtəlif sahələrdə öz potensialını reallaşdırmasında onların iştirakçılığını və təşəbbüskarlığını dəstəkləyir (8).

Dövlət gənclər siyasətini dəstəkləyən addımlardan biri də 2 fevral 2019-cu il tarixində Gənclərin İnkişaf və Karyera Mərkəzinin yaradılması olmuşdur. Azərbaycan Respublikasının Gənclər Fondunun maddi-texniki bazası əsasında fəaliyyətə başlamışdır. Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin 1 oktyabr 2019-cu il tarixli 1454 saylı Sərəncamına əsasən, ölkənin şəhər və rayonlarında fəaliyyət göstərən Heydər Əliyev mərkəzlərində Gənclərin İnkişaf və Karyera Mərkəzinin nümayəndəliklərinin yaradılması nəzərdə tutulmuşdur.

Dövlət siyasətində gənclərin müxtəlif fəaliyyətlərdə iştirakçılıq prinsiplərinə və bunun təmin edilməsi yollarına geniş yer ayrılır, lakin bunun reallaşdırılması ilə bağlı sınaqdan keçirilmiş yanaşma və metodlar daha ön planda saxlanılır. Çünki gənclərin öz yaşadıqları mühitdə yaxşılaşdırıcı işlər görməyə cəlb etməkdən əlavə, uğurlu cəmiyyətin yaradılması üçün ən təsirli strategiyalardan biri də həqiqi iştirak prosesidir: gənclərin bir-birilərini dinləməsi, fikir ayrılıqlarına hörmət etməsi, ortaq məxrəcin müəyyənləşdirilməsi, tənqidi düşüncə, qiymətləndirmə və əks etdirmə qabiliyyətinin inkişaf etdirilməsi, kəşflər, informativlik, kollektiv problem həll etmə proseslərinin dəstəklənməsi və sonda, onların dünyasında müsbət dəyişiklər etmək üçün bilik və bacarıqların inkişaf etdirilməsi (1).

Qeyd edilən tədbirlərin həyata keçirilməsi ilə Azərbaycan gəncliyi ölkənin inkişafında fəal rol oynayan sosial təbəqəyə çevrilmişdir. Belə ki ölkəmizdəki gənclər bütün sahələrdə öz sözünü demək potensialına malikdir.

Bütün bunlar göstərir ki, Azərbaycanda istedadlı gənclərin aşkar edilməsi və dəstəklənməsi üçün bütün sahələr üzrə müəyyən qanunvericilik bazası formalaşdırılmışdır. Bu gün orta məktəblərdə kifayət qədər istedadlı gənclərin təhsil alması ilə bağlı faktlar reallıqdır. Bu istedadların aşkar edilməməsi onların zamanla itirilməsinə də gətirib çıxara bilər. Həmin gənclərin müəyyən yaşdan kəşf edilməsi və potensialının reallaşdırılmasına imkan yaradılması bu gün dövlət qayğısı sayəsində mümkün ola bilər.

Bu istiqamətdə müxtəlif layihələrin təşkili və hayata keçirilməsi gənclərin mənəvi formalaşmasında böyük rol oynayır. Son dövlərdə gənclərin və eləcə də məktəblilərin sosial mediaya maraqlı olması həmin layihələrin istiqamətinin müəyyən qədər dəyişilməsinə gətirib çıxarmışdır. Belə ki, bu layihələr haqqında dijital platformada gənclərin məlumatlılığının artırılması və onlayn layihələrə üstünlük verilməsi aktualdır.

Ölkəmizdə son illərdə bu sahədə atılan uğurlu addımlardan biri də Azərbaycan Respublikası Gənclər Fondunun təşəbbüsü ilə GencApp mobil tətbiqinin yaradılması oldu. Belə ki, gənclər bu mobil tətbiq vasitəsilə daimi istifadə etdiyi elektron platforma vasitəsilə ölkədə onlar üçün yaradılan imkanlardan və yeni təşəbbüslərdən daha sürətli şəkildə məlumatlana biləcəkdilər. Tətbiqin yaradılması məhz bu məqsədi hədəfləyirdi, lakin mobil tətbiq vasitəsilə gənclərə daha çox imkanlar yaradıldı (8).

"GencApp" mobil tətbiqi vasitəsilə gənclər ölkədə keçirilən qrant müsabiqələri, təqaüd proqramları, eləcə də yerli və beynəlxalq tədbirlərə müraciətlə bağlı bütün məlumatları əldə edə bilirlər. Həmçinin, müxtəlif qurumlarda ən yeni vakansiyalar, təcrübə və könüllülük proqramları, xaricdə təhsil, kamplarla bağlı yenilikləri öyrənmə imkanı əldə edirlər. Gənclər mobil tətbiq vasitəsilə CV yarada və müxtəlif dövlət orqanları və şirkətlərlə informasiya mübadiləsində iştirak edə bilirlər.

Bu platforma ilə gənclərə şəxsi karyeraları ilə bağlı yaradılan imkanlarla yanaşı, həmçinin asudə vaxtlarını səmərəli keçirməsi üçün də istiqamətlər verilmişdir.

